# AZƏRBAYCAN MƏKTƏBİ

*Elmi-nəzəri, pedaqoji jurnal*

**2016**
**№ 5 (675)**
*(sentyabr-oktyabr)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

*Redaksiyanın ünvanı:*
*Az1025, Bakı şəhəri, A.Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, otaq 410 )*

*Telefon/Faks*
*(012) 496-74-19*
*(012) 496-74-20*

*E-mail:*
*azarbaycan.maktabijurnali.24@mail.ru*

*Rekvizitlər:*
*Kapital Bankın Rabitə Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**Təsisçi**
**Azərbaycan Respublikası Təhsil Nazirliyi**

**B U N Ö M R Ə D Ə**

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı: Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 21**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**



**In this number**

# TƏHSİLDƏ YENİ KEYFİYYƏT MƏRHƏLƏSİ BAŞLAYIR



*Mikayıl CABBAROV: “Biz potensialımızı artırmaqla, innovasiyaları genişləndirməklə Azərbaycanı regionun təhsil mərkəzinə çevirməyi hədəfləmişik”.*

Azərbaycan təhsilinin yeni mərhələyə hansı uğurlar, problemlər və perspektivlərlə qədəm qoymasını, ümumiyyətlə, təhsilimizin mövcud durumunu həmsöhbətimiz təhsil naziri Mikayıl Cabbarovla müzakirə etdik.

**Ali məktəbə qəbul prosesində ciddi dəyişikliklər nəzərdə tutulur**

*- Cənab nazir, ali məktəblərə qəbulun statistikasına görə ötən 3 ildə təhsilin nəticələrinin getdikcə yaxşılaşdığını söyləyə bilərik. Bu, təhsildə, nəhayət ki, müsbət keyfiyyət dəyişikliyinə keçidin başlanğıcıdırmı?*

- Öncə yeni tədris ilinin başlaması münasibətilə bütün təhsil ictimaiyyətini, müəllimləri, təhsil alanları, valideynləri ürəkdən təbrik edir, uğurlar arzulayıram.

Prezident İlham Əliyevin iştirakı ilə İT STEP akademiyasının açılışı ölkəmizdə informasiya texnologiyaları sahəsində ilk peşə-ixtisas təhsili ocağının yaranması ilə yadda qaldı. Eyni zamanda, bu tədris ilindən Azərbaycan-Fransız Universitetinin fəaliyyətə başlaması da ali təhsilimizin inkişafı və beynəlmiləlləşməsində yeni halqa olacaq.

Bəli, ötən il də nəzərə alınmaqla təhsil sahəsində baş verənlər keyfiyyətcə yeni mərhələnin başlanğıcıdır. Maksimalist olduğumuzdan hər zaman nəticələrin daha da yüksək olmasını istəyirik. Biz ölkə rəhbərliyinin təhsilin bütün sahələrinin inkişafı ilə bağlı qarşıya qoyduğu məqsədlərə nail olmaq üçün gücümüzü səfərbər etmişik.

Məmnunam ki, artıq 3 ildir hər bir ixtisas qrupu üzrə nəticələr yüksəlir. Bu onu göstərir ki, apardığımız islahatlar hər hansı bir coğrafi məkan və ya ixtisas qrupu ilə məhdudlaşmır, hər bir şagirdin nailiyyətlərinə təsir edir.

Buraxılış imtahanlarının nəticələrindəki irəliləyişlər özünü qəbul imtahanlarında da büruzə verdi. Belə ki, ötən illərlə müqayisədə qəbul imtahanlarında iştirak edən abituriyentlərin sayı azalsa da, 200-dən artıq bal toplayan abituriyentlərin mütləq sayı artıb. 2016-2017-ci tədris ili üçün qəbul imtahanlarının nəticələrində müsbət dinamika müşahidə edilir. Belə ki, bu il qəbul imtahanlarında 200-dən yuxarı bal toplayanların sayı rekord miqdarda - 34475 nəfər (43,9%) təşkil edib ki, bu da ötən ilki göstəricidən 3,9%, 2014-cü ildəki göstəricidən isə 9,2% artıqdır. 2015-ci ildə 200-dən yuxarı bal toplayanların sayı 33198 nəfər (40%), 2014-cü ildə isə 32159 nəfər (34,7%) təşkil edib. Bunu riyazi formullar da təsdiq edir.

Eyni zamanda, tələbə qəbulu imtahanlarında iştirak edərək 200-dən artıq bal toplayan abituriyentlərin nəticələrinə görə keyfiyyət göstəriciləri yüksəlib.

Digər bir məsələ isə keçid balıdır. Bu, ali təhsilə çıxış ilə bağlı olan bir məsələdir. Dünyada bununla bağlı iki təcrübə var. İlk nümunə keyfiyyətlə bağlıdır-ali təhsilə girişdə bal məhdudiyyətinin qoyulması. Belə praktika dünyada mövcuddur. Bu gün Azərbaycan da bu modeldən istifadə edir. Hətta beynəlxalq səviyyəli test imtahanlarının nəticələri eyni ölkədə universitetlərin reytinq əmsalına görə dəyişir. Universitetlərə qəbulda keyfiyyətlə bağlı qoyulan bal məhdudiyyəti həm də əmək bazarının tələbidir. Biz həm də son iki ildə ali təhsil müəssisələrinə bir sıra prioritet ixtisaslar üzrə minimal keçid ballarını artırmışıq. Yəni, burada qarşıya qoyulan məqsəd odur ki, ali təhsil müəssisələri öz potensialını və profilini nəzərə almaqla ixtisasları, onların sayını və sifarişlərini müəyyənləşdirməlidirlər.

İkinci yanaşma - hər istəyənə ali təhsil almaq hüququ verməkdir. Burada önə çəkilən amil təhsilin əlçatanlığıdır. Bir çox ölkələr ali təhsilə yiyələnmək arzusu olan hər kəsə bu hüququ verir. O şərtlə ki, vətəndaş öz təhsil xərcini tam şəkildə üzərinə götürür. Ali təhsilin əlçatanlığı "bilik iqtisadiyyatı" və ya "post sənaye" dövrü üçün uğurlu bir model kimi dəyərləndirilir. Bu, ölkədə insan kapitalının keyfiyyətinə müsbət təsir edir, iş yerlərinin yaradılması və iqtisadiyyatın inkişafı ilə sıx bağlıdır.

Təhsilin inkişafı üzrə Dövlət Strategiyasında da qəbul planının ləğvi nəzərdə tutulur. Bu isə universitetlərdən daxili qiymətləndirməyə və yekun imtahana olan yanaşmaya yeni baxış tələb edir.

Yuxarıda qeyd etdiyim mövzuların hər biri cəmiyyətdə müzakirə edilməlidir. Bu məsələlər dövlətin iqtisadi siyasəti və strukturu, həmçinin ictimai siyasətlə sıx bağlıdır.

*- Belə bir yanaşma var ki, bir uşağa çəkilən xərc məktəbəqədər mərhələdə daha vacibdir, nəinki təhsilin digər səviyyələrində, o cümlədən ali təhsildə...*

- Tamamilə doğru qeyd edirsiniz. Aparılan tədqiqatlar bunu birmənalı təsdiq edir. Təhsilin bu mərhələsinin vacib olduğunu və bununla bağlı ölkə rəhbərliyinin və Heydər Əliyev Fondunun prezidenti, ölkəmizin birinci xanımı Mehriban Əliyevanın xüsusi yanaşmasını qeyd etmək lazımdır. Bir neçə ay bundan əvvəl Azərbaycan Respublikası Nazirlər Kabinetinin "Uşaqların məktəbə hazırlığının təşkili məsələləri" haqqında qəbul etdiyi qərar məktəbəqədər hazırlığın çərçivəsini genişləndirməyə yeni təkan verəcək.

Bu, hər kəsin marağındadır. Biz məktəbə hazırlıq işini genişləndirmək üçün ilk növbədə, elə ümumi təhsil müəssisələrinin infrastrukturundan istifadə etməyə qərar verdik. Yəni, bildiyiniz kimi, yeni

tədris ilindən ümumtəhsil məktəblərində 5 yaşlı uşaqların dövlət hesabına məktəbə hazırlıq təhsilinə başlanılacaq. Artıq bununla bağlı Təhsil İşçilərinin Peşəkar İnkişafı İnstitutunda UNİCEF-in maliyyə və metodiki dəstəyi ilə təlim proqramına start verilib. “Təlimçi hazırlığı” adlanan bu proqrama əsasən məktəbə hazırlıq qruplarında dərs deyəcək müəllimlər təlimatlandırılır.

**Orta təhsildə buraxılış imtahanlarının nəticələri yaxşılaşıb**

*- Orta təhsildə son vaxtlar aparılan əsas dəyişikliklərdən biri də məktəblərdə təmayülləşmənin tətbiqidir. Bu, hansı zərurətdən yarandı?*

- Ümumi təhsilin təmayüllər üzrə təşkilini bu sahənin keyfiyyətinin yüksəldilməsi üçün görülən işlərdən biri saymaq olar. Təmayülləşmə müvafiq fənləri əhatə edən təhsil sahələri üzrə fərqlənən şagirdlərin istedadlarının, onların potensial imkanlarının reallaşmasına və ümumi inkişafına əhəmiyyətli dərəcədə təsir göstərən prosesdir. Məqsəd təhsildə seçimini etmiş şagirdlərə öz potensiallarını reallaşdırmaq üçün bütün imkanları yaratmaqdır.

Ötən tədris ilində 58 məktəbdə 176 sinif komplektində təxminən 3700 nəfərə yaxın şagird X sinifdə təmayüllər üzrə tədrisə cəlb olunub. Yeni tədris ilindən təmayülləşmə üzrə coğrafiya genişləndirilərək ölkənin 5 şəhər və 36 rayonu üzrə 124 məktəbdə tətbiq olunacaq. İndiyədək əldə olunan nəticələrin təhlili göstərir ki, tam orta təhsil səviyyəsində təmayülləşmənin tətbiqi şagirdlərin meyil və arzularına uyğun təşkil edildiyi üçün onlarda təlimə marağı xeyli artırıb, məktəblilərin təhsil nailiyyətlərinə müsbət təsir edib.

*- Dərslik problemi ictimaiyyət tərəfindən daim müzakirə olunan ciddi məsələlərdəndir. Son illərdə bu sahədə hansı dəyişikliklər edilir? Bugünkü dərsliklərimiz tədris standartlarına tam uyğundurmu? Bu problemlə bağlı nə deyə bilərsiniz...*

- Biz bu il çap edilən dərsliklərin yerlərə çatdırılması prosesini bir qədər tez həyata keçirdik. Düşündük ki, şagirdlərin bir məktəbdən digər məktəbə yerdəyişməsi, birinci sinfə gedəcək şagirdlərin sayının dəqiqliklə müəyyən edilməsinin mümkünsüzlüyü dərsliklərlə təminatda çətinlik yaradar. Bu baxımdan valideynlərə və şagirdlərə müraciət etdik ki, göstərilən vaxtadək dərslikləri təhsil aldıqları məktəblərdən əldə etsinlər.

Sualınızın digər hissəsinə gəldikdə isə qeyd edə bilərəm ki, dərslik seçimində şəffaflığı təmin etmək məqsədilə xüsusi sayt yaradılıb. Bununla bağlı davamlı ictimai rəy öyrənilir. Yəni, dərsliklərin yazılması prosesində mütəxəssislərin və ictimaiyyətin də rəy və təkliflərinin nəzərə alınmasına üstünlük verilir.

Bir məsələni də vurğulayım ki, elektron dərsliklərə xüsusi önəm veririk. Təhsil Nazirliyi tərəfindən yaradılmış elektron dərslik portalında (www.e-derslik.edu.az) 143 elektron kitab var. Onlardan 121-i dərslik, 22-si müəllim üçün metodiki vəsaitdir. İnternetə çıxışı olan hər kəs istədiyi dərslikdən yararlana bilər. Bu günə qədər portala daxil olanların sayı 1009766 nəfərdir.

*- Buraxılış imtahanlarında şagirdlərin göstəricilərində də müsbət dinamika müşahidə edilir. Bu dinamikanın rayonlar üzrə bölgüsünü müəyyənləşdirmisinizmi?*

- Son illərdə IX siniflər üzrə nəticələr daha ürəkaçandır. 2012-ci ildə iki məzundan biri, builki IX siniflər üzrə buraxılış imtahanlarında hər 3 məzundan ikisi bütün fənlərdən müsbət qiymət alıb. Bu göstərici ötənilki

göstəricidən 2,7 faiz daha yaxşıdır.

Həmçinin XI siniflər üzrə imtahanlarda məzunların 65 faizi bütün fənlərdən müsbət qiymət alıb. 2014-2015-ci tədris illəri üçün 9-cu sinif buraxılış imtahanında ən zəif nəticə göstərmiş və şagird sayı nisbətən çox olan 6 rayon pilot olaraq seçilib. Bu rayonlar - Astara, Ağcabədi, Cəlilabad, Masallı, Saatlı və Sabirabad üçün inkişafyönümlü planlar hazırlanıb və həyata keçirilib.

Ötən illə müqayisədə hər iki fənn üzrə müsbət qiymət alanların sayında Astara rayonu üzrə 22 faiz, Ağcabədi rayonu üzrə 15 faiz, Sabirabad rayonu üzrə 14 faiz, Masallı rayonu üzrə 11 faiz, Cəlilabad və Saatlı rayonlarının hər biri üzrə 9 faiz artım müşahidə edilib. Bununla yanaşı, digər bölgələrdə də IX sinif məzunlarının nəticələri yaxşılaşıb. Belə ki, Şəmkirdə 13 faiz, Gədəbəydə 10 faiz, Lerikdə 9 faiz, Salyanda 8 faiz, Hacıqabul, Beyləqan, İmişli, Zaqatala və Qobustan rayonlarının hər biri üzrə 7 faiz müsbət dinamika qeydə alınıb. Biz nəticələri ciddi təhlil edirik və ona uyğun tədbirlər həyata keçiririk.

**Yüksək balla pedaqoji ixtisasları seçən tələbələrin sayı 10 dəfə artıb**

*- Hazırda müəllimlərin işə qəbulu prosesi necə tənzimlənir? Ümumiyyətlə, vakansiyaların gizlədilməsi halları mövcuddurmu?*

- Bu gün müəllimlərin işə qəbulu mərkəzləşdirilmiş qaydada aparılır. Biz müəllim peşəsinin nüfuzunun artırılmasını, onun yüksək biliyə sahib olmasını, habelə pedaqoji təhsilə bilikli gənclərin cəlb olunmasını istəyirik.

Bilirsiniz ki, artıq bir neçə ildir ki, müəllimlərin işə qəbulu elektron proqram təminatı ilə həyata keçirilir. Bu il respublikanın ümumtəhsil müəssisələrində olan 3346 vakansiya müsabiqəyə çıxarılıb. Müsabiqədə iştirak etmək üçün müraciət edənlərin indiyədək görünməmiş sayda - 31779 nəfərinin elektron ərizəsi təsdiq edilib. Ümumilikdə 2365 müəllim işə qəbul olunub.

Son dövrlərdə aparılan məqsədyönlü işlər nəticəsində müəllimlik peşəsini seçən yüksək ballı məzunların sayı xeyli artıb. Məsələn, ötən tədris ilində yüksək balla pedaqoji ixtisasları seçən tələbələrin sayı 10 dəfə artıb. Təhsil Nazirliyi tərəfindən son 3 ildə birinci yerdə müəllimlik ixtisasını seçən, 500 və ya daha artıq bal toplayan 300 nəfər tələbəyə 100 manat dəyərində təqaüd verilir.

Müəllimlik ixtisasını seçən tələbə-gənclərlə aparılan sosioloji sorğunun nəticələri göstərir ki, bu gənclər düşünülmüş şəkildə, ürəklərinin hökmü ilə və böyük həvəslə müqəddəs, şərəfli, eyni zamanda, məsuliyyətli peşə olan müəllimliyi seçiblər. Belə ki, sorğuda iştirak edən tələbələrin 70-80 faizi müəllim peşəsini sevdiklərini bildirir.

*- Bu il həm də onunla yadda qaldı ki, Təhsil Nazirliyi müəllimlərin ixtisasartırma təhsili ilə bağlı, bütövlükdə pedaqoji işçilərin peşəkar inkişafı ilə bağlı yeni yanaşma sərgilədi. Təhsil İşçilərinin Peşəkar İnkişafı İnstitutunun yeni təqdimatı təhsilimizdə nəyi dəyişəcək?*

- Təhsilin keyfiyyəti müəllimin səviyyəsinə bağlıdır. Bəli, Təhsilin inkişafı üzrə Dövlət Strategiyasında müəllimlərin peşəkarlığının artırılması ayrıca bir istiqamətin mövzusudur. Günün tələblərinə uyğun müəllim ordusu hazırlamaq və onları davamlı inkişafa sövq etmək xüsusi diqqət istəyir. Ötən ilin sonunda Bakı Pedaqoji Kadrların İxtisasartırma və Yenidən Hazırlanması İnstitutunun həm adı, həm də funksiyası dəyişdirilmişdir. Pedaqoji heyət üçün yeni modul-kredit və rəqabətəsaslı təlimlər sisteminin yaradılması istiqamətində iş gedir. Hazırda institut öz

işini bu alqoritmdə tənzimləyir: Müəllimlərin təlim ehtiyaclarının müəyyənləşdirilməsi; Ehtiyaclara uyğun təlim paketlərinin hazırlanması; İxtisasartırma təlimlərinin birbaşa institutda deyil, tender yolu ilə seçilmiş universitet və ya əlavə təhsil müəssisələrində aparılması.

Düşünürük ki, bu, ixtisasartırma təlimlərinin keyfiyyətini yüksəldəcək və universitetlər, əlavə təhsil müəssisələri arasında sağlam rəqabəti dəstəkləyəcəkdir. İnstitut keyfiyyətə nəzarəti, qiymətləndirmə və sertifikasiya məsələlərini öz öhdəsində saxlayır. Vahid standartlar əsasında hazırlanmış ixtisasartırma təlimlərinin bir qurum tərəfindən keçirilməsi, digər qurum tərəfindən qiymətləndirilməsi də şəffaflığı və keyfiyyəti yüksəltməyə xidmət etməlidir. Başqa bir vacib məsələ müəllimlər üçün elektron ixtisasartırma proqramlarının hazırlanmasıdır. İxtisasartırma proqramlarının nəzəri-informativ hissələrinin elektronlaşdırılması hər mənada işi xeyli yüngülləşdirir.

*- Mikayıl müəllim, bu il həm də cənab Prezidentin sərəncamı ilə “Ən yaxşı müəllim”, “Ən yaxşı məktəb” müsabiqələrinin qaydası dəyişdi. Təhsildə inkişaf və innovasiyalar üzrə qrant layihələrinin maliyyələşdirilməsi nəzərdə tutulub. Sizcə, bu, təhsildə nəyi dəyişəcək?*

- Birincisi, bu, fəaliyyətin daha hədəfli və seçimli qurulmasına xidmət edəcək. Cənab Prezidentin sərəncamına əsasən, ən yaxşı ümumi təhsil müəssisəsi və ən yaxşı müəllim mükafatları üçün Azərbaycan Respublikasının dövlət büdcəsində hər il üzrə nəzərdə tutulan vəsait təhsildə inkişaf və innovasiyalar üzrə qrant layihələrinin həyata keçirilməsinə yönəldiləcək. Sərəncam imkan verir ki, bu prosesə tək ümumi təhsil məktəbləri, müəllimlər deyil, eyni zamanda, ilk peşə, orta ixtisas və ali təhsil müəssisələri də cəlb olunsun. Bununla, universitetlər də öz ideyalarını, yanaşmalarını ortaya qoya biləcəklər.

Əvvəlki illərdə yüzlərlə ümumi təhsil məktəbi fərqləndirildi, mükafatlar təqdim edildi. Bundan sonra ayrı-ayrı fərdlərin deyil, həmin şəxslərin təhsilə verəcəyi töhfələr qiymətləndirilməyə başlanacaq. Hazırkı dövrdə aparıcı mütəxəssislərin, onların müəllimlərinin ideyalarına ehtiyac var. Bu da innovasiyaların, kreativ yanaşmaların təhsilə gətirilməsinə xidmət edəcək.

*- Bu gün aparılan islahatlarda məktəb direktorlarının seçimi də cəmiyyətin diqqətində olan məsələlərdəndir...*

- Bu gün direktorlardan idarəetmədə yeni vərdişlərə yiyələnmə, tədris mühitinin şəffaflığının təmin edilməsi, təşəbbüskarlıq və məktəbin cəmiyyətin vacib halqası kimi rolunu dərk etmə kimi əsas keyfiyyətlər gözlənilir. Bütün nailiyyətlərin və qarşıda duran çağırışların kökü məktəbdən başlayır. İstənilən şəxsin, fərdin formalaşması, milli dəyərlərin daşıyıcısı olması, öz uğurunu fərd olaraq deyil, uğurlu bir dövlətin, cəmiyyətin uğuru kimi görmək imkanı məktəbdə olan mühitdən, təhsil imkanından asılıdır. Məktəbdə isə bu mühitin yaradıcısı məktəb direktorudur.

Müəllimlərin işə yanaşması, məktəb-valideyn münasibətləri məktəb direktorlarının fəaliyyətindən asılıdır. Məktəb direktorları üzərlərinə düşən məsuliyyəti layiqincə dəyərləndirməli, rəhbərlik etdikləri təhsil müəssisələrinin inkişafı naminə var gücləri ilə çalışmalıdırlar.

Bu il də məktəb direktorlarının işə qəbulu ilə bağlı yeni qaydalara uyğun olaraq, 4 mərhələdən ibarət müsabiqə keçirilib. Əvvəlcədən müəyyənləşdirilmiş 597 vakant

yerə 2260 nəfər müraciət edib. İmtahanda iştirak edən 1591 nəfərdən 516-sı müsahibə mərhələsinə buraxılıb. Onlardan 208 nəfəri ölkənin şəhər və rayonlarındakı vakant məktəb direktoru vəzifəsinə işə qəbul olunub.

**Son 13 ildə məktəblərin 70 faizi yenidən tikilib və ya əsaslı təmir olunub**

*- "Məktəblilərin dostu" layihəsi də son vaxtların ən diqqətçəkən yeniliklərindən oldu. Görəsən, bu, şagird-müəllim münasibətinin daha da yaxşılaşmasına, valideyn məmnuniyyətinə şərait yaradacaqmı?*

- Təhsil Nazirliyi "ASAN xidmət"lə birgə "Məktəblilərin dostu" layihəsinə start verib. Layihə təhsilin idarəedilməsinin təkmilləş-dirilməsi, valideynlərin ümumi təhsil müəssisələrinin həyatında daha yaxından iştirakı məqsədilə həyata keçirilir.

"Məktəblinin dostu"nun əsas vəzifələri müəllim və şagirdlər üçün təhlükəsiz mühit yaratmaq, ilk tibbi və psixoloji yardım göstərmək, mütəmadi olaraq şagird, valideyn, müəllim, təlim-tərbiyə müəssisələrinin kollektivi və rəhbərliyi ilə maarifləndirmə və diaqnostik işlərin aparılması olacaq. "Məktəblinin dostu" həmçinin hər bir yaş mərhələsində uşaqların hərtərəfli şəxsi keyfiyyətlərinin və intellektual inkişafının təmin olunması, onlarda özünütərbiyə və özünüinkişaf bacarığının formalaşdırılmasında iştirak edəcək. Layihə ilk mərhələdə Bakı şəhərindəki 30 ümumi təhsil müəssisəsində həyata keçiriləcəkdir.

- Son 3 ildə ölkə təhsilində olimpiadaların keçirilməsi ilə bağlı yaxşı ənənə formalaşıb. Nəticələr nəyi deyir?

- Sağlam və ədalətli rəqabət mühitində keçirilən bu yarışlar şagirdlərin müvafiq fənlərə olan marağının daha da artmasına səbəb olur.

Cari tədris ilində Koreya, Albaniya, Rusiya və Çində keçirilən 5 müxtəlif beynəlxalq fənn olimpiadasında Azərbaycan məktəbliləri 5 gümüş və 11 bürünc medal qazanıblar. Təsadüfi deyil ki, bir çox respublika və beynəlxalq olimpiada qaliblərimiz dünyanın nüfuzlu universitetlərində təhsil alırlar. Moskvada keçirilən Beynəlxalq Mendeleyev Olimpiadasının qalibləri Lomonosov adına Moskva Dövlət Universitetinə, Balkan Riyaziyyat Olimpiadasında medal alan şagirdlər isə Türkiyənin Bilkənt və Orta Doğu Texniki universitetlərinə dəvət ediliblər.

Respublika fənn olimpiadalarının birinci mərhələsində bu il iştirak edən şagirdlərin sayı xeyli artıb. Belə ki, iştirakçıların sayı 27 500 nəfər olub. Qaliblər arasında paytaxtla müqayisədə bölgə məktəblilərinin üstünlük təşkil etməsi isə müsbət hal kimi dəyərləndirilməlidir. Bu il 260 şagird olimpiadanın qalibi adına layiq görülüb.

*- Məktəb tikintisinin statistikasına görə, Azərbaycan artıq uzun illərdir ki, qabaqcıl ölkələrdən sayılır. Bu sahədə son rəqəmlər necədir?*

- Bəli, Azərbaycan bu sahədə öncüldür. Son 13 il ərzində ölkəmizdə məktəblərin 70 faizi yenidən tikilib və ya əsaslı təmir olunub. Yeni tədris ilindən ölkə üzrə 29 yeni məktəb, o cümlədən Təhsil Nazirliyinin sifarişi ilə 7 məktəb istifadəyə veriləcək.

101 məktəbdə əsaslı və 384 məktəbdə isə cari təmir işləri aparılıb. 10 təhsil müəssisəsinin tikintisi isə davam edir. Yeni tədris ilindən Təhsil Nazirliyinin Əsaslı Tikinti və Təchizat İdarəsinin sifarişi ilə 2 internat məktəbi əsaslı təmir olunub, istifadəyə veriləcək.

*- Mikayıl müəllim, deyəsən, təhsilimiz getdikcə "asan"laşır". "ASAN məktəb", "ASAN peşə", "Məktəblinin dostu" və sair. Maraqlı layihələrdir. Onların, xüsusən də elə "ASAN peşə" layihəsinin coğrafiyasını genişləndirmək mümkündürmü?*

- Təhsil sistemi əhalinin böyük hissəsini

əhatə etdiyindən bizim "ASAN xidmət"lə olan əməkdaşlığımızın genişləndirilməsi təsadüfi xarakter daşımır. Məqsədimiz təhsil xidmətlərini daha rahat və şəffaf formada çatdırmaqdır. Bu tədris ilində ilk peşə-ixtisas təhsili müəssisələrinə qəbul pilot olaraq "ASAN peşə" layihəsi üzrə Bakı və Gəncə şəhərlərində fəaliyyət göstərən "ASAN xidmət" mərkəzlərində həyata keçirilib. Bu, Təhsil Nazirliyi ilə "ASAN xidmət" arasındakı əməkdaşlıq çərçivəsində reallaşdırılır. 4 mindən artıq şəxs ilk peşə-ixtisas təhsili müəssisələrinə qəbul olunub.

"ASAN peşə" layihəsi vətəndaşların rahatlığının təmin olunması, Təhsil Nazirliyi- "ASAN xidmət" əməkdaşlığının səmərəliliyinin artırılması və ilk peşə-ixtisas təhsili müəssisələrinə şagirdlərin qəbulu prosesində subyektiv amillərin aradan qaldırılması məqsədlərinə xidmət edir.

Bundan əlavə, Bakı və Gəncə şəhərlərində ilk peşə-ixtisas təhsili müəssisələri şəbəkəsinin rasionallaşdırılması, dövlət-özəl əməkdaşlığının qurulması və işəgötürənlərin peşə təhsilinin inkişafına yönələn layihələrə cəlb olunması (British Council və Absheron Hotel Group, Bocsh, Knauf, "İT STEP Academy") üzrə də iş aparılır. Ukraynanın "İT STEP Academy" şirkəti ilə birgə həyata keçirilən layihə çərçivəsində şəbəkə texnologiyaları və sistem inzibatçılığı, kompüter qrafikası və dizayn, proqram təminatının yaradılması ixtisasları üzrə birgə fəaliyyət nəzərdə tutulub.

Təhsil Nazirliyi ölkə iqtisadiyyatının ixtisaslı kadrlara olan tələbatının ödənilməsini, müasir iqtisadi çağırışlara çevik reaksiya vermək qabiliyyəti olan ilk peşə-ixtisas təhsili sisteminin formalaşdırılmasını və mövcud peşə təhsili şəbəkəsinin dövlət-biznes partnyorluğuna əsaslanan sistemə transformasiyasını təmin etmək üçün kompleks tədbirlər həyata keçirir. Odur ki, müasir dövrün tələbinə uyğun ilk peşə-ixtisas təhsili ixtisaslarına yiyələnmək üçün yaradılmış imkan və potensialdan yararlanmaq abituriyentlərin seçimindən və istəyindən asılıdır.

Təhsil Nazirliyi yanında Peşə Təhsili üzrə Dövlət Agentliyinin yaradılması da ilk peşə-ixtisas təhsili sahəsində peşə hazırlığının səmərəliliyini artırmaq və rəqabətqabiliyyətli ixtisaslı kadrların hazırlanmasını təmin etmək məqsədilə yaradılıb.

*- Maarifçi Tələbə Kredit Fondu hansı məqsədlə yaradıldı? Hər tələbə bu kreditlərdən istifadə edə bilərmi?*

- Maarifçi Tələbə Kredit Fondu Təhsil Nazirliyinin təşəbbüsü ilə yaradılıb. Fond dövlət ali təhsil müəssisələri tərəfindən təsis olunub. Fondun əsas missiyası təhsil haqqını ödəməkdə çətinlik çəkən aztəminatlı ailələrdən olan tələbələrə uzunmüddətli güzəştli kreditlər verilməsi vasitəsilə onlara ali təhsil almaqla bərabər imkanların yaradılmasıdır.

Tələbələr tərəfindən təhsil kreditləri üzrə müraciət yalnız elektron qaydada həyata keçirilir. Kreditlər üçün müraciət edən tələbələr müəyyən ümumi tələblərə cavab verməlidirlər. Belə ki, fonda Azərbaycan Respublikasının vətəndaşı olan, müvafiq təsisçi universitetlərin birində təhsil alan və təhsilini davam etdirmək üçün maliyyə yardımına ehtiyac duyan tələbələr müraciət edə bilərlər.

Cari ilin iyununda artıq 22 tələbəyə kredit ödənilib. Kreditlərin yenidən verilməsinə isə oktyabrın 1-dən başlanacaq. Tələbə kreditləri ilə bağlı artıq beynəlxalq təşkilatlarla əməkdaşlığa başlanılıb, o cümlədən Dünya Bankı ilə ilkin danışıqlar aparılıb və texniki yardım göstərilməsi üçün məsləhətçi ayrılıb. Məqsəd beynəlxalq

təcrübənin öyrənilməsidir. Artıq bu işlər üzrə ilkin hesabat hazırlanıb.

**Bu il ali təhsil müəssisələrinə rekord sayda tələbə qəbul olunub**

*- Azərbaycan-Fransız Universitetinin fəaliyyətə başlaması əslində, gənclərimizin təhsili üçün yaradılan daha bir vasitədir və xüsusi qeyd olunmalı məsələlərdəndir. Bu, beynəlxalq əməkdaşlıq yönümündə hansı irəliləyişlərə rəvac verəcək?*

- Azərbaycanla Fransa arasında bir çox sahələrdə olduğu kimi, təhsil sahəsində də yüksək səviyyədə əməkdaşlıq inkişaf edir. Azərbaycan-Fransız Universitetinin (UFAZ) yaradılması da bu əməkdaşlığın bariz nümunəsidir. Eyni zamanda, bu, Avropa keyfiyyətli ali təhsili ölkəmizdə əldə etməyə imkan verəcək, bu isə mühüm irəliləyiş olacaq.

UFAZ bu tədris ilindən ADNSU-nun binasında Azərbaycanda ən çox tələbat olan 4 ixtisas üzrə tədrisə start verəcək. Bu ixtisaslar kimya, geofizika, neft-qaz mühəndisliyi və kompüter elmləridir. Təhsil bütün ixtisaslar üzrə 1 il hazırlıq, 3 il əsas tədris müddəti olmaqla, 4 il davam edəcək. UFAZ-ın məzunları ikili diplom (Strasburq Universiteti və ADNSU) əldə edəcəklər.

*- Ötən ilin dekabrında alimlərimiz üçün xüsusi imkanların yaradılması ilə bağlı Təhsil Nazirliyi ilə "Thomson Reuters" arasında müqavilə imzalandı. Bu müqavilənin hazırkı icra vəziyyəti necədir?*

- Təhsil Nazirliyinin "Thomson Reuters" şirkətinin elmi tədqiqatlar və intellektual mülkiyyət üzrə şöbəsi ilə imzaladığı müqaviləyə əsasən, Azərbaycanın 40 ali təhsil müəssisəsi dünyada məşhur elmi istinad indeksi olan "Thomson Reuters Web of Science" platformasına çıxış əldə etmək imkanı qazanıb. Bununla yanaşı, AMEA-nın alimləri də bu platformadan istifadə edirlər. Həmin bazaya çıxış beynəlxalq elmi dairələrdə tanınmaq və qlobal universitet reytinqlərində yüksəlmək imkanı verəcək.

Dünyanın ən tanınmış elmi-analitik informasiya təminatçısı olan "Thomson Reuters" şirkəti ilə əməkdaşlıq rəqabətəqabil insan kapitalının hazırlanması siyasətinə əsaslanır və ölkəmizin inkişaf konsepsiyasına dəstək göstərilməsi məqsədi daşıyır.

*- Sizcə, tələbə köçürülməsinin elektron qaydada aparılması bu sahədə nəyi dəyişəcək?*

- Bu ilin avqustunda tələbələrin köçürül-məsində yenilik etdik. Artıq təhsil alanların ölkə daxilində və xaricdə yerləşən ali təhsil müəssisələrindən köçürülməsi, yaxud bir ixtisasdan digərinə dəyişdirilməsi elektron qaydada həyata keçirilir. Burada əsas məqsəd tələbə köçürülməsində şəffaflığın, rahatlığın və sadələşmiş prosedurun yaradılmasıdır. İndi tələbə rahat şəkildə bir universitetdən digərinə və ya bir ixtisasdan başqasına köçürülmək istəyirsə, bunun üçün sadəcə, elektron şəkildə məlumatlarını daxil edərək istəyini reallaşdıra bilər.

Təhsil Nazirliyinin əsas hədəfi odur ki, təhsil prosesinin baş verdiyi bütün sferalarda şəffaf mexanizm yaratsın. Yəni, müraciət edənlə məmur arasında birbaşa ünsiyyət olmadan məsələ həllini tapsın. Bu həm də ölkəmizdə son illərdə tətbiq olunan elektron idarəçilik sisteminin bir həlqəsidir. Təhsil Nazirliyi təhsilin bütün sferalarında bu cür innovativ yanaşmaları davam etdirməyi əsas məqsəd sayır.

*- Mikayıl müəllim, bu günlərdə Təhsil Nazirliyində keçirilən kollegiya iclası ali təhsilin inkişaf trendlərinə həsr olunmuşdu. Sizcə, bu inkişaf tendensiyalarını necə təsbit etmək olar?*

- Bu il ali təhsil müəssisələrində, belə demək mümkün olarsa, ümumilikdə rekord sayda tələbə qəbul olunub. Bunu ilk növbədə qəbul imtahanlarında keçid balının aşağı salınması hesabına deyil, akademik nəticələrin yüksəldilməsi hesabına əldə etmişik.

Bu, ölkəmizdə Azərbaycan Respub-likasının Prezidenti İlham Əliyevin rəhbərliyi ilə təhsil sahəsində həyata keçirilən islahatların məntiqi nəticəsidir. Ali təhsil müəssisələrimiz üçün tələbələrin həm sayının artımı, həm tələbələrin göstərdikləri nəticələrin yüksəlməsi, düşünürəm ki, onların fəaliyyəti üçün çox münbit bir şərait yaradır.

Bilirsiniz ki, cənab Prezidentin müvafiq fərmanı ilə bu yaxınlarda Azərbaycan Respublikasının “Elm haqqında” qanunu qəbul olunub. Həmin qanunda həmkarlarımızla dəfələrlə müzakirə etdiyimiz mövzulardan biri, nəhayət, öz müsbət həllini tapıbdır. Bu, çox böyük bir irəliləyişdir. Ölkəmizdə tədqiqat universitetlərinin tanınması - belə bir status, belə bir anlayış cənab Prezident tərəfindən müvafiq qanunla təsdiqlənib.

Biz ali təhsil müəssisələrində, xüsusilə böyük şəhərlərdə, ilk növbədə, paytaxtda tələbə yataqxanalarının az olmasını, bir çox universitetlərdə olmamasını müzakirə etmişik. Bunun səbəbləri də hər birimizə yaxşı məlumdur. Bizim təşəbbüsümüzə müsbət cavab verərək Heydər Əliyev Fondunun dəstəyi və təşəbbüsü əsasında şəhərimizin mərkəzi hissəsində 1000 nəfərlik tələbə yataqxanasının layihəsinə start verilib. Bu layihə dövlət-özəl tərəfdaşlığının daha bir nümunəsidir. Hazırda layihələndirmə işləri başa çatdırılıb və yaxın günlərdə artıq tikinti işlərinə başlanacaq. Müasir tələbə yataqxanası bu gün mövcud olan ən müasir standartlara uyğun olaraq tələbə infrastrukturunu və bugünkü həyat tərzini nəzərə almaqla inşa ediləcəkdir. Onu da qeyd etmək istəyirəm ki, bu, dövlətin müvafiq ali təhsil müəssisəsinin, xüsusilə Dövlət Neft və Sənaye Universitetinin balansında olan ərazilərdə həyata keçiriləcəkdir. Lakin burada layihənin bir özəlliyi vardır, biz belə bir fəlsəfə və siyasəti həyata keçirəcəyik ki, yalnız Dövlət Neft və Sənaye Universitetinin tələbələri deyil, həmçinin digər ali təhsil müəssisələrinin yataqxanaya ehtiyacı olan tələbələri müvafiq kvotalara uyğun olaraq, həmin yataqxanalarda yerləşmək imkanı qazansınlar.

Bu qəbildən olan digər məsələlərdən biri kimi ölkəmizdə fəaliyyət göstərən ali təhsil müəssisələrimiz üçün vahid elmi laboratoriyanın, vahid infrastrukturun yaradılması məsələsini nəzərdən keçiririk. Məqsəd ondan ibarətdir ki, ölkəmizin ali təhsil sistemində yetişən tələbələr yalnız öz sahələrində püxtələşmiş mütəxəssis və peşəkar kimi deyil, həmçinin də müasir Azərbaycanın layiqli vətəndaşı kimi öz hüquq və vəzifələrini bilən, vətəninə, öz dövlətinə hörmətlə yanaşan bir gənc və şəxsiyyət kimi yetişdirilsin. Bir daha vurğulamaq istəyirəm ki, bu bizim birgə işimizin nəticəsidir. Əminəm ki, bu istiqamətdə səylərimizi davam etdirəcəyik.

Ölkəmizdə bu il iki aparıcı ali təhsil müəssisəsinin yeni filialları fəaliyyətə başlayıb. Qazaxda Bakı Dövlət Universitetinin, Zaqatalada Azərbaycan Dövlət İqtisad Universitetinin filialı. Bir yeni ali təhsil müəssisəsi- Azərbaycan-Fransız Universiteti yeni tədris ilindən fəaliyyətə başlayır. Bir sıra ali təhsil müəssisələri daxili transformasiya və beləliklə də öz strukturlarının sağlamlaşdırılması prosesini davam etdirirlər. Beləliklə, biz potensialımızı artırmaqla, innovasiyaları genişləndirməklə Azərbaycanı regionun təhsil mərkəzinə çevirməyi hədəfləmişik.

*- Cənab nazir, məktəbdənkənar təhsil sahəsində hansı yeniliklər var?*

- Bu yeniliklər ötən tədris ilində kifayət qədər çoxsaylı olub. Növbəti tədris

ilində də bu işin miqyası əhatəli olacaq. Bu tədbirlər çərçivəsində 60 minədək məktəblinin müxtəlif tarixi və dövlət əhəmiyyətli məkanlara ekskursiyası təşkil olunub, "Multikulturalizm ili" ilə əlaqədar yaradıcılıq mərkəzlərinin müxtəlif konsert proqramları keçirilib.

İdman sahəsində isə bu ilin tədbirləri rəngarəng olub. Elə götürək Heydər Əliyev Fondunun təşəbbüsü ilə keçirilmiş "Bakı marafonu 2016" yarışmasını. Sevindirici haldır ki, "Bakı marafonu 2016"da Təhsil Nazirliyinin tabeliyindəki məktəblərin əməkdaşları və idmançıları - Namiq Əsədov, Tural Sadıqlı, Elman Abışov, Raidə Aslanova, Rəqsanə Rəcəbli, Lalə Pirumova ən yüksək nəticə göstərənlərdəndir.

"Rio 2016" Yay Olimpiya Oyunlarına hazırlıq ərəfəsində Milli Olimpiya Komitəsində idman federasiyaları, Gənclər və İdman Nazirliyinin rəhbərliyi ilə birgə geniş tərkibli görüşü keçirilib. Görüşün əsas məqsədlərindən biri təhsil və idman qurumları arasında üzvi əlaqəni təmin etmək, təhsil qurumlarının idman potensialından və məktəblərin idman qurğularından səmərəli istifadə etmək olub. Həmçinin Milli Olimpiya Komitəsi, Gənclər və İdman Nazirliyi və müvafiq idman federasiyalarının dəstəyi ilə təhsil müəssisələrində şagirdlərin idmana, xüsusən də bədən tərbiyəsinə cəlb olunması, məktəblilər və gənclər arasında idmanın kütləviliyinin təşviqi əsas mövzulardan biri olub. Sevindirici haldır ki, son illərdə məktəbdənkənar tərbiyənin effektiv təşkili nəticəsində müxtəlif miqyaslı yarışmalarda çıxış edən təhsil-idman məktəblərinin yetirmələrinin sayı da çoxalıb.

Təsadüfi deyil ki, Rio-de-Janeyro şəhərində təşkil olunan XXXI Yay Olimpiya Oyunlarında respublikamızı təmsil edənlər arasında yüksək nailiyyət qazanmış 2 nəfər idmançı Təhsil Nazirliyi sistemində fəaliyyət göstərən uşaq-gənclər idman məktəblərinin yetirmələrindəndir. Belə ki, sərbəst güləş üzrə 1 idmançımız gümüş, digəri isə bürünc medala layiq görülüblər. Həmçinin Təhsil Nazirliyinin tabeliyində fəaliyyət göstərən Gəncə şəhər Fiziki Hazırlıq Klubunun direktoru Ramil Qasımov "Rio 2016" XV Yay Paralimpiya Oyunlarında qızıl medal qazanıb. Bütün bu uğurlar ölkə Prezidenti cənab İlham Əliyevin idmanın inkişafına göstərdiyi davamlı qayğı sayəsində qazanılan nailiyyətlərin sırasını daha da zənginləşdirir.

Bakıda keçirilən 42-ci Ümumdünya Şahmat Olimpiadasında 6 komanda üzrə 30 şahmatçı ilə təmsil olunan milli komandamızın üzvlərindən 22-si Təhsil Nazirliyi sistemində fəaliyyət göstərən UGŞM-in yetirmələridir.

Ümumilikdə, təhsil insan inkişafının ahəngdarlığını təmin etməlidir. İstər tədrisdə qazanılan akademik göstəricilər olsun, istərsə də təhsil alanın fiziki inkişafı. Bu vəhdətdə məktəbin, ailənin və bütövlükdə sosial mühitin gəncin formalaşmasındakı rolu danılmazdır. Təhsilin dəyər və məqsədi də təkcə təhsil alanın imtahan balı ilə ölçülmür, yetkin vətəndaşın formalaşması ilə birbaşa bağlıdır.

***"Azərbaycan" qəzeti,***
***15 sentyabr 2016-cı il***



# MÜƏLLİM HAZIRLIĞI: MƏQSƏDLƏRİMİZ, STRATEJİ HƏDƏFLƏRİMİZ

**Cəfər Cəfərov,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor***

*Nəslimiz öz milli-mənəvi dəyərlərini öyrəndikcə öz keçmişindən qürur duyur və onlarda öz soyuna, kökünə, millətinə bağlılıq daha da möhkəmlənir.*

***Heydər Əliyev***

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev Azərbaycan Gənclərinin Birinci Forumundakı nitqində demişdir: "Xalqımızın tarixinin əsasını təşkil edən bütün mərhələlərdə yüksək mənəviyyat olmuşdur. Keçmiş tariximizdən bizə qalan simaları bu gün dünyada məşhurlaşdıran və bizim üçün nümunə edən onların yüksək mənəviyyatıdır, yüksək amallarıdır... Gənclərimiz milli ruhda, milli-mənəvi dəyərlərimizin əsasında tərbiyələnməlidir". Deməli, yetişməkdə olan gənc nəslin milli-mənəvi ruhda tərbiyəsi, təlim və tərbiyə işlərinin milli zəmində qurulması, tariximizin, mədəniyyətimizin, pedaqoji irsimizin öyrənilməsi hər zaman olduğu kimi, bu gün də aktuallığı ilə diqqəti cəlb edir. Müdriklər yaxşı demişlər ki, keçmişi unutma, çünki o gələcəyin müəllimidir.

Bu il ölkəmizin ali təhsil sistemində xüsusi yeri və mövqeyi olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) yaranmasının 95 ili tamam olur. Ümummilli liderimiz Heydər Əliyevin yüksək qiymət verdiyi Azərbaycan müəllimləri müstəqil respublikamızın intellektual potensialının formalaşmasında böyük əmək sərf etmişlər. Ölkəmizdə yüksəkixtisaslı pedaqoji və elmi-pedaqoji kadrların hazırlanmasında ADPU-nun professor-müəllim heyətinin və onun məzunlarının xüsusi payı vardır. Bu illər ərzində Pedaqoji Universitet böyük inkişaf yolu keçməklə bərabər, zəngin ənənələrə malik elm və təhsil müəssisəsi kimi tanınmışdır. Pedaqogika, psixologiya və ayrı-ayrı fənlərin tədrisi metodikası məhz bu ali məktəbdə təşəkkül tapmış, inkişaf edərək indiki yüksək səviyyəsinə çatmışdır. Çoxillik fəaliyyəti dövründə ADPU yalnız respublikamız üçün deyil, Gürcüstan, Mərkəzi Asiya respublikaları, Bolqarıstan və digər ölkələr üçün də yüksəkixtisaslı müəllim və elmi kadr hazırlığı prosesini uğurla həyata keçirmişdir.

ADPU-nun tarixinə və keçdiyi yola nəzər salanda görürük ki, Azərbaycan Xalq Komissarları Sovetinin (XKS) sədri Nəriman Nərimanovun imzaladığı 1921-ci il 26 avqust tarixli dekret əsasında 6 nəfər tələbə ilə milli dildə fəaliyyətə başlayan bu ilk ali pedaqoji təhsil ocağı yeni təşkil olunan I və II dərəcəli məktəbləri yüksəkixtisaslı pedaqoji kadrlarla təmin etmək məqsədilə yaradılmışdı. Fəaliyyəti dövründə institut 150 mindən çox müəllim kadrları hazırlamış, bir sıra ixtisaslar üzrə elmi-pedaqoji kadr hazırlığının mərkəzinə çevrilmişdir.

İnstitut tədris və elmi-pedaqoji fəaliyyəti dövründə müxtəlif çətinliklərə də

məruz qalmışdır. İki dəfə (1927-1929 və 1941-1943-cü illərdə) fəaliyyəti dayandırılmış, Azərbaycan Dövlət Universiteti (indiki Bakı Dövlət Universiteti) ilə birləşdirilmişdir. Lakin zamanın bütün çətinliklərindən şərəflə çıxaraq Azərbaycanda milli mədəniyyətin, elmin və təhsilin inkişafında xüsusi xidmətləri olan müəllim kadrları yetişdirməklə, millətin mənəvi potensialının formalaşmasında önəmli rolunu qoruyub saxlamışdır.

Qeyd etmək lazımdır ki, institutun ali təhsil ocağı kimi formalaşmasında və inkişafında Azərbaycan hökumətinin başçısı N.Nərimanov, xalq maarif komissarı D.Bünyadzadə, dövrün görkəmli ziyalıları - M.Quliyev, Ü.Hacıbəyli, V.Xuluflu, Ə.Übeydulin, B.Çobanzadə və sair ziyalıların xidməti əvəzsizdir. 95 il əvvəl yaranmış institutun ilk direktoru Odessa Universitetinin məzunu Fətulla bəy Rzabəyli, direktor müavini Tiflis Müəllimlər İnstitutunun məzunu Həbib bəy Mahmudbəyov olmuşdur.

Sonralar direktor vəzifəsində çalışan M.Əfəndiyev, H.Mahmudbəyov, Ş.Manafov və C.Məmmədzadə Pedaqoji İnstitutun təşkilati baxımdan möhkəmlənməsi, o cümlədən tədrisin təşkili və elmi fəaliyyətin tənzimlənməsi istiqamətində səmərəli fəaliyyət göstəriblər. Onların həyata keçirdikləri konkret əməli tədbirlər yeni təhsil müəssisəsinin maddi-texniki bazasının qurulub möhkəmləndirilməsinə, fakültə və şöbələrin elmi-pedaqoji kadrlarla təmin edilməsinə, fəhlə və kəndli gənclərin ali təhsil almalarına təkan verdi. Rusiya, Qərbi Avropa, Türkiyə və Şərqin bir sıra tədris və elm mərkəzlərində təhsil alan yüksəkixtisaslı milli kadrlar burada pedaqoji fəaliyyətə cəlb edildilər. Onlara öz bilik və bacarıqlarını tədris prosesinə tətbiq etmələri üçün münasib şərait yaradıldı.

Azərbaycanda pedaqoji kadrların hazırlanması prosesini yaxşılaşdırmaq və ali məktəblərdə vahid rəhbərliyi təmin etmək məqsədilə Azərbaycan XKS 1926-cı il iyunun 16-da "Ali pedaqoji institutların yenidən təşkili haqqında" qərar qəbul etdi. Həmin qərara uyğun olaraq Ali Pedaqoji Kişi və Ali Pedaqoji Qadın İnstitutları BDU-nun Pedaqoji fakültəsinə birləşdirildi. BDU-nun Pedaqoji fakültəsi səmərəli fəaliyyət göstərməsinə baxmayaraq, ali təhsilli pedaqoji kadrlara olan ehtiyacı lazımınca ödəyə bilmədi. Buna görə də Pedaqoji fakültənin bazası əsasında müstəqil ali təhsil müəssisəsinin - Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (ADPİ) yenidən yaradılması planlaşdırıldı. Respublikada ali pedaqoji təhsilin yenidən qurulmasında uğurlu addımlar atıldı. P.Qasımov instituta direktor, professor B.B.Komarovski isə direktor müavini təyin edildilər. BDU müvəqqəti olaraq öz fəaliyyətini dayandırdı. BDU-nun Pedaqoji fakültəsində çalışan tanınmış alimlərin əksəriyyəti ADPİ-yə müəllimliyə cəlb olundular.

1930-cu illərdə və 40-cı illərin əvvəllərində ADPİ-də təşkilati məsələlərin həllində, tədris və elmi-tədqiqat işlərinin düzgün qurulmasında direktor vəzifəsində çalışan P.Qasımovun, M.Bayramovun, B.Bünyadovun, M.Məmmədovun, D.Rəsulzadənin böyük xidmətləri oldu. Onların fəaliyyət göstərdikləri dövr tariximizin çox mürəkkəb, ziddiyyətli və faciələrlə dolu bir mərhələsidir. Sərt və ciddi qanunların tətbiqi ilə səciyyələnən həmin dövrdə Pedaqoji İnstitutda təhsilin tamamilə siyasiləşdirilməsi, sinfi mübarizənin gücləndirilməsi ali pedaqoji təhsilin inkişafında demokratik ənənələrin inkişafını ləngitməklə yeni, arzuolunmaz istiqamətin formalaşmasına zəmin yaratdı. 30-cu illərdə başlanan repressiya dalğası Azərbaycanın bir çox ziyalıları kimi, Pedaqoji İnstitutun da ən yaxşı müəllimlərinin məhv edilməsinə və ya

sürgünə göndərilməsinə səbəb oldu. Ölkədə tüğyan edən repressiya dalğası ADPİ-nin kafedralarına rəhbərlik edən milli kadrlarla yanaşı, bəzi görkəmli rus alimlərinin də həyatını puç etdi, onların yerinə ermənilər asanlıqla yerləşdirildi.

Böyük Vətən müharibəsinin ilk illərində ADPİ-nin maliyyə imkanları tükəndi, tələbə və müəllim heyətinin maddi vəziyyəti ağırlaşdı. Bu səbəbdən də Azərbaycan XKS və Azərbaycan K(b)PMK-nın qərarı ilə institut 2-ci dəfə BDU ilə birləşdirildi. Müharibənin gedişində əsaslı dönüş yarandıqdan sonra ADPİ BDU-nun tərkibindən ayrıldı və müstəqil ali təhsil müəssisəsi kimi fəaliyyətə başladı. Bu dövrdə instituta rəhbərlik ardıcıl olaraq A.Abdullayev, M.Ələkbərli və Ə.Seyidova həvalə edildi. ADPİ-nin yenidən qurulması onun maddi-texniki bazasının xeyli möhkəmlənməsinə, tələbə kontingentinin genişlənməsinə imkan verdi. Cəbhədə həlak olan müəllimləri əvəz edə biləcək elmi-pedaqoji kadrlar hazırlamaq üçün məqsədyönlü işə başlandı.

Xronoloji ardıcıllığa əsasən, ötən əsrin 50-70-ci illərində tanınmış elm və maarif xadimləri - C.Hacıyev, M.Mehdizadə, H.Qədirov, C.Ələsgərov, M.Vəkilov, M.Əliyev, Ş.Ağayev ADPİ-nin direktoru (rektoru) vəzifəsində çalışıblar.

50-60-cı illərdə M.Muradxanov, Ə.Zəkuzadə və Ə.Əbdülrəhmanova professor elmi adının verilməsi, professor A.Abbaszadənin RSFSR PEA-nın müxbir üzvü, M.Mehdizadənin SSRİ PEA-nın həqiqi üzvü seçilməsi böyük elmi hadisə kimi gənc elmi kadrların inkişafına təkan verən əsas amilə çevrildi. Fəxrlə deyə bilərik ki, Azərbaycan Milli Elmlər Akademiyasının 10 prezidentinin 3-ü - Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev ADPU-nun məzunları, SSRİ PEA-nın həqiqi və müxbir üzvü seçilən azərbaycanlı alimlər - M.Mehdizadə, A.Abbaszadə, H.Əhmədov, S.İmanov ADPU-nun əməkdaşları olmuşlar.

Pedaqoji Universitet Azərbaycanda elmin və təhsilin inkişafına dəyərli töhfələr verən tanınmış alimlər yetişdirmiş, fəaliyyəti ərzində elmi mərkəz kimi formalaşıb inkişaf etmişdir. Bu ali təhsil müəssisəsində pedaqogika və psixologiya (Ə.Y.Seyidov, M.M.Mehdizadə, Ə.K.Zəkuzadə, M.Ə.Muradxanov, Ş.S.Ağayev, H.M.Əhmədov, Ə.Ə.Əlizadə), riyaziyyat (M.R.Əfəndiyev, M.Ə.Cavadov, İ.İ.İbrahimov, M.H.Cavadov), fizika (A.Q.Abbaszadə, S.Ş.İmanov, B.Tağıyev, C.Abdinov, A.Mehrabov, M.İ.Murquzov), kimya (H.Şahtaxtinski, Ş.Ə.Məmmədov, A.Ə.Verdizadə), biologiya (Z.M.Şahtaxtinskaya, A.İ.Qarayev), tarix (Z.İ.İbrahimov, Y.B.Yusifov), filologiya (B.V.Çobanzadə, M.Ş.Şirəliyev, Ə.M.Dəmirçizadə, M.H.Rəfili, Ə.R.Sultanlı, H.M.Araslı, F.S.Qasımzadə, A.M.Qurbanov, H.İ.Mirzəyev), fəlsəfə (H.İ.Hüseynov) və başqa sahələr üzrə elmi məktəblər və istiqamətlər yaradılıb inkişaf etdirilmişdir.

Xalqımızın fəxr etdiyi yüzlərlə tanınmış alim, yaradıcı ziyalı, ictimai və dövlət xadimi ADPU-da təhsil almışdır. Universitetin məzunlarından Y.Məmmədəliyev, H.Hüseynov, Z.Xəlilov, H.Abdullayev, M.Rəsulov, Ə.Hüseynov, İ.Hüseynov, S.Rəhimov, Ş.Qurbanov, A.Qarayev, Ə.Sumbatzadə, M.Dadaşzadə, M.Cəfərov, İ.İbrahimov, M.Şirəliyev, İ.Şıxlı, H.Əmirxanov kimi tanınmış elm və mədəniyyət xadimləri çoxdan xalqımızın elm və şöhrət simvollarına çevrilmişlər. Onların hər birinin adı xarici ölkələrdə keçirilən beynəlxalq səviyyəli nüfuzlu elmi məclislərdə böyük iftixarla çəkilir.

Sovet İttifaqı Qəhrəmanları - Mehdi Hüseynzadə, Xıdır Mustafayev, Fariz Səfərov, Səlahəddin Kazımov, Sosialist

Əməyi Qəhrəmanları - Səfa İmanov, Zərbəli Səmədov, Rüstəm Səfərəliyev, Azərbaycanın Milli Qəhrəmanları - Mirələkbər İbrahimov, Mətləb Quliyev, "Azərbaycan Bayrağı" ordenli Malik Bayramov, Mürşid Məmmədov igidlik, hünər, vətənpərvərlik rəmzi kimi xatırlanırlar. Onlar mərdlik və şücaətləri ilə məzunu olduqları ADPU-nun şərəfini uca tutmaqla on minlərlə insana örnək və tərbiyə nümunəsidir. ADPU-nun məzunları müxtəlif ali məktəblərdə, elmi-tədqiqat institutlarında, dövlət təşkilatlarında uğurla fəaliyyət göstərirlər.

Qeyd edək ki, ADPU-nun 95 illik tarixinin bütöv bir mərhələsində (1969-1987 və 1993-2003-cü illər) qazanılan uğurlar bilavasitə ümummilli liderimiz Heydər Əliyevin unudulmaz adı və çoxşaxəli fəaliyyəti ilə qırılmaz tellərlə bağlıdır. "Təhsil millətin gələcəyidir!" deyən ümummilli lider Heydər Əliyev daim ADPU-nu yüksək qiymətləndirmiş, 5 dəfə ADPU-da olmuş, professor-müəllim və tələbə kollektivinə çox dəyərli tövsiyə və məsləhətlər vermiş, hər bir əməkdaşın arzu və istəkləri ilə maraqlanmışdır. Müdrik siyasi xadim, görkəmli dövlət rəhbəri Heydər Əliyevin dəyərli tövsiyələri ADPU-da təhsil-tərbiyənin səmərə və keyfiyyətinin yüksəldilməsində, qəbul imtahanları prosesində obyektivlik və ədalətin təmin olunmasında, nöqsanların aradan qaldırılmasında, gənclərin ictimai fəallığının artırılmasında, yüksək səviyyəli elmi-pedaqoji kadr hazırlığında həlledici rol oynamışdır.

Ulu öndərin ADPİ-nin 60 illik yubileyi ilə bağlı təntənəli mərasimdə "Azərbaycan Dövlət Pedaqoji İnstitutu böyük və çətin yol keçmişdir. Onun kollektivi Azərbaycan ümumtəhsil məktəbinin inkişafında böyük xidmət göstərmiş, institut xalq maarifi üçün yüksəkixtisaslı kadrlar ocağına çevrilmişdir" -cümlələri ilə ali məktəbə verdiyi yüksək qiymət institut əməkdaşlarının sonrakı fəaliyyətinə yeni, sağlam nəfəs vermişdir.

Öz idarəçilik və dövlətçilik fəaliyyətində müəllim adına, müəllim əməyinə yüksək qiymət verən ümummilli liderimiz Heydər Əliyevin müəllimlə bağlı belə bir müdrik fikri var: "Hər birimizdə müəllimin hərarətli qəlbinin bir zərrəciyi vardır. Məhz müəllim doğma yurdumuzu sevməyi, hamımızın rifahı naminə vicdanla işləməyi müdrikliklə və səbirlə bizə öyrətmiş və öyrədir. Müəllim adı dünyada ən yüksək addır. Şəxsən mən Yer üzündə müəllimdən yüksək ad tanımıram. Çünki hər birimizə təhsil, bilik verən, bu səviyyəyə qaldıran məktəbdir və məktəbdə təhsil verən də müəllimdir. Mən müəllim qarşısında baş əyirəm".

Ulu öndər Heydər Əliyevin mütərəqqi ideyalarının layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verərək demişdir: "Müəllim Azərbaycanda ən hörmətli insandır. Müəllimlər Azərbaycan cəmiyyətinin elitasıdır".

70-80-ci illərdə institutda tədris və elmi fəaliyyətin səviyyəsinin yüksəldilməsi, yüksəkixtisaslı müəllim kadrlarının hazırlanması, maddi-texniki bazanın genişləndirilməsi, yeni tədris korpusları və tələbə yataqxanalarının tikilməsi istiqamətində konkret tədbirlər həyata keçirildi. ADPU-nun rəhbərliyi dəyişdirildi. Əvvəlcə professor Haşım Ağayev, sonra professor Afad Qurbanov instituta rektor təyin olundular.

80-ci illərin sonları 90-cı illərin əvvəllərində ölkədə mövcud olan ictimai-siyasi şərait, hakimiyyət uğrunda gedən mübarizə, ermənilərin işğalçılıq siyasəti tədris prosesində və elmi-tədqiqat işlərində geriləməyə səbəb oldu. Ölkəmizə erməni-sovet hərbi qruplaşmalarının təcavüzü, eyni zamanda ölkə daxilində hakimiyyət uğrunda

mübarizə aparan səriştəsiz müxalifət qruplarının qanunazidd üsullarla hakimiyyətə yiyələnmək təşəbbüsləri nəticəsində respublikada nizam-intizam pozuldu. Bütün bunlar ADPU-da normal tədris fəaliyyətinə mane olurdu. Belə çətin bir şəraitdə xalqımızın böyük oğlu, ulu öndər Heydər Əliyev xalqın təkidli tələbi ilə yenidən respublika rəhbərliyinə gəldi və “Mən öz ömrümün qalan hissəsini də xalqıma bağışlayıram”, - deyərək müasir Azərbaycan dövlətini qurmaq missiyasını həyata keçirməyə başladı. Beləliklə, ölkədə alovlanmaqda olan vətəndaş müharibəsinin qarşısı alındı, silahlı yolla hakimiyyətə gəlmək cəhdlərinə birdəfəlik son qoyuldu, ictimai-siyasi sabitlik təmin edildi. Ermənilərlə hərbi qarşıdurmada tarazlığa nail olundu, hərbi əməliyyatlar dayandırıldı, münaqişənin dinc yolla aradan qaldırılması üçün ilkin şərait yarandı. Qonşu dövlətlərlə yaranmış gərginlik tədricən aradan qaldırıldı. Ölkədə və cəbhədə yaranmış sabitlik və Heydər Əliyevə inam nəticəsində 1994-cü il sentyabrın 20-də Bakıda dünyanın böyük neft şirkətləri ilə “Əsrin müqaviləsi” imzalandı. Respublikada irimiqyaslı sosial-iqtisadi problemlərin həlli istiqamətində məqsədyönlü tədbirlər həyata keçirildi. Ümummilli lider Heydər Əliyev böyük siyasi məharətlə Azərbaycanı, dövlətçiliyimizi, müstəqilliyimizi təhdid edən bütün bəlaları dəf etdi, iqtisadiyyatımızın, beynəlxalq əlaqələrimizin, milli birliyimizin möhkəm özülünü quraraq bizlərə əmanət etdi. Cəmiyyətin bütün potensialı mənəvi-psixoloji, sosial-iqtisadi mühitin sağlamlaşmasına, millətin tərəqqisinə və inkişafına yönəldi. Bütün tədris və elm müəssisələri kimi, ADPU-nun da səmərəli fəaliyyəti üçün əlverişli zəmin yarandı.

ADPU ölkəmizdə ali pedaqoji məktəblər arasında universitet statusu alan ilk tədris və elm ocağıdır. Belə ki, 1991-ci ildə Nazirlər Kabinetinin müvafiq qərarı ilə bu ali məktəbə universitet statusu verilmişdir. Zəngin elm və təhsil ənənələrinə malik olan ADPU respublikamızda ali pedaqoji təhsilin öncülü hesab edilir.

ADPU-ya 1989-1994-cü illərdə professor Səlvər Aslanov, 1994-1996-cı illərdə professor Nizami Xudiyev, 1996-2006-cı illərdə professor Bəhlul Ağayev, 2006-2016-cı illərdə professor Yusif Məmmədov rəhbərlik ediblər.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 23 iyun 2016-cı il tarixli Sərəncamı ilə ADPU-nun rektoru vəzifəsinə professor Cəfər Cəfərov təyin olundu.

Xüsusi qeyd etmək istəyirəm ki, Azərbaycan Prezidenti İlham Əliyevin rəhbərliyi ilə ölkəmizdə iqtisadi, siyasi, sosial, hüquqi islahatların həyata keçirilməsində, hüquqi, demokratik, dünyəvi dövlət və vətəndaş cəmiyyəti quruculuğunun genişlənməsində, milli və dünyəvi dəyərlərin bərqərar edilməsində, insan və vətəndaş hüquq və azadlıqlarının təmin olunmasında, demokratik təsisatların yaradılmasında, bazar iqtisadiyyatına keçid prosesində əldə edilən nailiyyətlərin mühüm bir hissəsi təhsilin payına düşür. Təhsil bilik, bacarıq və qabiliyyətlərin gənc nəslə öyrədilməsi və ötürülməsi prosesidir. Təhsil geniş anlayışdır, onun müxtəlif pillələri, mərhələləri vardır. Təhsil sahəsində qarşıya qoyulan vəzifələr tədris prosesində gerçəkləşdirilir. Ali təhsil bütövlükdə təhsil sisteminin ən mühüm, ən vacib mərhələlərindən biridir. Çünki ali təhsil hər bir ölkənin insan kapitalının formalaşmasında böyük rol oynayır. İnsan kapitalı isə insanın malik olduğu qabiliyyət, qazandığı bilik, bacarıq və motivasiya imkanlarını müəyyən edir. Təhsil cəmiyyətin inkişafının özülünü təşkil etməklə yanaşı, həm də ölkənin təhlükəsizliyinin, sabitliyinin təmin edilməsində

mühüm amil kimi çıxış edir. Dövlət başçımızın qeyd etdiyi kimi, "Təhsil Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biridir".

Ölkəmizdə təhsilin ayrı-ayrı sahələrinin inkişafı üzrə real vəziyyətin təhlili əsasında hazırlanıb təsdiq edilən və həyata keçirilən proqramlar nəticəsində təhsilin infrastrukturu müasir tələblərə uyğun qurulmuş, təhsilin məzmunu yeniləşdirilmiş, "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli kurikulumu)" təsdiq olunmuş, yeni dərslik siyasəti reallaşdırılmış, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni model və mexanizmlər tətbiq edilmiş, təhsil müəssisələri informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilmiş, təhsil sisteminin informasiyalaşdırılması, məktəbəqədər, texniki peşə, ali təhsil, xaricdə təhsil, istedadlı uşaqların inkişafı, xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsilinin təşkili və digər bu kimi sahələrdə əhəmiyyətli nailiyyətlər əldə olunmuş, maddi dəyərlərdən əldə edilən kapital insan kapitalının inkişafına yönəldilmişdir.

Dövlət başçımız İlham Əliyevin sərəncamları ilə təhsil, səhiyyə, elm və mədəniyyət sahəsində inkişafyönümlü proqram və layihələrin uğurla həyata keçirilməsində Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Milli Məclisin deputatı, UNESCO və İSESCO-nun xoşməramlı səfiri Mehriban xanım Əliyevanın böyük xidmətləri vardır. Heydər Əliyev Fondunun "Uşaq evləri və internat məktəblərinin inkişafı", "Yeniləşən Azərbaycana yeni məktəb", "Təhsilə dəstək", "Məktəbəqədər təhsil müəssisələrinin inkişafı proqramı" və digər layihələri özünün humanist məqsədləri ilə diqqəti cəlb edir. Milli-mənəvi dəyərlərimizin qorunmasına, bütün dünyada təbliğinə böyük töhfələr verən Mehriban xanım Əliyevanın həyata keçirdiyi layihələr, humanitar yönümlü proqramlar ölkəmizdən çox-çox uzaqlarda da böyük rəğbətlə qarşılanır. Xarici ölkələrdə (Pakistan, İtaliya, Rusiya, Fransa, Gürcüstan və s.) Heydər Əliyev Fondunun vəsaiti hesabına inşa olunan məktəb binaları, təmir edilən mədəniyyət abidələri Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyətinin bariz nümunəsidir.

Ulu öndər Heydər Əliyevin xatirəsini əbədiləşdirmək, onun zəngin və mənalı həyat yolunu, çoxşaxəli fəaliyyətini dərindən öyrənmək, təbliğ etmək, gələcəyin müəllimlərini dövlətçiliyə sədaqət və azərbaycançılıq ruhunda tərbiyə etmək ADPU-nun professor-müəllim heyətinin ən ümdə vəzifələrindəndir. Heydər Əliyev irsində Vətən sevgisi, Azərbaycan sevgisi, azərbaycançılıq hissi, xalq, millət sevgisi, dil sevgisi, milli mədəniyyət sevgisi, insanın insana, insanın Vətəninə, xalqına, dövlətinə sədaqət hissi mühüm yer tutur. Bu irsin qorunması və gələcək nəsillərə çatdırılması, hər bir gəncdə azərbaycançılıq hissinin formalaşdırılması, gənc nəslin dövlətçilik ənənələrinə sədaqət ruhunda tərbiyə olunması ən vacib şərtlərdən biridir. Ulu öndərin xatirəsinə ehtiram əlaməti olaraq ADPU-nun foyesində abidəsi qoyulmuş, nadir eksponatları sərgiləyən, professor-müəllimlərin, tələbələrin və universitetin qonaqlarının ziyarət məkanına çevrilən Heydər Əliyev Muzeyi yaradılmışdır. Zəngin irsin gənc nəslə çatdırılması məqsədilə "Heydər Əliyev məktəbinin lektoriyası" təşkil edilmiş, ADPU-nun 2 nömrəli tədris binasında möhtəşəm Heydər Əliyev Mərkəzi yaradılmışdır. Heydər Əliyevin nəzəri irsini dərindən öyrənmək məqsədilə universitetin professor-müəllim heyəti, tələbələri və doktorantları üçün xüsusi kurslar təşkil edilmişdir.

Hazırda ADPU-da 8 fakültə - Filologiya, Tarix və coğrafiya, Riyaziyyat və

informatika, Kimya və biologiya, Fizika və texnologiya, Məktəbəqədər təhsil, Psixoloji xidmət və korreksiyaedici təlim, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq, İbtidai təhsil fakültələri, Magistratura və doktorantura şöbəsi, həmçinin SABAH qrupları fəaliyyət göstərir.

Azərbaycan Respublikası Prezidentinin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq olunmuş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda nəzərdə tutulan ən mühüm vəzifələrdən biri də müasir tələblərə cavab verən təhsil infrastrukturunun yaradılması və təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılmasıdır. Dövlət Strategiyasının bu tələblərinə uyğun olaraq, ölkə Prezidentinin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutunun (AMİ) ADPU-ya birləşməsi və onun filiallarının ADPU-nun strukturuna çevrilməsi nəticəsində ADPU ölkədə pedaqoji kadr hazırlığı ilə məşğul olan unikal ixtisaslaşmış ali təhsil müəssisəsinə çevrilmişdir. Bununla yanaşı, Nazirlər Kabinetinin 3 fevral 2016-cı il tarixli qərarı ilə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) birləşdirilməklə ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərməyə başlayıb. Qeyd edək ki, dövlət başçımızın 2016-cı il 29 aprel tarixli Sərəncamı ilə ADPU-nun Qazax filialı Bakı Dövlət Universitetinə, Zaqatala filialı isə Azərbaycan Dövlət İqtisad Universitetinə verilib. Hazırda ADPU-nun 5 filialı - Ağcabədi, Cəlilabad, Quba, Şəki və Şamaxı filialları fəaliyyət göstərir.

Qeyd etdiklərimizlə bərabər, Təhsil naziri Mikayıl Cabbarovun 20 iyul 2016-cı il tarixli əmri ilə Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb 2016/2017-ci tədris ilindən ADPU-nun baza məktəbi kimi müəyyənləşib ki, bu da ölkəmizdə ardıcıl şəkildə həyata keçirilən təhsil islahatlarının, eləcə də yüksəkixtisaslı pedaqoji kadrların hazırlanması prosesinin tərkib hissəsidir və nəticə etibarilə təhsilin keyfiyyətinin yaxşılaşmasına xidmət edir.

Baş verən struktur dəyişiklikləri nəticəsində ADPU-nun fəaliyyət dairəsi genişlənib, professor-müəllim heyətinin və tələbə kollektivinin sayı xeyli artıb. ADPU-da hazırda filiallar və Pedaqoji Kolleclə birlikdə təxminən 20 minə yaxın tələbə təhsil alır. Universitetdə 67 elmlər doktoru, 61 professor, 273 dosent, 354 fəlsəfə doktoru çalışır. ADPU-da ali təhsilin bakalavriat səviyyəsində 22 ixtisas, magistratura səviyyəsində isə 18 ixtisas üzrə pedaqoji kadr hazırlanır. Universitetin 1 professoru AMEA-nın müxbir üzvü, 4 professoru isə əməkdar elm xadimidir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı ilə əhatə olunmuş ADPU bu gün öz inkişafının keyfiyyətcə yeni mərhələsinə qədəm qoymuşdur. Qarşımızda böyük strateji hədəflərimiz, ali məqsədlərimiz var. Hazırda ADPU-da şəffaf və obyektiv təhsil mühitinin yaradılması, yeniliyin və müasirliyin təmin edilməsi, qabaqcıl beynəlxalq təcrübənin öyrənilərək tətbiq olunması, bazar iqtisadiyyatının tələblərinə uyğun rəqabətqabiliyyətli mütəxəssislərin hazırlanması əsas vəzifələrdir. Müasir əmək bazarının tələbləri öyrənilməli və bu tələblərə cavab verə biləcək pedaqoji kadrların hazırlanması istiqamətində səmərəli və məqsədyönlü iş aparılmalıdır. Fəaliyyəti uyğun gələn və yaxud eyniyönümlü kafedralar birləşdirilməli, kafedralar, elmi-tədqiqat laboratoriyaları fəaliyyətlərini yenidən qurmalı və yüksək elmi nəticələrə nail olmalıdırlar.

ADPU-da maddi-texniki bazanın möhkəmləndirilməsi, ali pedaqoji təhsilin

məzmun və formasının təkmilləşdirilməsi, professor-müəllim heyəti və tələbə kollektivi arasında mənəvi-psixoloji mühitin sağlamlaşdırılması istiqamətində əməli tədbirlər həyata keçirilir. Struktur islahatlarının həyata keçirilməsi, idarəetmənin optimallaşdırılması, fəaliyyətinin nəticələrinə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik idarəetmə sisteminin formalaşdırılması və universitetin idarə edilməsinin qabaqcıl beynəlxalq təcrübə əsasında yenidən qurulması istiqamətində ciddi addımlar atılır. Tədrisin məzmununun müasirləşdirilməsi, ADPU-nun inkişafı, fəaliyyətinin yenidən qurulması ilə bağlı fəaliyyət planının hazırlanması, tədris işi ilə bağlı dünya təcrübəsinin, habelə ölkədə toplanmış qabaqcıl təcrübənin öyrənilməsi və tətbiq edilməsi, peşə hazırlığı fənləri ilə yanaşı, xarici dillərin tədrisinin gücləndirilməsi, tədris planlarının təkmilləşdirilməsi, tələbələrin dərslik və dərs vəsaitləri ilə təminatının yaxşılaşdırılması, kitabxana fəaliyyətinin modernləşdirilməsi, elektron kitabxana şəbəkəsinin, rəqəmsal təhsil resurslarından istifadə imkanlarının genişləndirilməsi və beynəlxalq informasiya resurslarına çıxış imkanlarının təmin edilməsi qarşımızda dayanan əsas vəzifələrdir. Elmi-tədqiqat laboratoriyalarının işi yenidən qurulmalı, elmi-tədqiqatların dövlət sifarişi və qrant layihələri əsasında maliyyələşdirilməsi mexanizmi hazırlanmalı, elmi-tədqiqat laboratoriyalarının işinin təşkilində innovativ fəaliyyəti stimullaşdıran qrant sisteminin yaradılması və tətbiqi istiqamətində tədbirlər həyata keçirilməli, təhsilin keyfiyyətinin təminatı üzrə yeni sistem və keyfiyyətin monitorinqi və qiymətləndirmə mexanizmləri yaradılmalıdır. İnformasiya-kommunikasiya texnologiyaları əsaslı təlim metodologiyasının tələblərinə uyğun infrastruktur yaradılmalı, universitetin bütün struktur bölmələri kompüter avadanlıqları ilə təchiz olunmalı, professor-müəllim heyətinin və hər bir tələbənin internetə rahat çıxışı təmin edilməli, professor-müəllim heyətinin peşəkarlıq səviyyəsinin daim yüksəlməsini təmin edən yeni sistem yaradılmalı, bu məqsədlə də yeni ixtisasartırma və rəqabətəsaslı təlimlər sisteminin yaradılmasına başlanılmalı, ayrı-ayrı ixtisaslar və fakültələr üzrə reytinq sistemi formalaşdırılmalıdır. ADPU-da, onun filiallarında və ADPK-də tələbələrin bilik və bacarıqlarının qiymətləndirilməsi qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılmalıdır.

Qeyd etmək istəyirəm ki, diferensial əməkhaqqı sistemi ali təhsilin modernləşməsində mühüm rol oynayır. Buna görə də sağlam və ədalətli rəqabət şəraitində əməkdaşların maddi motivasiyasının yaxşılaşdırılması məqsədilə səriştə və nəticə əsaslı diferensiallaşdırılmış rəqabətqabiliyyətli əməkhaqqı sisteminin yaradılması vacib vəzifələrdir. Eyni zamanda əməkdaşların icra intizamı, təşəbbüskarlıq, xidməti fəaliyyətinin qiymətləndirilməsi və əmək intizamına nəzarət xidmətinin gücləndirilməsi, ADPU-nun fəaliyyəti ilə bağlı marketinq və ictimaiyyətlə əlaqələr işinin təşkili, universitetin fəaliyyəti ilə bağlı təbliğat və təşviqatın genişləndirilməsi istiqamətində əməli tədbirlərin həyata keçirilməsi də olduqca vacibdir. ADPU-da mütəmadi olaraq respublika və beynəlxalq miqyaslı konfranslar, simpoziumlar, seminarlar, treninqlər, olimpiadalar, təhsil karyera sərgiləri keçirilməli, beynəlxalq tələbə mübadiləsi gerçəkləşdirilməli, orta təhsil müəssisələri ilə əlaqələr genişləndirilməlidir. Həmçinin ADPU öz məzunları ilə sıx əlaqə saxlamalı, onları universitetin ümumi inkişaf prosesinə cəlb etməlidir. Universitet elmi kəşflərin və ixtiraların biznes layihələri, qrant layihələri ilə birləşdiyi bir məkana çevrilməlidir. Tələbə-gənclər universitetin idarə edilməsinə yaxından cəlb edilməli, onların yara-

dıcı təşəbbüsləri nəzərə alınmalıdır. Universitetin saytının rus və ingilis dillərində versiyaları hazırlanmalı, yeni loqosu yaradılmalı, veb-səhifəsi yenilənməli, daxili radio yaradılmalı, təhsilin idarə edilməsində informasiya-kommunikasiya texnologiyalarının imkanlarından maksimum istifadə edilməli, kütləvi informasiya vasitələri ilə əməkdaşlığı genişləndirilməlidir.

2016/2017-ci tədris ilinin elmi-statistik təhlilini də diqqətinizə çatdırmağı məqsədəuyğun hesab edirəm. İlk olaraq qeyd etmək istəyirəm ki, universitetdə yaradılmış Sənəd Qəbulu Komissiyası (SQK) 15-31 avqust tarixlərində bu ali məktəbin Bakı şəhəri, Səbail rayonu, Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanında yerləşən 1 nömrəli tədris korpusunda şənbə və bazar günləri istisna olmaqla hər gün saat 09:00-dan 17:00-a kimi fəaliyyət göstərib. Tələbə-gənclərin qeydiyyatı zamanı növbəlilik prinsipinin, qayda-qanunun və nizam-intizamın qorunması diqqət mərkəzində saxlanılıb. SQK universitetə qəbul olunmuş I kurs tələbələrinin qanun çərçivəsində və çevik şəkildə qeydiyyata alınmalarına və sənədləşmənin düzgün aparılmasına nəzarət edib. ADPU-da fəaliyyət göstərən 8 fakültənin dekanları, dekan müavinləri və əməkdaşları, eləcə də Tələbə Gənclər Təşkilatının üzvləri tələbələrin qeydiyyata alınmasında yaxından iştirak ediblər. Qeydiyyat zamanı universitetlə tələbələr arasında imzalanan ikitərəfli müqavilədə nəzərdə tutulmuş öhdəliklər onlara aydın izah edilib. Bir sözlə, universitetdə qeydiyyat çevik, mütəşəkkil və qanun çərçivəsində həyata keçirilib. Həmçinin filiallarda yaradılmış sənəd qəbulu komissiyaları da öz işlərinin öhdəsindən layiqincə gəliblər.

ADPU və onun filiallarına 2016/2017-ci tədris ilində tələbə qəbulunun nəticələri isə bu ali təhsil müəssisəsinin inkişaf istiqamətlərinin müəyyənləşdirilməsi baxımından maraqlıdır. Belə ki, 2016/2017-ci tədris ilində ADPU-nun Azərbaycan bölməsinə 2090, rus bölməsinə 230 tələbənin qəbulu planlaşdırılmışdı. Digər ali təhsil müəssisələri ilə müqayisədə ADPU-ya dövlət sifarişli yerlərin çoxluğu müəllim peşəsinə qəbul olunanlara dövlət tərəfindən rəğbətləndirmənin tətbiqinin nəticəsidir.

Bu il “Fizika müəllimliyi”, “İnformatika müəllimliyi”, “Coğrafiya müəllimliyi”, “Korreksiyaedici təlim”, “Məktəbəqədər təlim və tərbiyə”, “Təhsildə sosial-psixoloji xidmət”, “Kimya və biologiya müəllimliyi”, “Təsviri incəsənət müəllimliyi”, “Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi” (qızlar üçün fiziki tərbiyə) ixtisasları üzrə ilk dəfə rus bölməsinə tələbə qəbulu aparılmışdır.

Qeyd olunmalıdır ki, əvvəlki illərdə rus bölməsinə yalnız “Tarix müəllimliyi”, “Riyaziyyat müəllimliyi”, “İbtidai sinif müəllimliyi” və “Biologiya müəllimliyi” ixtisasları üzrə tələbə qəbulu aparılırdı. Bu il isə rus bölməsinə 14 ixtisas üzrə tələbə qəbulu aparılıb və 140 tələbə qəbul olunub. Bu da əvvəlki illərlə müqayisədə müsbət göstəricidir.

Cari ildə 500 və 500-dən yuxarı bal toplayıb müəllimlik ixtisasını seçənlərin sayı 117 nəfərdir.

Universitetə yeni tədris ilində qəbul olunmuş və qeydiyyatdan keçmiş tələbə-gənclərlə aparılan sosioloji sorğunun nəticələri göstərir ki, bu gənclər düşünülmüş şəkildə, ürəklərinin hökmü ilə və böyük həvəslə müqəddəs, şərəfli, eyni zamanda, məsuliyyətli peşə olan müəllimliyi seçiblər. Belə ki, sorğuda iştirak edən tələbələrin 70-80%-i müəllim peşəsini sevdiklərini bildirir və ADPU-da keyfiyyətli ali təhsil alacaqlarına inanırlar. Sorğuda iştirak edən həmin tələbələrin fikirlərinə görə, strateji hesab

olunan pedaqoji sahədə fəaliyyət göstərmənin təməli, onların mükəmməl təhsil alacaqları ali təhsil müəssisəsi ilə daha çox bağlıdır. Bu ali təhsil müəssisəsi isə ADPU-dur.

Ayrı-ayrı ixtisaslara 2015/2016-cı tədris ilində qəbulun nəticələrinin müqayisəsində də maraq doğuran məqamlar var. Belə ki, ötən tədris ilində "Fizika müəllimliyi" ixtisasına maksimum qəbul balı 372, bu il isə 509 bal olmuşdur.

Ötən tədris ili ilə müqayisədə bu il "Tarix və coğrafiya müəllimliyi" ixtisasına yüksək balla daxil olanların sayı xeyli artmış, maksimum bal həddi 504-dən 603 bala yüksəlmişdir. Bu ixtisas üzrə keçən il cəmi 3 nəfər 500 bal topladığı halda, bu il onların sayı 13 nəfər olmuşdur.

"Korreksiyaedici təlim" ixtisasına keçən il maksimum keçid balı 499 olduğu halda, cari ildə bu rəqəm 558 bala yüksəlmişdir.

Cari tədris ilində yüksək bal toplayaraq ADPU-ya dövlət sifarişi əsasında qəbul olunmuş tələbələr ümumilikdə universitetə qəbul olunmuş tələbələrin təxminən 80%-ni təşkil edir. Azərbaycan Respublikasının Dövlət İmtahan Mərkəzinin verdiyi məlumata görə, yeni tədris ilində ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində qəbulolunma faizi 97,18-dir. Magistratura səviyyəsində qəbulolunma faizi isə 92,42-dir. Bu göstəricilərə görə ADPU universitetlər arasında III yeri tutub. Bu il həm ali təhsilin bakalavriat səviyyəsində, həm də magistratura səviyyəsində göstəricilər əvvəlki illərlə müqayisədə uğurlu hesab edilməlidir.

ADPU-da əsaslı və cari təmir işləri həyata keçirilir. Bu da öz növbəsində təhsiltədris və əmək şəraitinin yaxşılaşması, eləcə də universitetin yeni imicinin formalaşması üçün mühüm əhəmiyyət kəsb edir. Bütövlükdə fəaliyyətimizdə Təhsil Nazirliyinin xüsusi qayğı və diqqətini hiss edirik.

Bir məqamı da vurğulamaq istəyirəm ki, bu il ADPU-ya qəbul olunmuş I kurs tələbələrinin kollokvium və semestr imtahanları yazılı qaydada aparılacaqdır. Kollokvium və imtahanların yazılı formada keçirilməsində məqsəd tədrisin keyfiyyətini yaxşılaşdırmaq, şəffaflığı və obyektivliyi təmin etmək, eyni zamanda tələbə-gənclərin elmi dünyagörüşünün, məntiqi təfəkkürünün, yaradıcı təxəyyülünün inkişaf etdirilməsinə, həmçinin onların yazı mədəniyyətinin və bütövlükdə ümumi mədəni səviyyələrinin yüksəlməsinə kömək etməkdir.

Sonda isə qeyd etmək istərdim ki, həyatımızın sürətlə dəyişməsi, inkişaf etməsi qarşımıza yeni tələblər və çağırışlar qoyur. Biz qarşımızda dayanan bütün vəzifələrin uğurlu həllinə məsuliyyət hissimizi dərindən dərk etməklə bərabər, möhkəm nizam-intizam, o cümlədən yüksək peşəkarlığımız sayəsində nail ola bilərik. Yüksək səviyyəli pedaqoji kadrların hazırlanması, cəmiyyətdə müəllim peşəsinin nüfuzunun yüksəldilməsi, onların bilik və bacarıqlarının, peşəkarlıq səviyyələrinin yaxşılaşdırılması və bütövlükdə ölkəmizdə insan kapitalının formalaşması üçün əzmlə çalışmalıyıq.Yalnız bu halda strateji hədəflərimizə, ali məqsədlərimizə çata bilərik.

Bir filosofun dediyi kimi, müəllimlik insanları mənəviyyatlı etmək sənətidir. Bu məsuliyyətli, şərəfli və müqəddəs fəaliyyətimizdə kollektivimizə uğurlar arzulayıram.

# FİZİKİ İDRAKDA İDEALLAŞDIRMA VƏ İDEAL OBYEKT



**Əziz Məmmədov,**
***Bakı Dövlət Universitetinin professoru,***
***fəlsəfə elmləri doktoru***
**Siyavuş Talışlı,**
***Bakı Avrasiya Universitetinin professoru,***
***fəlsəfə elmləri doktoru***



Məqalədə elmin mürəkkəb problemlərindən olan ideallaşdırma metodunun və ideal obyekt anlayışının mahiyyəti, fəlsəfi obrazı və onun fiziki idrakında oynadığı rol açıqlanmışdır. Burada müasir elmin inkişafında, gerçəklik hadisələrinin dərk edilməsində ideallaşdırma metodunun mühüm evristik və metodoloji əhəmiyyəti göstərilmişdir.

***Açar sözlər:*** *ideal obyekt, ideallaşdırma, abstrakt təfəkkür, metod, fiziki idrak.*

***Ключевые слова:*** *идеальный объект, идеализация, абстрактное мышление, методы, физическое познание.*

***Key words:*** *ideal object, idealized, abstract thinking, techniques, physical knowledge.*

Gerçəkliyi müəyyən qanunlar və kateqoriyalar formasında əks etdirməklə onun adekvat inikasını verən elmi biliklər sistemində ideal obyektlərin yaradılması üçün istifadə olunan ideallaşdırma metodu xüsusi yer tutur. Professor D.Qorskinin fikrincə, abstraktlaşdırma əməliyyatı ilə üzvi surətdə bağlı olan ideallaşdırma elmi-nəzəri tədqiqatın səmərəli üsullarından və əsas növlərindən biridir. İdeallaşdırma eyni zamanda xüsusi fikri proses olub, professor A.Subbotinin təbrinə görə, elmi-tədqiqat baxımından nəzəri quraşdırmalarda tədqiqatçını indiki halda maraqlandırmayan cəhətlərdən, mühüm olmayan xassə və münasibətlərdən sərf-nəzər etməyə imkan verən xüsusi növ sadələşdirmədir [1].

Maddi aləmin sirlərini öyrənmək, varlığın daha dərin və hərtərəfli dərkinə nail olmaq, gerçəkliyin zahiri və təsadüfi tərəfləri arxasındakı mahiyyətə daha dərindən nüfuz etmək imkanı verən ideallaşdırma abstraktlaşdırma prosesinin yüksək inkişaf mərhələsi olub, hissi idrakın və hətta abstraksiyaetmə prosesinin özünün də nail ola bilmədiyi bir sıra nəticələri əldə etməyə imkan verir. İdeallaşdırma prosesində varlıq "sadələşdirilir", "kasıblaşdırılır", belə ki, baxılan halda predmetə xas olan az əhəmiyyətli və ya əhəmiyyətsiz görünən parametrlər və əlamətlər ondan uzaqlaşdırılaraq nəzərə alınmır. Bu mənada ideallaşdırma abstraktlaşdırmanın növlərindən biri olsa da, bütövlükdə o abstraktlaşdırmaya müncər edilə bilməz. İdeallaşdırma gerçəkliyin abstraktlaşdırmadan sonra baş verən sadələşdirilməsi, kasıblaşdırılması, sxemləşdirilməsidir. Bu proses fikri elementlərin, ideallaşdırılmış nəzəri obyektlərin yaradılması ilə bağlıdır [2]. Elmi idrak məqsədilə gerçəklikdə mövcud olmayan, ümumiyyətlə, əməli həyata keçirilə bilməyən "ideal"

obyektlərdən geniş istifadə olunur. İdeallaşdırılmış obyektlərə "mütləq bərk cisim", "ideal qaz", "nöqtəvi yük", "maddi nöqtə", "nöqtəvi işıq mənbəyi", "sıxılmayan maye", "ideal məhlul" kimi fiziki, habelə, nöqtə, düz xətt, müstəvi, bərabərtərəfli üçbucaq və s. riyazi anlayışları misal göstərmək olar.

Fizika və riyaziyyatda geniş istifadə olunan ideallaşdırma prosesinin mexanizmi necədir və ümumiyyətlə, bu proses hansı üsullarla həyata keçirilir?

Hər şeydən əvvəl, qeyd edək ki, ideal obyektlərin quraşdırılması prosesi hökmən şüurun abstraktlaşdırma fəaliyyətini tələb edir. "Mütləq bərk cisim" anlayışının formalaşması timsalında yuxarıda qoyduğumuz sualı araşdırmağa çalışaq.

Məlum olduğu kimi, kənar qüvvələrin təsiri ilə bütün cisimlər özlərinin ölçü və formalarını dəyişərək deformasiya olunurlar. Lakin "mütləq bərk cisim" dedikdə, kənar qüvvələrin təsiri altında deformasiyaya uğramayan, yəni ixtiyari şəraitdə özünün formasını və ölçülərini saxlayan cisim nəzərdə tutulur. Əslində, təbiətdə belə cisim yoxdur. Real fiziki cisimlərin heç biri mütləq bərklik xassəsinə malik deyildir. Hətta məlum cisimlər içərisində ən bərki sayılan almaz belə ekstremal şəraitlərdə – çox yüksək təzyiqlərdə və temperaturlarda bərk olmaya bilər. Deməli, "mütləq bərk cisim" anlayışı adi anlayışların yaradılması üçün səciyyəvi olan nəzəri ümumiləşdirmələr yolu deyil, cismin baxılan xassəsinin inkişafında hüdud hala keçid, yəni ideallaşdırma yolu ilə yaradıla bilər. Baxılan misalda belə hüdud hala yaxınlaşmanı həyata keçirmək üçün müxtəlif bərkliyə malik mum, qrafit, almaz maddələrini müqayisə edək. Həmin maddələr kənar təsir nəticəsində özlərinin həndəsi formalarını müxtəlif dərəcədə saxlamaq xassəsinə malikdir. Bu maddələrdən mumun bərkliyi ən az, almazın bərkliyi isə ən çoxdur. İndi isə biz elə bir cisim təsəvvür edək ki, o, heç bir şəraitdə öz formasını dəyişməmiş olsun. Belə cisim mütləq bərk cisim olacaqdır. Bu cismi təsəvvür etmək üçün biz hökmən cismin bərklik xassəsinin inkişafında hüdud hala keçməyə imkan verən məntiqi əməliyyatdan – ideallaşdırmadan istifadə etməliyik.

Yuxarıda gətirdiyimiz misaldan göründüyü kimi, ideal obyektlərin fikrən quraşdırılması prosesi hökmən şüurun abstraktlaşdırma fəaliyyətini tələb edir. Məsələn, "mütləq bərk cisim" ideal obyektini yaratmaqla biz real cisimlərin kənar qüvvələrin təsiri altında deformasiya etmə qabiliyyətindən abstraksiya etmiş oluruq. "Mütləq qara cisim", yəni üzərinə düşən işıq enerjisini bütünlüklə udan cisim dedikdə isə biz belə bir faktdan abstraksiya etmiş oluruq ki, bütün real cisimlər üzərinə düşən işıq şüasını az və ya çox dərəcədə əks etdirmək qabiliyyətinə malikdir.

İdeallaşdırma zamanı fiziki obyektlərə təbiətdə mövcud olmayan və praktiki reallaşa bilməyən xassələr isnad verilir. Məsələn, fizikada "ideal qaz" təsəvvürlərindən geniş istifadə olunur. "İdeal qaz" elə qazdır ki, onun mütləq elastiki fərz olunan molekullarının qarşılıqlı təsirlərindən və real ölçülərindən sərf-nəzər edilmişdir. Bu halda elə seyrəkləşdirilmiş qaz nəzərdə tutulur ki, onun molekullarının qarşılıqlı təsiri çox-çox zəif olduğundan qazın potensial enerjisindən sərf-nəzər etmək mümkün olur. Həqiqətdə təbiətdə ideal qaz yoxdur, lakin buna baxmayaraq molekulyar-kinetik nəzəriyyənin əsas qanunları (Avaqadro qanunu, Boyl-Mariott qanunu, Gey-Lüssaq qanunu, Şarl qanunu, Mendeleyev – Klapeyron tənliyi) məhz bu anlayış əsasında öyrənilir.

Bu qanunlar yalnız ideal qazlar üçün ödənilsə də, müəyyən yaxınlaşmada onlar kifayət qədər seyrək olan, hissəciklərin tutduğu həcmin qazın ümumi həcmi ilə

müqayisədə çox-çox kiçik olduğu və buna görə də hissəciklərin həcminin və qarşılıqlı təsirlərinin potensial enerjisinin nəzərə alınmamasının mümkün olduğu real qazları da səciyyələndirə bilər. Lakin göstərilən şərait olmadıqda ideallaşdırma əsasında alınan qanunlar gerçəkliyə ancaq müəyyən düzəlişlərlə tətbiq oluna bilirlər. Klapeyron tənliyinə belə bir düzəlişi 1873-cü ildə real qazların qanunauyğunluqlarını öyrənən Van der Vaals vermişdir. Qeyd edək ki, yalnız ideal qaz haqqında deyil, digər ideal obyektlər haqqında da irəli sürülmüş təsəvvürlər çox mühüm elm qanunlarını formulə etməyə imkan verir.

Yuxarıda gətirilən misallardan aydın görürük ki, hər bir ixtiyari halda ideallaşdırma prosesi özündə abstraksiya momentini ehtiva edir ki, bu da professor D.Qorskinin fikrincə, “idealizə olunmuş obyektlərin yaradılması ilə bağlı olan ideallaşdırma prosesinə insanın abstraksiya fəaliyyətinin xüsusi növü kimi baxmağa əsas verir” [3].

Lakin ideal obyektlərin formalaşması prosesində abstraklaşdırma ilə yanaşı digər fikri əməliyyatlar da iştirak edir. İdeallaşdırma real obyektin “fikrən parçalanaraq analiz edilməsini, sonra isə sintez prosesində yenidən bir tam kimi bərpa olunmasını tələb edir” [4]. Deməli, ideallaşdırma prosesi analiz, sintez və onların əsasında aparılan ümumiləşdirmə və abstraktlaşdırma əməliyyatlarından ayrılmazdır.

İdeallaşdırma prosesi yaradıcı təxəyyülün fəaliyyətinə əsaslanır. İdeallaşdırma nəticəsində predmet anlayışlarda sadəcə güzgüvari əks olunmur, o, fikrən yenidən hasil edilərək, insan zəkasında hissi məlumatlardan təmizlənmiş fikri obyekt halında yenidən quraşdırılır. D.Qorski bu münasibətlə yazır: “Həyata keçirilmiş analiz və sintez nəticəsində predmet, bir tərəfdən, elmin və eksperimental texnikanın halı, digər tərəfdən, həll olunan elmi məsələnin xarakteri ilə şərtlənən bir dəqiqlik və adekvatlıqla özünün mühüm və zəruri əlaqələri ilə yenidən hasil edilir” [5].

Anlayışların təşəkkülü prosesində idrakda analiz və sintezin əlaqələndirilməsi bununla şərtlənir ki, təfəkkürdə əks olunan obyektiv gerçəkliyin anlayış xarakteristikasının dərəcəsindən asılı olmayaraq sintezləşdirmə hər halda gerçəkliyin təhlilinin nəticəsi və onun bir sıra xassələrindən sərf-nəzər edilməsinin məhsuludur. Eyni sözləri ideallaşdırma ilə bağlı olan analitik proseslərə də aid etmək olar: anlayışların təşəkkülünə aparan analiz də, öz növbəsində, dərinlik dərəcəsindən asılı olmayaraq obyektiv reallığın mühüm xassələrinin sintezi ilə bağlıdır.

Analiz və sintez metodları və onların əsasında aparılan ümumiləşdirmə prosesi, ümumiyyətlə, abstraktlaşdırma və ideallaşdırmadan ayrılmazdır. Analiz əsasında baş verən abstraktlaşdırma baxılan obyektin müvəqqəti, keçici xarakterli xassələrindən, əlamətlərindən sərf-nəzər edilməsini, digər tərəfdən, ona zərurətlə xas olan xassələrin seçilib ayrılmasını tələb edir.

Abstraktlaşdırma prosesi bir sıra idrak obyektləri üçün mühüm olan əlamətlərin seçilib ayrılmasını, başqa sözlə, obyektlərin müəyyən zümrəsi üçün ümumi və mühüm olan cəhətlərin fərqləndirilməsini təmin edən ümumiləşdirmə əməliyyatı ilə üzvi surətdə bağlıdır. Anlayışın ümumiləşdirməsi seçmə prosesi olmayıb, həm də əsasını ideallaşdırma təşkil edən çevrilmə prosesidir. Bu isə onunla bağlıdır ki, hər bir anlayışda kobudlaşdırılmış, sxemləşdirilmiş şəkildə, təkcə, müvəqqəti, fərdi cəhətlərdən azad edilmiş predmetlər sinfi əks olunur. Anlayışlarda yol verilən belə kobudlaşdırma, sxemləşdirmə, sadələşdirmə isə real obyektin heç də təhrifi olmayıb, onun daha dərin mahiyyətini aşkara çıxarmağa, gerçəkliyin müəyyən tərəflərinin daha adek-

vat əks etdirilməsinə xidmət edir [4].

İdeallaşdırmanın digər fikri proseslərlə, o cümlədən abstraktlaşdırma və ümumiləşdirmə, analiz və sintezlə əlaqəsi, hər şeydən əvvəl, bununla izah olunur ki, ideal obyektlərin quraşdırılması prosesində biz hökmən aşağıdakı məqsədlərə nail olmalıyıq:

a) real obyektləri onlara məxsus bəzi xassələrdən məhrum etməliyik; b) bu obyektlərə fikrən qeyri-real, praktiki reallaşa bilməyən fərziyyəvi xassələr əlavə etməliyik. Bu məqsədə çatmaq üçün elmdə aşağıdakı üsullardan istifadə edilir:

1. Çoxpilləli abstraksiya üsulu. İdeal obyektlərin formalaşmasının bu üsulu riyaziyyatda xüsusilə geniş tətbiq olunur. Həndəsi “nöqtə” anlayışı həmin üsulla yaradılır. Biz real obyektlərin qalınlığından abstraksiya etməklə “müstəvi” haqqında təsəvvür yaradırıq; daha sonra müstəvini onun xətti ölçülərinin birindən, məsələn, enindən məhrum etməklə “xətt” və nəhayət, xətti onun yeganə ölçüsündən – uzunluğundan məhrum etməklə “nöqtə” alırıq.

2. Cismin hər hansı bir xassəsinin inkişafında hüdud hala keçilməsi. Fizikada geniş tətbiq tapan “mütləq bərk cisim”, “mütləq qara cisim”, “sıxılmayan maye” və s. ideal obyektlər bu üsulla yaradılmışdır. Məsələn, “mütləq qara cisim” anlayışı bu üsulla belə yaradılmışdır: cisimləri öz üzərinə düşən işıq enerjisini udmaq qabiliyyətinin artmasına görə yerləşdirib bu sıranı fikrən uzatmaqla onun sonunda elə bir cisim təsəvvür edək ki, o, üzərinə düşən işıq şüasını tamamilə udmuş olsun. Bu ideal cisim “mütləq qara cisim” olacaqdır.

3. İdeal obyektlərin sadə abstraksiya vasitəsilə, obyektlərin bəzi real xassələrinin atılması yolu ilə yaradılması. Bu ancaq o halda mümkündür ki, cismin real xassələrindən sərf-nəzər edilməsi ona qeyri-real, gerçəklikdə praktika reallaşa bilməyən xassələrin daxil edilməsi ilə eyni vaxtda baş vermiş olsun. Məsələn, ixtiyari mayenin xarici təzyiq altında sıxılma qabiliyyətini atmaq – ona sıxılmamaq xassəsi isnad vermək deməkdir; ixtiyari cismin işığı əks etdirmək xassəsini atmaq, başqa sözlə, ona üzərinə düşən şüa enerjisini bütünlüklə uda bilmək xassəsi isnad vermək deməkdir ki, bu xassəyə də ancaq təbiətdə mövcud olmayan “mütləq qara cisim” malik ola bilər.

Göründüyü kimi, nəzərdən keçirdiyimiz hər üç halda ideal obyektlərin yaradılmasında obyektlərin həm real xassələrindən sərf-nəzər edilməsindən, həm də onlara hipotetik – qeyri-real xassələrin isnad verilməsindən istifadə olunur. İdeallaşdırma prosesi məhz bu iki prosesin dialektik vəhdətindən ibarətdir.

Elmi idrak metodu olmaq etibarilə ideallaşdırmadan yalnız o halda istifadə olunur ki, idrak obyekti kifayət qədər mürəkkəb olur. Hadisənin inkişafının hüdud halında onun hər hansı bir xassəsini seçib ayıran tədqiqatçı onu tədqiq etmək imkanı əldə edir. Məhz nəzəri biliklə səciyyələndiyindən ideallaşdırmada məntiqi təfəkkürün fəaliyyəti daha qabarıq nəzərə çarpır. Cismin hər hansı bir xassəsinin ideallaşdırılması nəticəsində yaradılan anlayış “fantaziyanın bir hissəsinə” malik olduğu üçün cismin real xassəsinə tam uyğun gəlmir. Lakin bununla belə elmi idrakda ideallaşdırma zəruridir. “İdeallaşdırılmış müddəaların ən etibarlı meyarı isə cismin ayrı-ayrı xassələrinin ideallaşdırılması yolu ilə alınmış idraki nəticələrin eksperimentdə və praktikada bilavasitə təsdiq olunmasıdır” [6].

Nəzəri idrakın universal metodu olmaq etibarilə ideallaşdırmanın mühüm

əhəmiyyəti hər şeydən əvvəl bundadır ki, bu üsulla yaradılan xəyali, ideal obyektlər real cisim və prosesləri öyrənmək üçün mühüm bir vasitədir. Elm qanunlarının kəşf olunmasında ideallaşdırma metodunun əhəmiyyətini daha qabarıq nümayiş etdirmək üçün Q.Qalileyə ətalət qanunu kəşf etməyə imkan vermiş mülahizələri nəzərdən keçirək.

Tutaq ki, kiçik arabacığı yol boyunca itələyirik. Aldığı təkandan bir qədər irəlilədikdən sonra arabacıq nəhayət dayanacaqdır. Arabacığın sərbəst getdiyi yolun uzunluğunu artırmağın müxtəlif üsulları vardır. Məsələn, təkərlərin yağlanması, yolun hamarlanması və s. Bu tədbirlər arabacığın hərəkətini tormozlandıran xarici təsirləri qismən də olsa azaltmaqla onun getdiyi yolun uzunluğunu artıracaqdır. Ümumiyyətlə, arabacığa olan xarici təsirləri azaltmaq məqsədilə görülən bütün tədbirlər onun keçdiyi yolun uzunluğunun artmasına səbəb olacaqdır. Lakin bu zaman arabacığa kənar təsirləri büsbütün aradan qaldırmaq mümkün olmayacaqdır. Hərəkət edən cismə olan kənar təsirlərlə onun getdiyi yol arasındakı zəruri əlaqəyə əsasən belə nəticəyə gələ bilərik ki, cismə olan kənar təsirlər büsbütün aradan qaldırılarsa, o, ya nisbi sükunət, ya da arasıkəsilməz bərabərsürətli və düzxətli hərəkət halında olar. Qaliley məhz bu mülahizələr əsasında ətalət qanununu kəşf etmiş, fizikaya ətalət kimi ideal bir obyekti daxil etmişdir. Bilavasitə maddi eksperiment vasitəsilə əldə edilməsi mümkün olmayan bu nəticə Qalileyin quraşdırdığı fikri eksperiment vasitəsilə çıxarılmışdı. Sonralar İ.Nyuton bu müddəanı mexanikanın əsas qanunları (Nyutonun I qanunu) sırasına daxil etdirmişdir.

A.Eynşteyn və L.İnfeld “Fizikanın təkamülü” kitabında bu münasibətlə qeyd edirlər ki, ətalət qanununu bilavasitə eksperimentdə kəşf etmək mümkün olmazdı. Ətalət qanununu yalnız müşahidə ilə bağlı təfəkkür vasitəsilə, yəni Qalileyin istifadə etdiyi ideallaşdırmaların köməyi ilə kəşf etmək mümkün olmuşdur.

İdeallaşdırma metodunun idraki imkanlarını nümayiş etdirmək üçün yuxarıda gətirdiyimiz misal elmi baxımdan çox maraqlıdır. Əvvəla, bu misal əyani surətdə göstərir ki, elmdə düzgün nəticələr əldə etmək üçün təkcə adi təcrübəyə istinad etmək kifayət deyildir. Elmi biliklər adi təcrübə ilə yanaşı, həm də digər metodlar əsasında qazanılır və bu metodlar müşahidə olunan faktları daha düzgün izah edir; halbuki bu izahat adi təcrübəyə bəzən zidd də ola bilər. A.Eynşteyn və L.İnfeld bu münasibətlə yazırlar: “Qalileyin elmə gətirdiyi ən böyük töhfə intuitiv (adi təcrübəyə əsaslanan – Ə.M., V.İ.) baxışları dağıtması və onları yenisi ilə əvəz etməsi olmuşdur” [7].

İkincisi, ideal obyektlərdən istifadə etmədən Qaliley özünün fikri eksperimentini ümumiyyətlə həyata keçirə bilməzdi. Belə ki, Qalileyin mühakimələrində mühüm rol oynamış düzxətli və bərabərsürətli hərəkəti gerçəklikdə heç cür reallaşdırmaq mümkün deyil: xarici qüvvələrin təsirindən büsbütün sərf-nəzər etmək mümkün olmadığından yol boyunca itələnən arabacıq da heç bir halda bərabərsürətli və düzxətli hərəkət edə bilməz. İdeallaşdırma metodunun elmi əhəmiyyəti buradan bir daha aydın olur.

Üçüncüsü, elm qanunlarının kəşf və formulə edilməsində ideallaşdırmadan hökmən istifadə olunmalıdır. Hər bir ideallaşdırma gerçəkliyin sadələşdirilməsi, kobudlaşdırılması olduğundan ideallaşdırma vasitəsilə kəşf olunan qanunlar da obyektiv gerçəklik qanunlarının ideal modelləridir. Buna görə də həmin qanunları real proseslərə tətbiq etmək üçün onlara hökmən müəyyən düzəlişlər verilməlidir. Bu isə elmdə qəribə bir vəziyyət yaradır: məlum

olur ki, eksperiment və müşahidələrin ölçü texnikasının inkişaf səviyyəsi ilə şərtlənən qeyri-dəqiqlik bir çox hallarda qanunların kəşfinə nəinki əngəl törətmir, əksinə, onların açılmasına səbəb olur. Fikrimizcə, məşhur alman fiziki Zommerfeld özünün belə bir qeydi ilə tamamilə haqlı olmuşdur ki, "əgər Keplerin sərəncamında planetlərin hərəkəti haqqında Tixo de Bragenin əldə etdiyi təxmini məlumatlardan daha dəqiq məlumatlar olsaydı, bəlkə də o, Günəş sistemi planetlərinin hərəkət qanunlarını formulə edə bilməzdi".

Eyni sözləri Qalileyin kəşf etdiyi sərbəst düşmə qanunu haqqında da demək olar. Sərbəst düşən cismin yerdəyişməsinin zaman kvadratından asılılığını əks etdirən bu qanunu Qaliley kobud ölçmələr əsasında kəşf etmiş və bu zaman belə bir mülahizəyə əsaslanmışdı ki, əgər sərbəst düşən cismə havanın müqaviməti tamamilə aradan qaldırılarsa, o, hökmən sabit təcillə düşməlidir. Hava nasosunun ixtirası bu mülahizənin doğruluğunu təsdiq etdi. Sonrakı yoxlamalar isə sərbəst düşmə təcilinin Yerin coğrafi en dairəsindən, sıxlığından və Yer səthindən olan hündürlükdən asılılığını nümayiş etdirdi. Bu açıqlamalarla əlaqədar sərbəstdüşmə təcilinin riyazi ifadəsinə müvafiq düzəlişlər də verildi. Bütün bunları isə Nyutonun ümumdünya cazibə qanunu əsasında etmək mümkün oldu.

İdeallaşdırma metodu cismin yalnız ayrı-ayrı xassələrinin ideallaşdırılması və bu zəmində xüsusi anlayışların yaradılması ilə tükənməyib, həm də qanunların kəşf və formulə edilməsini əhatə edir. Qanunların kəşfində ideallaşdırma metodunun evristik rolunu elektromaqnit sahəsinin strukturunu ifadə edən Maksvell tənliklərinin timsalında aydın görmək olar. İngilis alimi M.Faradey dəqiq və həssas təcrübələrlə müəyyən etmişdir ki, qapalı konturu kəsən maqnit selinin bütün dəyişmələrində bu konturda induksiya cərəyanı yaranır. Konturda maqnit qüvvə xətlərinin dəyişməsinə müxtəlif yollarla, məsələn, maqnit sahəsinin dəyişilməsi, dolaqların deformasiyası, çərçivənin hərəkəti və s. ilə nail olmaq mümkündür. Maddi eksperimentdə bu variantların hamısını nəzərə almaq mümkün olmadığından maddi eksperimenti fikri eksperimentlə tamamlamaq lazım gəlmişdir. Gətirdiyimiz bu misaldan isə fikri eksperiment çərçivənin formasından, onun uzunluğundan və səthinin sahəsindən sərf-nəzər edilməsindən, cərəyanın ətrafındakı maqnit qüvvə bir nöqtəyə cəmləşdirilməsi əməliyyatından ibarətdir. Bu əməliyyatlar nəticəsində fəzanın ixtiyari nöqtəsində və zamanın istənilən anında elektrik və maqnit sahələrinin dəyişilmələrini əks etdirən qanunauyğunluqlar yaranır. Gətirdiyimiz misal bir daha göstərir ki, qneseoloji üsul olmaq etibarilə ideallaşdırmada obyektin yalnız ayrı-ayrı xassələr deyil, həm də mahiyyət münasibətləri ideallaşdırılır ki, bu da ideallaşdırmanın xüsusi növü olub, onun ən yüksək mərhələsini təşkil edir. Riyazi düsturlarla ifadə olunan qanunlarda ideallaşdırmanın tərtibi daha yüksək olur. Qanun riyazi formada ifadə olunmadıqda isə bu məsələ daha mürəkkəb səciyyə daşıyır. Ümumiyyətlə, hər iki halda: qanun həm riyazi formada ifadə edildikdə, həm də edilmədikdə o müəyyən ideallaşdırma dərəcəsinə malik olur. Həm də elmlərin inkişafı ilə əlaqədar olaraq qanunların ideallaşma dərəcəsi get-gedə azalır. Elmin obyektiv inkişafına xas olan bu meyli klassik və kvant mexanikalarının müqayisəsində daha aydın görmək olar. Kvant mexanikası qanunları ilə

müqayisədə klassik mexanika qanunları gerçəkliyin daha yüksək dərəcədə ideallaşdırılmış surətləridir. Buna səbəb odur ki, klassik mexanikaya nisbətən kvant mexanikası gerçəkliyə daha dəqiq yanaşmadır. Kvant mexanikası artıq sübut etmişdir ki, onun hətta bir o qədər də "dəqiq olmayan qanunları da öz dəqiqliyinə görə klassik mexanika qanunlarından daha qüsursuzdurlar" [8]. Bu göstərir ki, nəzəri idrakın materiya strukturunun dərinliklərinə nüfuz etməsi ilə əlaqədar gerçəkliyin adekvat inikası dəqiqləşdikcə ideallaşdırılmış obyektlərin özləri də dəqiqləşib dürüstləşirlər. Klassik fizikanın fundamental ideallaşdırmalarından olan "mütləq məkan" və "mütləq zaman" anlayışlarının aqibəti məhz belə olmuşdur.

Nyutona görə məkan və zaman mütləq olub, materiyada, maddi dünyada baş verən mexaniki proseslərdən asılı deyil. Hətta F.Engels məkan və zamanın hərəkət edən materiyanın obyektiv varlıq formaları olduğunu sübut edəndən sonra da klassik fizikada məkan və zaman kateqoriyaları mahiyyət etibarilə İ.Kantın aprior kateqoriyaları olaraq qalmaqda idi.

A.Eynşteynin xüsusi nisbilik nəzəriyyəsinin irəli sürdüyü dörd ölçülü "məkan-zaman kontiniumu" anlayışı aləmin fiziki mənzərəsinə yeni baxışların başlanğıcını qoymaqla sübut etdi ki, məkan və zaman hərəkət edən materiyanın obyektiv varlıq formaları olub, materiyadan ayrılıqda və ondan asılı olmadan mövcud deyildir [9]. Bu ideyanın inkişaf etdirilməsi əsasında Eynşteyn sonralar qravitasiyanın ümumi nəzəriyyəsini yaradaraq sübut etdi ki, qravitasiya sahəsi kontiniumun metrikasını dəyişmək yolu ilə özü də ona daxil olur. A.Eynşteyn və L.İnfeld "Fizikanın təkamülü" kitabında fiziki idrakda mühüm nəzəri ideyaların təkamülünü nəzərdən keçirərkən "sahə" anlayışının yaradılmasını "müasir fizikanın mühüm nailiyyəti" adlandıraraq yazırdılar: "Fizikada Nyuton dövründən bəri ən böyük nailiyyət hesab edilə biləcək bir anlayış yaradıldı: "Sahə". Fiziki hadisələrin təsvirində yük və hissəciklərin deyil, məhz məkanda yüklər və hissəciklər arasındakı sahənin əhəmiyyətli rol oynadığını izah etmək üçün adamdan böyük elmi təfəkkür tələb olunurdu" [7]. "Sahə" anlayışı timsalında gətirdiyimiz bu misal bir daha göstərir ki, ideallaşdırma yolu ilə yaradılan anlayışlar elmdə mühüm rol oynayaraq səmərəli tədqiqata imkan verən elmi nəzəriyyələrin qurulmasına xidmət edirlər. Bununla belə qeyd etmək lazımdır ki, heç də hər cür ideallaşdırma praktiki zərurət deyildir, professor A.Subbotinin sözləri ilə desək, "ideallaşdırma yalnız o zaman məqsədəuyğundur ki, tədqiq olunan real obyektlər mövcud nəzəri vasitələr üçün, xüsusilə riyazi analiz üçün həddən ziyadə mürəkkəb olsun, ideallaşdırılmış hala nəzərən bu vasitələri tətbiq edərək müəyyən şəraitdə və müəyyən məqsədlərlə bu real obyektlərin xassələrini və hərəkətini səmərəli təsvir etmək üçün nəzəriyyəni qurmaq və onu inkişaf etdirmək mümkün olsun. Bu sonuncu isə öz mahiyyəti etibarilə ideallaşdırmanın məhsuldarlığını təmin edib onu səmərəsiz fantaziyadan fərqləndirir" [10].

İdeallaşdırma əsasında hadisə və prosesləri ona görə tədqiq etmək mümkün olur ki, ideallaşdırma tədqiqat obyektini sadələşdirərək onun bir sıra xassə və münasibətlərindən sərf-nəzər etməyə və gerçəkliyin müəyyən sahəsində təzahür edən qanunauyğunluqları izah edə biləcək nəzəriyyənin qurulmasına imkan verir. Əks halda, yəni bu xassə və münasibətlər nəzərə alındıqda isə müvafiq nəzəriyyənin qurulması həmişə müəyyən çətinliklərlə rastlaşır.

Lakin unutmaq olmaz ki, hər cür ideallaşdırma da birtərəfli və nisbidir. İdeallaşdırma əsasında qurulan nəzəriyyələr öyrənilən obyektin bütün xassələrini deyil, onlardan yalnız bəzilərini izah edə bilir. Buna görə də nəzəriyyənin qurulması üçün ideallaşdırmanın düzgün aparılmasının mühüm əhəmiyyəti vardır. Məsələn, kvant mexanikasında elementar hissəciklərin strukturundan sərf-nəzər edib, onlara riyazi nöqtələr kimi baxmaq mümkün olduğu halda, elementar hissəciklər nəzəriyyəsində bu səpgidən olan ideallaşdırma evristik əhəmiyyət qazanmır.

İdeallaşdırma haqqında yuxarıda deyilənləri yekunlaşdırıb belə nəticəyə gələ bilərik ki, müasir elmin inkişafında, gerçəklik hadisələrinin dərk edilməsində bu metodun mühüm evristik və metodoloji əhəmiyyəti vardır. Bu metod əsasında yaradılan ideal obyektlər mürəkkəb proseslərə ilkin yanaşma olub, sonuncuların obyektiv qanunauyğunluqlarının təxmini də olsa əks etdirilməsi yolunda atılmış çox səmərəli bir addımdır.

***Rəyçi: prof. F.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Горский Д. О природе идеализации и его значение в научном познании // Вопросы философии, 1963, № 2.
2. Мамедова С. Роль метода идеализации в научном познании. Баку: Азернешр, 1985.
3. Горский Д. Вопросы абстракции и образование понятии. М., 1961.
4. Байкова Р. Идеализация в научном познании / Диалектика и методология научного познания. УФА, 1976.
5. Горский Д. Проблемы общей методологии наук и диалектической логики. М.: Мысль, 1966.
6. Голованов В. Гносеологическая природа законов науки. М.: Мысль, 1967.
7. Эйнштейн А., Инфельд Л. Эволюция физики. Москва: Наука, 1965.
8. Дынин Д. Неизбежность странного мира. Молодая гвардия. М., 1961.
9. Nəsirov V., Məmmədov Ə. Müasir elm və məkan-zaman problemi. Bakı: Azərnəşr, 1980.
10. Субботин А. Идеализация как средство научного познания. /Логика научного познания. Москва: Наука, 1964.

**А.Мамедов,**
**С.Талышлы**

**Идеализация и идеальный объект в физическом познании**

**Резюме**

В статье раскрывается сущность метода идеализации и понятия идеального объекта, их философской образ и роль в физическом познании которой является сложнейшей проблемой науки. В процессе развития современной науки, а так же в области познания реальности показаны важные эвристические и методологические значение метода идеализаци.

**A.Mammadov,**
**S.Talishli**

**The idealization and ideal object in the physical knowledge**

**Summary**

The article is the idealization of the method of complex problems in science and ideal notion of an object, the image of philosophical knowledge of his physical role and explained. The development of modern science, reality heuristic and methodological significance of the events are important to understand the method of idealization.



# TƏHSİLDƏ SİNERGETİK YANAŞMA

**Mirzəli Murquzov,**
***fizika-riyaziyyat elmləri doktoru, professor,***
***əməkdar müəllim***

Məqalədə XX əsrin sonu, XXI əsrin əvvəllərində dünyanın elmi mənzərəsindən, sinergetika elminin inkişafından və onun təhsil sisteminə təsirindən danışılır. Sinergetika elminin təhsil sisteminə təsirinə dair tanınmış alimlərin fikirlərinə istinad edilir.

***Açar sözlər:*** *sinergetika, təhsil sistemi, klassik elm, yeni inkişaf konsepsiyası, intensiv inkişaf, sistemli yanaşma.*

***Ключевые слова:*** *синергетика, система образования, классическая наука, новая концепция развития, интенсивное развитие, системный подход.*

***Key words:*** *synergetics, education system, the classical science, a new development concept, intensive development, systematic approach.*

XX əsrin sonu, XXI əsrin əvvəllərindən başlayaraq dünya təhsil sistemində islahatların aparılmasının əsas səbəbi XX əsrin ikinci yarısından etibarən dünya elmində ciddi böhranların başlanması və daha da dərinləşməsi olmuşdur.

Heç şübhəsiz ki, ölkəmizdə təhsil quruculuğu sahəsində aparılan ardıcıl, dərin məntiqə söykənən məqsədyönlü işlər inkişafda olan qlobal dünyamızın tələblərini ödəməyə ümidlərimizi daha da artırır.

Bəşəriyyət tarixində insanlar həmişə, bir qayda olaraq, işlərini sürətlə görməyə, sürətlə hərəkət etməyə, sürətlə ümumiləşmə aparmağa və s. meyilli olmuşlar. Məsələn, insanlar özlərinin hərəkət sürətlərini artırmaq üçün müxtəlif vasitələr düşünüb tapmış, piyada, maşın, gəmi, təyyarə və kosmik uçuş vasitələrinə keçməklə bu sahədə çox böyük nailiyyətlərə imza ataraq planetlərarası və ulduzlararası fəzanı fəth etmişlər. Lakin heç insanların ağıllarına da gəlməyib ki, yaşadıqları aləmin özü də daim öz hərəkət sürətini artırmaq kimi təbii keyfiyyətlərə malikdir. Məsələn, bizim kainatı təşkil edən qalaktikalar daim genişlənir və genişləndikcə də öz hərəkət sürətlərini artırır.

Kainatı təşkil edən bütün sistemlər zaman keçdikcə təkamül yolu ilə özünütəşkil, özünümürəkkəbləşmə, özünümükəmməlləşmə və bütövləşdirmə yolu ilə inkişaf edir və inkişaf sürətini daha da artırmaqda davam edir. Bütün bunlar müasir təkamül sinergetik paradiqmaların nailiyyətləri kimi üzə çıxarılmışdır.

Dünyamız qlobal olduğu kimi, onun təhsil sistemləri, o cümlədən müasir dərketmənin problemləri də təhsilə qlobal problem kimi yanaşmağı tələb edir. Dünya təhsili problemlərlə üz-üzədir. Dünya şöhrətli təbiətşünas alim Vernadski hələ keçən əsrin əvvəllərində yazırdı: “Elm özü təbiəti öyrənmək üçün vasitədir”.

Görkəmli nəzəriyyəçi fizik E.Şredinger göstərirdi ki, “bütün təbiət

elmləri ümumi insan mədəniyyəti ilə əlaqədardır".

İllər ötdükcə insan yaradıcılığının bütün sahələri real biliklərlə zənginləşir, elmlər bir-birinə yaxınlaşır və daha çox elmi olur. Hələ XIX əsrdə görkəmli sənətşünas O.Flober elmlə incəsənətin vəhdəti haqqında yazmışdır: "Getdikcə incəsənət daha çox elmi olur, elm isə daha çox bədiiləşir, vaxt gələcək ki, onlar zirvədə görüşərək əsaslı şəkildə bərqərar olacaqdır". Bəli, həmin zaman artıq yetişmişdir. Artıq təbii-elmi və sosial-humanitar elmlərin biri-birinə yaxınlaşması və inteqrasiyası baş tutmuş, Vernadskinin dediyi kimi, elm təkcə təbiəti öyrənmək üçün deyil, bütün təbiəti, insanı və cəmiyyəti vahid tamlıqda öyrənmək üçün "vasitəyə" çevrilmişdir. Daha doğrusu, elm artıq XXI əsr elmi olan təkamül sinergetik paradiqmanın tərkib hissəsinə çevrilmişdir.

Çox vaxt deyirik ki, biz dünya və yaxud Avropa təhsil sisteminə inteqrasiya olunuruq. Hesab edirəm ki, həqiqətdə dünya və Avropa təhsil sistemi də birmənalı olaraq təbiətin özünə inteqrasiya olunur. Biz isə Azərbaycan olaraq, sadəcə dünya və Avropa təhsil sisteminin nailiyyətlərindən və təcrübəsindən bəhrələnirik.

Təbii ki, biz tədrisdə nəyi öyrənməliyik (məzmun), nə üçün öyrənməliyik (məqsəd) və necə öyrənməliyik (üsul) kimi problemlərə də qlobal dünyanın gözü ilə baxmalıyıq. Ona həm də müstəqil respublikamızın problemləri baxımından yanaşırıq, çünki biz təkcə elmə görə deyil, həm də respublikamızın və xalqımızın mövcud olan problemlərinə görə ixtisaslaşırıq.

Dünya elmində yaranmış bir sıra problemlərə nəzər salaq:

1. İddia edilirdi ki, kainat daim mövcud olub və dəyişməzdir. Onun ancaq quruluşu öyrənilirdi, yaranması və inkişafına isə baxılmırdı.

2. Dünyamız yanlış olaraq qapalı (təcrid olunmuş) halda öyrənilirdi. Təbiətlə insan arasında harmoniya yox dərəcəsində idi.

3. Hesab olunurdu ki, elmdə vahid yaxınlaşma (inteqrativlik) mümkün deyildir.

4. Təkcə XX əsrdə dünyada sənaye istehsalı 50 dəfə artmışdı, onun tullantılarından biosfer zəhərlənmiş, ekoloji fəlakət yaranmışdır.

5. Elmə hər cür biliklər toplusu kimi baxılırdı.

6. Təbiətdə və həyatda təsadüflüyə və dualizmə yer verilmirdi.

7. Dərketmənin strategiyaları məlum deyildi və s.

Lakin müasir təsəvvürlərə görə kainat heç də həmişə mövcud olmayıb, onun başlanğıcı olmuşdur. O, statik deyil, dinamikdir və daim inkişafdadır. Böyük ingilis astrofiziki Stiven Xokinqə görə, 13,7 milyard il bundan qabaq baş vermiş Böyük Partlayış zamanın başlanğıcı kimi və ya doğulması kimi qəbul edilir. Müasir sinergetik yanaşmaya görə dünyamız insan kimi doğulmuş, körpəlik, uşaqlıq, gənclik və yetkinlik dövrlərini keçirərək inkişaf etmişdir. Nəticədə özünütəşkiletmək yolu ilə fiziki vakuumdan elementar zərrəciklərə, atoma, molekula, makrocisimlərə, planetlərə, ulduzlara, qalaktikaya qədər böyüyərək təkamül yolu ilə kainat yaranmışdır.

Dünyamız qapalı deyil, açıqdır, yəni daim ətraf aləmlə maddə, enerji və informasiya mübadiləsində və inkişafdadır. Qaz piltəsinə qaz gəlməsə, o yanmaz. Bizi əhatə edən aləmin (materiyanın) ən ümumi xassəsi onun daim hərəkətdə və təkamül yolu ilə inkişafda olması, həm materiyanın binasının öz fundamentində qeyri-adi və həm də ən ümumi xassəsi kimi özünütəşkil etmək qabiliyyətinin aşkar edilməsidir. İnkişafsız materiya ola bilməz. Beləliklə, hərəkət, özünütəşkiletmə və inkişaf materiyanın ən ümumi xassəsi olub, bütövlükdə bütün açıq

sistemlərin məzmun xəttinin mahiyyətini müəyyən edirlər. Hətta sübut olunmuşdur ki, mexaniki hərəkətdə olan cansız elementar zərrəcik sükunətdəki halına nəzərən daha çox yaşama müddəti qazanır. İnsan və ya hər hansı bir canlı da hərəkətdə olarkən daha çox özünütəşkil etmək qabiliyyəti əldə edir.

Sinergetik yanaşma cansız materiyanın təkamül mexanizmini hazırladı. Son illər iqlim haqqında məlumatların dəqiq olması sinergetik yanaşma üsulu ilə kompleks analizin aparılmasının nəticəsidir. Dərman və vitaminlərin son illər sinergetik yolla istehsalı onların keyfiyyətinin əsaslı şəkildə effektli olmasına gətirmişdir.

Biz elə zaman kəsiyində yaşayırıq ki, insanlar kainatın yaranmasının başlanğıcını buradan “seyr etmək” imkanı qazanmışdır. Belə şəraiti elmin qeyri-adi, ehtimal olunmaz dərəcədə dinamik şəkildə inkişafı təmin etmişdir. Onu demək kifayətdir ki, 200 il bundan əvvəl insanlar bir ildə aldığı informasiyanı indi bir gündə alır. Yaxud hazırda bizə gələn informasiyaların miqdarı hər 10-15 ildə iki dəfə artır.

Təbiətşünaslıq tarixində indiyə kimi dörd dəfə elmi inqilablar baş vermişdir. Onlar arasında keçən zamanın sürətlə qısalması elmin zamandan asılı olaraq sürətlə inkişafının əyani göstəricisi ola bilər. Məsələn, birinci elmi inqilabla ikinci inqilab arasında iki min il müddət keçdiyi halda, ikinci ilə üçüncü arasında iki yüz il, üçüncü ilə dördüncü arasında isə cəmi yüz ildən də az vaxt keçmişdir. Bütün bunlar göstərir ki, tarixin özü də bizim qarşımıza, bütün təhsil işçilərinin qarşısına sürətli, keyfiyyətli və səmərəli işləməyi əsas vəzifə, tələb kimi qoyur.

Dərinləşən elmi böhranlar fonunda kainatda çoxlu obyektlər kəşf olunur və yeni hadisələr aşkar edilirdi, lakin bunların çoxu öz elmi izahını tapa bilmirdi. Onlardan bəziləri indi də öz izahını gözləməkdədir.

Misallara müraciət edək: Bir milyon ildən sonra Yer kürəsinin, yaxud hər hansı planetin fəzadakı vəziyyətini dəqiq hesablamaq mümkün olduğu halda, bir gün sonra iqlimin necə olacağı haqqında məlumatlar dəqiq olmurdu.

1961-ci ildə kosmosa buraxılmış Amerika kosmonavtının təxminən 40 il sonra okeanda salamat tapılmasının səbəbi hələlik elmə məlum deyildir (çox ehtimal ki, zaman-məkan məsələsidir).

Kellerin uzaqdan saatı, kompüteri, ekskalatoru, gəmini dayandırması və hərəkətə gətirməsi, toxunmadan metal əşyaları əyməsi, tərəzidə olan yükün çəkisinin dəyişdirilməsi və s. elmdə həll edilməmiş məsələlərdir;

Maşının altına düşmüş uşağını xilas etmək üçün anaya fövqəladə güc gəlməsi və maşını təkbaşına qaldıraraq uşağı xilas etməsi;

Xərçəng xəstəliyinə tutulmuş hamilə qadının uşağı dünyaya gətirənə kimi xəstəliyi dayandırması;

Uşaq ana bətnində olarkən atanın ananı incitməsinə görə uşaq dünyaya gəldikdən sonra ataya düşmən kəsilməsi;

Ekstrasenslərin hadisələri qabaqcadan görməsi və insanların fikirlərini oxuması və s. kimi hadisələr reallıqdır, elmdə öz izahatını gözləyir.

Lakin bununla yanaşı XX əsrin ikinci yarısına kimi bəzi təsəvvürlər elmdə formalaşmamışdır və ondan düzgün nəticə hasil etmək mümkün deyildir. Məsələn, həmin vaxtlara kimi hesab edirdilər ki, qapalı hesab olunan kainat daim mövcud olub, dəyişməzdir, statikdir, inkişafsızdır və s.

Keçən əsrin ortalarına kimi klassik elm hesab edirdi ki, həm də dünyamız sadə, qapalı, tarazlıqlı, statik, dönən, nizamlı və xətti sistemdir. Dünyanın əksər mütəxəssisləri isə belə bir məsələdə həmfikir idilər ki, klassik iqtisadi model əsasında dayanan

*3

dinamik tarazlıq ideyası XX əsrin reallıqlarına cavab vermir və bu səbəbdən də dünya elmi böhran vəziyyətinə gəlib çatmışdır. Mövcud nəzəriyyələrdə müəyyən ziddiyyətlər var idi. XX əsrdə dünya sənayesi 50 dəfədən çox inkişaf etmişdir. Bu ekoloji proseslərdə böhranların kəskinləşməsi siyasi və iqtisadi vəziyyəti qeyri-sabitliyə yönəltmişdi. İnsan yaradıcılığının bütün sahələrində sivilizasiyanın qlobal böhranı daha da dərinləşmişdi. Təbiət və insan münasibəti, təbii-elmi mədəniyyətlə humanitar mədəniyyət arasında ziddiyyətlər cəmiyyətdə gərginliyin artmasına gətirib çıxarmışdır. Elmdə vahid yaxınlaşmanı (inteqrativliyi) qəbul etmirdilər. Zamandan asılı olaraq, sistemlərdə baş verən xətti və qeyri-xətti proseslərin mahiyyəti açılmamış qalırdı. Təbiətdə hərəkət formaları haqqında məlumatlar məhdud idi. Bir çox elmi istiqamətlərin inkişafı "kor uçuşu" xatırladırdı və s. Bütün bunlar elmi inkişaf yolundan yayındırırdı. Hətta indiyə qədər də bu məsələlər özünü göstərməkdədir.

XX əsrin 50-ci illərində dünya elminin, xüsusilə də fizika elminin qarşısında iki möhtəşəm problem dururdu. Bunlardan biri daha mürəkkəb və daha nəhəng EHM-nin yaradılması, digəri isə süni idarə olunan termonüvə reaksiyaları almaq və vahid sahə nəzəriyyəsinin yaradılması problemləri idi. Lakin belə olmadı, birincinin əvəzində təsadüfdən daha kiçikölçülü fərdi kompüterlər meydana gəldi, ikincinin əvəzində isə tamamilə yeni, mürəkkəb, açıq və tarazlıqda olmayan sistemlərin yeni fizikası (sinergetik fizika) meydana gəldi. Belə çıxdı ki, təsadüf məqsədi üstələdi.

Keçən əsrin ikinci yarısında qlobal böhranların daha da dərinləşməsini görən dünya alimləri onun qarşısını almaq üçün daha ciddi elmi tədbirlər görməyə başladılar.

XX əsrin 60-cı illərinin əvvəllərində Amerika tarixçisi və filosofu Tomson Kunun təklifi ilə elmin yeni inkişaf konsepsiyasının yaradılmasına başlandı. O, elmin metodologiyasına yeni olan paradiqma (nümunə) daxil etdi. T.Kunun konsepsiyasının mahiyyəti ondan ibarət oldu ki, elmin inkişafında paradiqmanın dəyişməsi xətti xarakter daşımır. Onun fikrinə görə, kaktus bitkisi kimi elmin inkişafı onun istənilən nöqtəsindən başlaya və istənilən istiqamətdə böyüyə bilər. Əslində, Kunun bu fikirləri elmi inqilabdan başqa bir şey deyildir. T.Kunun konsepsiyasından belə çıxırdı ki, elmdə təsadüflüyə yer verilməlidir. Beləliklə o, elmə təsadüflüyü gətirdi. Həm də paradiqmanın dəyişməsinin xətti xarakter daşımaması o deməkdir ki, təbii proseslərdə dəyişmə kəmiyyət xarakterli olmayıb, keyfiyyət xarakterlidir. Bununla da T.Kun elmdə yeni bir elmi istiqamətin əsasını qoydu. Buradan belə nəticə çıxarmaq olar ki, bizim adət etdiyimiz dünyanın hər hansı mənzərəsi prinsipcə heç də ondan az məntiqi və az ardıcıl olmayan tamam başqa cürə də ola bilər, necə ki, daha mürəkkəb və daha nəhəng EHM-in əvəzinə təsadüfən daha kiçikölçülü fərdi kompüterlər meydana gəldi. Yeni təsəvvürlərə görə inkişafın müəyyən nöqtəsində bir neçə icazə verilən imkanlardan biri təsadüfi seçmə yolu ilə baş verir. Klassik elmdə bu anlaşılmazlıq kimi başa düşülürdü. Lakin həqiqətdə isə məlum oldu ki, ona təkamül mexanizminin bir hissəsi kimi baxmaq lazım gəlir.

Dünyamızın ümumi mənzərəsini yaratmaq bütün dövrlərdə elmin qarşısında aktual bir problem olaraq qalırdı. Onun yaranmasında sistem nəzəriyyəsi bir başlanğıc rüşeym rolunu oynamışdır. Bu nəzəriyyənin yaranması tarixi hələ antik dövrdən başlamışdır.

XX əsrin ikinci yarısında elmdə sistemli tədqiqatların intensiv inkişafı onların elmlərarası təbiətini bütün qabarıqlığı ilə nümayiş etdirdi. Bu baxımdan Amerika

alimləri D.Ellis və Q.Midmiçin sistemli yanaşma haqqında söylədikləri belə bir fikir təqdirəlayiqdir: “Biz atom və kosmik əsrdən çox sistem əsrində yaşayırıq”.

Sistemli yanaşmaya verilən belə yüksək qiymət onun bir neçə cəhətdən aktuallığı ilə səciyyələnir. Əvvəla, sistemlik özündə tamlığı, bütövlüyü, inteqrativliyi və yeni keyfiyyəti ehtiva edir. Bütün bunlar materiyanın özünütəşkiletmək qabiliyyəti kimi ən ümumi xassəsinin təzahür formalarıdır. Digər tərəfdən, keçən əsrin 70-ci illərində cəmiyyətin mənəvi həyatına yeni elmlərarası sinergetik istiqamətdə tədqiqatın daxil olması ümumi sistem nəzəriyyəsinə “sinergetik sistem” adlanan yeni tipli açıq mürəkkəb sistemlərin öyrənilməsi tələbatını yaratmışdır. Belə istiqamətin obyekti müasir elmi idrakın aparıcı istiqamətlərindən olub, yeni keyfiyyətyönümlü, açıq, tarazlıqdan uzaq, qeyri-xətti mürəkkəb sistemlərdir. Digər tərəfdən, sistemli tədqiqatın metodoloji problemlərinin həlli və həm də bütövlükdə sistemli yanaşmanın sonrakı tərəqqisi baxımından da maraq kəsb edirdi.

XX əsrin ikinci yarısında elmdə baş verən kəşflər onu növbəti elmi inqilaba yaxınlaşdırırdı və dünyaya baxış əsaslı şəkildə dəyişdi. Məlum oldu ki, klassik elmin qəbul etdiyi kimi real dünyamıza həqiqətdə sadə, qapalı, tarazlıqlı, statik, dönən, nizamlı və xətti sistem kimi baxmaq olmaz. Onu harmoniyanın, ahəngdarlığın, qanunauyğunluğun sistemi kimi deyil, həm də qeyri-stabilliyin, dayanıqsızlığın, tarazsızlığın, xaosun, qeyri-müəyyənliyin sintezi kimi başa düşmək lazımdır. Kainatda daim inkişaf prosesləri baş verir və bu proseslərin gedişinə xətti, dönən proses kimi baxmaq olmaz. Real dünyamız sadə yox mürəkkəb, qapalı yox açıq, tarazlıqlı yox tarazlıqdan uzaq, davamlı yox davamsız, dönən yox dönməyən, nizamlı yox nizamsız (xaos), statik yox dinamik, xətti yox qeyri-xətti (keyfiyyət xarakterli) nəhəng və bütöv bir sistemdir. Bunlar təbiət və cəmiyyətdə mövcud olan dualizmin (ikili təbiətin) təzahürləridir. Hadisələrə mütləq münasibət göstərmək olmaz.

Sonradan məlum oldu ki, təbiət özü davamlı olaraq tarazlığa qarşı mübarizə aparır, yaratdığını yaşadır. Tarazlığın yaranması isə həyatın məhv olması demək olardı. Sonradan məlum oldu ki, bizim dünyamızı dörd fundamental dünyəvi sabitlər idarə edir. Onlar qravitasiya sabiti, işığın boşluqdakı sürəti (təbiətdə ən böyük sürət), Plank sabiti (ən kiçik təsir) və elektronun yüküdür. Bu sabitlər aldığı qiymətlərdən müəyyən qədər kənara çıxsalar idi, onda həyat mövcud ola bilməzdi. Bu fundamental sabitlər dünyamızın strukturunu müəyyən edirlər və dünyanın istənilən nöqtəsində qiymətlərini sabit saxlayaraq dəyişmirlər. Təbiətdə baş verən fundamental qarşılıqlı təsirlərin təzahür formalarını ifadə edən bu fundamental dünyəvi sabitlərdən istifadə edərək dünyanın ümumi fiziki mənzərəsi formalaşdırıldı və sonradan bunlar dünyanın ümumi mənzərəsinin yaradılmasında məharətlə istifadə edildi.

Təbiətşünaslıq müasir elmin zirvəsi hesab olunur, fənlərin metodologiyasının və dünyanın mənzərəsinin formalaşmasında həlledici rol oynayır. Bütün bunları nəzərə alaraq oniki illik təhsil sisteminə keçməklə əlaqədar pedaqoji universitetlərin standartlarına və tədris planlarına “Müasir təbiətşünaslığın konsepsiyası” adlı fənn daxil etməklə, həm də bu sahəni orta məktəb şagirdlərinə əsaslı şəkildə öyrətmək üçün indidən pedaqoji universitetlərdə mütəxəssis kadrların hazırlanmasına diqqət artırılmalıdır.

Artıq keçən əsrin 70-ci illərində məşhur alman fiziki və riyaziyyatçısı G.Haken və ondan asılı olmayaraq görkəmli Belçika fiziki və kimyaçısı İ.Priqojin

tərəfindən yeni elmlərarası istiqaməti müəyyən edən, açıq, mürəkkəb və tarazlıqdan uzaq olan sistemlərin özünütəşkil nəzəriyyəsi kimi tanınan və yeni bilik sahəsini əhatə edən "sinergetika" elmə qədəm qoydu.

G.Hakenə görə, onun fundamental təbii-elmi bazasında koherent (uzlaşdırılmış) proseslər fizikası dayanır. Başlıca məqsəd isə özünütəşkiledən mürəkkəb strukturların yaranmasının ümumi qanunauyğunluqlarını öyrənməkdir.

İ.Priqojinə görə sinergetikanın bazasında tarazlıq termodinamikası dayanır. Özünütəşkiletmə proseslərində qeyri-tarazlıq termodinamikası çərçivəsində zamanın geri dönməzliyi və sinergetikanın inkişafında yeni dünyagörüş problemləri kimi başqa bir yeni yanaşma üsulundan istifadə olunur. "Sinergetika" sözü qədim yunan dilində birgə təsir, birgə fəaliyyət mənasını verir. G.Haken ondan öz aralarında təsir göstərən çoxlu sayda elementlərdən ibarət sistemlərin yeni elmlərarası istiqamətinin tədqiqini adlandırmaq üçün istifadə etmişdir.

G.Haken özünün "Sinergetika" kitabının girişində yazır: "Mən öz təlimimi ona görə "sinergetika" adlandırdım ki, onda sistemin bir çox elementlərinin birgə fəaliyyəti tədqiq olunur, həm də ona görə belə adlandırdım ki, özünütəşkiletməni idarə edən ümumi prinsiplərin tapılması müxtəlif təlimlərin birgə fəaliyyətini tələb edir".

Dünyamızın qarşılıqlı təsir aləmi olması inkaredilməzdir. Belə qarşılıqlı təsirlərin nəticəsində kooperativ, yaxud kollektiv proseslər yaranır ki, bu da sistemlərin özünütəşkiletməsinə gətirir.

Sinergetika ayrı-ayrı fənlərdən fərqli olaraq müxtəlif sistemlərdə (təbiət və cəmiyyət) özünütəşkil proseslərinin ümumi qanunauyğunluqlarını öyrənir. Açıq və mürəkkəb sistemlərin özünütəşkil proseslərinin riyazi modelləşdirilməsində istifadə olunur. Fənlərarası tədqiqatda bəzən bir elmin metodları digər elmlərdə (məsələn, fizika, kimya və biologiyada) istifadə olunur. Lakin burada iki sərhəd elmin tədqiqi üçün ümumilik yoxdur. Sinergetika isə bütün açıq, tarazlıqda olmayan sistemlərin vahid, ümumi metodudur.

Onun əsas ideyası ondan ibarətdir ki, belə sistemlərdə özünütəşkil nəticəsində nizamsızlıqdan nizamlılıq yaranır. Lakin qapalı sistemlərdə belə oxşar hadisələr baş vermir. Əslində, demək olar ki, təbiətdə real qapalı sistem yoxdur. Bütün real sistemlər açıqdır. Çalışıb müasir elmimizə ancaq və ancaq reallıqları gətirmək lazımdır.

Təbiətdə bütün real sistemlərin (təbii və sosial) inkişafı təkamül yolu ilə baş verir. Belə inkişaf zamanı proseslərin inkişafı qeyri-xətti yolla baş verir. Bu o deməkdir ki, açıq mürəkkəb sistemlərdə təkamülün bir neçə mümkün yolu mövcuddur. Digər tərəfdən, inkişaf keyfiyyət xarakterlidir. Sistem açıqdır, o deməkdir ki, həmin sistem daim ətraf aləmlə maddə, enerji və informasiya mübadiləsindədir. Məhz bir çox təbiət və cəmiyyət hadisələrinin izahında da ziddiyyətlərin meydana gəlməsinin əsas səbəbi də təbiətdə olan real sistemlərin mahiyyətinə yanlış yanaşma (sadə, qapalı, tarazlıqlı, dönən və s.) səbəb olmuşdur.

Nyutondan başlayaraq dünyanın ümumi mənzərəsində biliyin sintezi üçün fundamental əsası fiziki nəzəriyyələr verirdi. Lakin XX əsrin 90-cı illərinin əvvəllərindən inteqrativ postqeyri-klassik elmin dünya elm sahəsinə gəlməsi ilə (elmdə mini inqilabın baş verməsi ilə) dünyada biliyin inteqrasiyasında fundamental mənanı qeyri-fiziki prinsiplər-sistemlilik, özünütəşkil və təkamül əldə etdi. Əsasında sistemlilik, özünütəşkil və qlobal təkamülçülük dayanan dünyanın sintetik (kibernetik, informatik və sinergetik) mənzərəsi (XX əsrin sonu) mey-

dana gəldi.

Sintetik mənzərə müasir elmdə mövcud olan dünyanın çoxcəhətli mənzərələri içərisində ən geniş yayılmışı-təbiəti, insanı və cəmiyyəti təsvir edə bilən ən ümumi elmi mənzərəsidir. Bu mənzərə təbiət, insan və cəmiyyət haqqında təbii elmi və sosial humanitar biliklərin sintezindən hasil edilmişdir.

Son dövrlərə kimi qeyri-klassik fizika adı altında fundamental nəzəriyyələr - nisbilik (xüsusi və ümumi) nəzəriyyəsi və kvant mexanikası təqdim olunurdu. XX əsrin sonlarından başlayaraq belə bir ideya əsas götürülür ki, təbiətdə mövcud olan bütün qarşılıqlı təsirləri “vahid sahə nəzəriyyəsi” altında birləşdirərək vahid bir tamlıqda birləşsin və onu universal riyazi düsturlarla ifadə etmək mümkün olsun.

Postqeyri-klassik elminə aid olan dünyanın fiziki özünütəşkil nəzəriyyəsi (sinergetik fizika) ilə yanaşı bir neçə fundamental nəzəriyyələri də əhatə edir. Buraya kvant xromodinamikası, sim və supersim nəzəriyyəsi daxildir.

Dünyanın ümumi mənzərəsi müxtəlif ixtisas sahələrinin nailiyyətlərinin sintezindən yaranmışdır. Həmçinin XX əsrin sonlarında sosialhumanitar mədəniyyətə elm üçün daxili məqsədlərdən başqa, elm üçün xarici olan sosial, iqtisadi, siyasi və mədəni məqsədlər də daxil edildi. Mədəniyyət özü də komplekslik mahiyyətini aldı. Bilikli, bacarıqlı, mükəmməl, yaradıcı və humanist insanlar mədəni insan kimi xarakterizə olunmağa başladı.

Təbii seçmə canlı aləmdə təkamülün mexanizmi, insan həyatı isə yüksək təkamüllü sistem kimi səciyyələndirildi və qəbul olundu ki, təbiətin və insanın birlikdə həyatı təkamül yolu ilə inkişaf edir. Sinergetik yanaşma baxımından təbii seçmə özünütəşkiletmək yolu ilə baş verən təkamüldür.

Postqeyri-klassik elm göstərdi ki, elmdə diferensiasiya müəyyən mərhələyə qədər inkişafa köməklik göstərir və sonra tormozlayıcı amilə çevrilir. Diferensiasiya və inteqrasiya eyni zamanda getməli və bir-birinə uzlaşdırılmalıdırlar. Onlar nəinki bir-birini inkar etmir, hətta bir-birini tamamlayaraq, bir-biri ilə dualizm əmələ gətirərək elmin inkişafının yollarından biri kimi çıxış edirlər.

Sinergetik yanaşma təbiətin inteqrativliyinə, bütövlüyünə və keyfiyyət yaratmaq qabiliyyətinə əsaslanır. Darvinin təkamül nəzəriyyəsi canlı təbiətdə hansı rolu oynayırsa sinergetika cansız təbiətdə həmin rolu oynayır. Təbiət bütöv və vahid olduğu kimi, onu təsvir edən elm də bütöv və vahid olmalıdır.

Məhşur alman alimi M.Plank yazırdı: “Elm daxilən vahid bütövlüyə malikdir. Onu ayrı-ayrı sahələrə bölmək (diferensiasiya etmək) şeylərin təbiəti ilə bağlı olmayıb, insanın dərketmə qabiliyyətinin məhdudluğu ilə bağlıdır”.

Klassik elm təbiətlə insan arasında harmoniyaya yer vermirdi. Sinergetik yanaşmaya görə dünyanın müasir mənzərəsi təbii və humanitar mədəniyyətlər paradiqması, bütövlük və dünyaya obyektiv elmi baxış bazası əsasında qurulmuşdur. Ona görə də elmə qarşılıqlı anlaşmanın, incəsənətə isə dünyanı dərketmənin əsası kimi baxılır. Onların cəmi isə bütün dünyanı harmoniyada dərketməyin, insanlığın dünyaya münasibətinin əsası kimi qəbul edilir.

Sinergetika XXI əsr elmidir. Bu elm qədim sivilizasiyanın müdrikliyi ilə təbiət və humanitar elmlərin nailiyyətlərini sintez edərək təbiəti - insanı- cəmiyyəti real başa düşə biləcək konsepsiya yaratdı. Bu konsepsiya bir tərəfdən, təbiətin real atributlarını (materiya, hərəkət, qarşılıqlı təsir, məkan,

zaman və s.) üzə çıxardaraq, onların təbiətini müəyyənləşdirdi, digər tərəfdən onlar arasında əlaqələri ümumiləşdirərək konseptual səviyyədə dünyamızın real ümumi mənzərəsini yaratdı.

Klassik elmdə metodologiya fizikanın və kosmologiyanın əsasında işlənmişdir. Müasir sinergetik elmdə isə metodologiya tamamilə yeni prinsiplər əsasında işlənildi. Belə ki, keçən əsrin 90-cı illərinin əvvəllərində dünya elmində baş verən elmi inqilab nəticəsində XX əsr üçün xarakterik olan elmi-texniki tərəqqi öz yerini XXI əsr üçün xarakterik olan elmi-texnoloji təkamülə verdi. Bununla da elmi yeni təkamül sinergetik paradiqma dövrü başlanmışdır. Dünyanın fiziki, təbii-elmi, sosial-iqtisadi, mədəni-siyasi və sintetik (kibernetik, informatik, sinergetik) mənzərələri nəzərə alınmaqla postqeyri-klassik elmin yeni metodologiyası işlənilib hazırlandı.

Elmdə yeni istiqamət olan sinergetika bütün elmlərin (təbiət, sosial, humanitar və s.) inteqrativliyini təmin etmək, fənlərarası əlaqəni vahid mövqedən təsvir etmək, bizi əhatə edən aləmin müxtəlif obyektlərində inkişafın hərəkətverici qüvvəsini təsvir etmək iddiasını öz üzərinə götürür.

Hətta XX əsrin sonlarının yaxınlaşmasına baxmayaraq bəzi görkəmli alimlər (o cümlədən kvant mexanikasının yaradıcılarından olan Danimarka fiziki N.Bor) inteqrativliyi qəbul etmirdi. Lakin inteqrativlik özözünə yol tapırdı. Belə ki, XIX əsrdə Maksvell elektrik, maqnit və optik hadisələrin birliyini təmin etməklə yeni elektromaqnit hadisələrinin bütöv nəzəriyyəsini yaratmışdır.

XX əsrin əvvəllərində (1905) dünya şöhrətli alim Eynşteyn, Qaliley-Nyuton mexanikası ilə Maksvell-Lorens elektrodinamikasının sintezindən istifadə edərək xüsusi nisbilik nəzəriyyəsini, 1916-cı ildə qravitasiya sahəsi ilə fəza-zaman həndəsəsini birləşdirərək ümumi nisbilik nəzəriyyəsini yaratmışdır. Bununla da o, materiya ilə fəza-zaman arasında əlaqəni təmin edərək təbiətin atributları (materiya, hərəkət, məkan, zaman və qarşılıqlı təsirlər) arasında qarşılıqlı münasibət yaratmağa nail olmuşdur. Bunlar elmdaxili bütövlüyün təmin olunmasında əvəzsiz nailiyyətlər idi ki, onların nəticəsi olaraq postqeyri-klassik elm qələbə çaldı və sinergetik yanaşma (özünütəşkil nəzəriyyəsi) həyata ayaq açdı. Əslində, onlar inteqrativliyin əksinə çıxaraq, heç özləri də bilmədən inteqrativliyi inkişaf etdirmişlər. Bununla da postqeyri-klassik elmin yaranması inteqrativliyin yaranmasına səbəb olmuşdur.

Sinergetik yanaşma XX əsrin reallıqlarına cavab verərək göstərdi ki, real dünyamız klassik elmin dediklərindən fərqli olaraq, açıq, mürəkkəb, tarazlıqdan uzaq, dinamik, xaotik, dönməyən, qeyri-xətti və iyerarxiyalı bütöv bir sistem olub, təkamül nəticəsində yaranmış və inkişaf etmişdir. Ən sadə materiya maddə, ən sadə hərəkət forması mexaniki hərəkət (nisbi yerdəyişmə) və ən sadə qarşılıqlı təsir mexaniki toqquşmadır. Təbiətdə ən mürəkkəb materiya bioloji materiya (canlı materiya), ən mürəkkəb qarşılıqlı təsir bioloji qarşılıqlı təsir və ən mürəkkəb hərəkət forması bioloji hərəkət olub özünütəşkildir. Təbiət elmlərini üç xüsusiyyətinə görə (materiya, qarşılıqlı təsir və hərəkət formasına görə) sıralasaq, onda elmlərin varisliyini almış olarıq: fizika-kosmologiya-kimya-geologiya-biologiya. Bu o deməkdir ki, fizika kosmologiyanın, fizika və kosmologiya kimyanın, fizika, kosmologiya və kimya geologiyanın, kimya biologiyanın açarıdır. Müasir biologiya elminin

nailiyyətləri göstərir ki, biologiyanın təkamülü kimyanın təkamülünün qanunauyğun davamıdır.

Klassik mexanikada tanış olduğumuz maddə materiyanın ən sadə forması olub, kütlə və ətalət yaratmaqla səciyyələndiyi halda, biologiyada tanış olduğumuz maddə canlı materiya materiyanın ən mürəkkəb forması olub, onun ən ümumi xassəsi özünütəşkil, özünümürəkkəbləşdirmək və özünüinkişafdır.

Təbiət real mövcud olan açıq sistemləri göstərdiyimiz üç amil hesabına tarazlıqdan uzaqlaşdırır və sistemlər bu yolla tarazlığa qarşı mübarizə aparırlar. Nəticədə dinamizm və qarşılıqlı təsir yaranır. Sistemə üç amilin təsiri daimi və arasıkəsilməz olduğu üçün dinamizm və qarşılıqlı təsir özünühərəkətə, özünütənzimləməyə, özünütəşkilə, özünüinkişafa, özünümürəkkəbləşdirməyə və nəhayət, özünümükəmməlləşdirməyə, beləliklə də bütövləşməyə gətirir. Bütün bu mərhələlər bioloji hərəkətin ən mürəkkəb hərəkət formalarının nəticəsidir. Belə hərəkət formaları qeyri-xətti proses kimi keyfiyyət dəyişikliyi ilə müşayiət olunaraq, özünütəşkil və beləliklə də təkamül yolu ilə inkişafı təmin edir. Belə bioloji hərəkət formalarının açıq sistemdə baş verməsi nə Darvinə, nə də Bolsmana məlum idi. Onlar qapalı sistemləri nəzərdə tutaraq uyğun olaraq bioloji və fiziki triadaları yaratmışlar. Qapalı sistemlərdə isə ətraf aləmlə maddə, enerji və informasiya mübadiləsi olmadığı üçün orada tarazlığın pozulmasından söhbət gedə bilməz. Bu sinergetik yanaşma nəticəsində üzə çıxarılmış yeni hərəkət formalarıdır.

İndiyə kimi klassik elmdə bilik məqsəd idisə, indi vasitə rolunu oynayır. Həm də bilik müasir cəmiyyətin əsas resursu hesab olunur. Sinergetik yanaşmaya görə elmi biliyin praktik olaraq elmdaxili məqsəddən elm üçün xaric olan məqsədlərə çevrilməsi tələbi qoyuldu. İndi vahid təkamül-sinergetik paradiqma əsasın-da təbətin əsas hadisələri və qanunlarının fənlərarası təsviri ənənəvi hal alır. Belə yanaşmanın reallaşması canlı sistemlərin və insan cəmiyyətinin təsvirində xüsusi diqqət kəsb edir.

Postqeyri-klassik elmin əməkdaşlıq, birgə təsir, kollektivçilik mənasını verən sinergetikanın güvənc yeri təbiətin özüdür. Bu elmin iddiası hər şeyin nəzəriyyəsini, "bütün mövcudiyyatın nəzəriyyəsini" yaratmaqdır. Elə açar yaratmaq ki, bu açar bütün qapıları aça bisin. Əlbəttə, bu ancaq təbiətin özünə məxsus keyfiyyətdir.

Sinergetika təbiətin yaradıcılığı ilə məşğul olan elmdir. Kibernetika - ağılın yaranması problemləri ilə məşğul olduğu kimi, sinergetika materiyanın yaranması problemi ilə məşğuldur.

Sinergetika bütün elmləri - təbiət və humanitar elmləri birləşdirmək iddiasındadır.

Sinergetika dərketmənin yeni strategiyasını yaratdı: sistemlik, özünütəşkil və qlobal təkamülçülük.

Bunların əsasında dünyanın ümumi mənzərəsini yaratdı.

Yeni elm qədim sivilizasiyanın müdrikliyi ilə təbiət və humanitar elmlərin nailiyyətlərini sintez edərək, təbiət-insan-cəmiyyəti birləşdirərək bütövləşdirən konsepsiya yaratdı.

Canlı və cansız təbiəti bir-birinə yaxınlaşdırdı. Təbiət hadisələri arasında fərqə deyil, oxşarlığa, vəhdətə üstünlük verdi.

Dünyəvi sabitlər kainatın strukturunu müəyyən edir və güclü qravitasiya kainatın strukturunu və həndəsəsini dəyişir.

Məlum oldu ki, xaos təkcə dağıdıcı deyil, həm də yaradıcıdır. Xaos - nizamlılıq

dualizmi təşkil edir. Biri digərini inkar etmir, əksinə təsdiq edir. İnkişaf davamsızlıqdan, xaosdan keçir.

Məlum oldu ki, tarazsızlıq, davamsızlıq dinamizmin yaranmasına, dönməyən proseslər materiyanın yaranmasına gətirir.

Klassik elm alternativ halı təsvir edə bilmirdi.

Sinergetika təbiətin yaradıcılığını öyrənməklə cansız təbiətdə daha sadə sistemdən daha mürəkkəb sistemlərin yaranmasında özünühərəkət, özünütəşkil, özünümürəkkəbləşdirmək və özünümükəmməlləşdirmək prinsiplərini qoruyub saxlayır.

Sinergetika yeni elmi bilik sahəsi kimi çox sürətlə inkişaf etmiş və qısa müddətdə özünü müasir cəmiyyətin intellektual həyatının ayrılmaz parametrlərindən olduğunu təsdiq etmişdir. Son 15-20 il ərzində bu sahədə alınan Nobel mükafatları onun böyük uğurlarından xəbər verir. Sinergetikanın inkişafında Qərb və rus alimləri ilə yanaşı Azərbaycan alimlərinin də xüsusi əməyini qeyd etmək lazımdır. Onlardan A.Abbasovu, F.Qurbanovu, T.Allahyarovanı, Ə.Məmmədovu, R.Bəşirovu, B.İsmayılovu və başqalarını göstərmək olar.

Təhsil sistemi də təbiətdə mövcud olan digər sistemlər kimi açıq, tarazlıqdan uzaq, dönməyən, iyerarxiyalı və özünütəşkiledən mürəkkəb sinergetik sistemdir. Yeni və mükəmməl təhsil sistemi yaratmaq üçün sinergetik yanaşmadan istifadə etmək zamanın tələbidir.

***Rəyçi: prof. Ə.Məmmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Qurbanov F. Sinergetika: Xaosun astanasında. Bakı, 2004.
2. Səmədova R., Məmmədov Ə. Sistemli yanaşma və sinergetik paradiqma. Bakı, 2012.
3. Məmmədov Ə. Yeni elmlərarası istiqamət (sinergetika). //Azərbaycan məktəbi, 2015, №1.
4. Nəzirzadə L. Sinergetik ideyaların sosiohumanitar elmlərə adaptasiyası problemi. Bakı Universitetinin xəbərləri,2012, №2.
5. Аршинов В. Синергетика как феномен постнеклассической науки. М., 1999.
6. Mehdioğlu A. İbn Xəldun və başqaları. Bakı: Nurlan, 2006.

**М.Мургузов**

**Синергетический подход в образовании**

**Резюме**

В статье говорится о научной ьировой картине в конце XX и в начале XXI века, о развитии синергетической науки и облиянии ее на систему образования. При этом автор ссылается на мысли ведущих ученых в этой области.

**M.Murguzov**

**Synergetic approach in education**

**Summary**

In the article it is spoken about the development of Synergetics at the end of XX and at the beginning of XXI century, and its influence on education. The author focuses on the well-known scientists' opinions on the influence of Synergetics in education.

# TƏLƏBƏ AUDİTORİYASININ İDARƏOLUNMASI ÜZRƏ İŞİN FƏLSƏFİ ƏSASLARI

**Sahib Məmmədov,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***Mingəçevir şəhəri***

***Açar sözlər:*** *auditoriya, tələbə auditoriyası, idarəetmə, idarəetmənin sistemi, tələbə auditoriyasının idarə olunması, idarəetmənin fəlsəfi əsasları.*

***Ключевые слова:*** *аудитория, студенческая аудитория, управление, система управления, управление студенческой аудиторией, философские основы управления.*

***Key words:*** *audience, the students' audience, management, management system, control of the audience of students, the philosophical foundations of management.*

Tələbə auditoriyasının idarə olunması təhsilin fəlsəfəsində önəmli yer tutur. Auditoriyanın idarə edilməsi fəlsəfəsi məntiqi, psixoloji, sosioloji, təşkilati və etik baxımdan tələbə qrupu ilə sistemli, məqsədyönlü, planauyğun və sistemli işlərin aparılması prosesini özündə ehtiva edir.

Tələbə auditoriyasının idarə edilməsinin mahiyyəti nəzərdə tutur ki, tələbə oğlanlar və qızlar öz şəxsi tələbatlarını - təlim əməyini və tərbiyəolunma tələbatlarını ödəyə bilsinlər, gələcəyin mütəxəssisləri kimi yetişə bilmə imkanlarına malik olsunlar. Başqa sözlə, auditoriyada elə mühit yaradılmalıdır ki, tələbələr məcburi məşğələ olduğuna, mühazirə və seminarlarda iştirak etməyin zəruriliyinə görə deyil, professorla, dosentlə, assistentlə görüşəcəklərinə, mühazirələr maraqlı və lazımlı olduğuna, yeni biliklərə və həyati bacarıqlara yiyələnəcəklərinə görə həvəslə və ruh yüksəkliyi ilə təlim prosesində iştirak etsinlər. Əks təqdirdə, müəllimlə görüş, mühazirə və seminar məşğələsi onlardan ötrü cansıxıcı, əzabverici, şərh materialı maraqsız olacaqdır. Ali məktəb təcrübəsində belə hallarla tez-tez qarşılaşmaq mümkündür. Bəzi müəllimlərin mühazirələri, seminar məşğələləri cəlbedici, digərlərininki yorucu, yeknəsəq, darıxdırıcı olur.

Tələbələr bəzi müəllimlərin oxuduğu mühazirələrə diqqətlə qulaq asır, qeydlər götürür, seminar məşğələlərində yaradıcı fəallıq, müstəqillik göstərirlər. Belə hallarda müzakirələr, problemlərin irəli sürülməsi və həlli, qərarların qəbul olunması, təhlillər, fikir mübadilələri, diskussiyalar nəticəsində məşğələnin başa çatmasına görə təəssüf hissi doğurur. Başqa bir cəhətdən də bu, təsadüfi deyildir. Auditoriyada həm də etibarlı, səmimi, xoş, qarşılıqlı anlama, qarşılıqlı hörmət kimi vacib münasibətlər yaranmışdır. Tələbələrin hər biri öz fikrini bildirə bilir, tənqid və özünütənqid normal qarşılanır.

Bəzi mühazirələr zamanı isə, tələbələr tez-tez saata baxır, məşğələnin nə isə uzun çəkdiyini düşünür, onun tez başa çatmasını arzulayırlar. Zəng çalınanda sevinirlər.

Tələbə auditoriyasında belə bir mühit hökm sürürsə, təlimin keyfiyyətinin yüksəldilməsi qayğısına lazımi diqqət yetirilmirsə, müəllim hər bir məşğələyə qabaqcadan ciddi hazırlaşaraq gəlmirsə, mühazirəni kağızdan oxuyub heç bir yaradıcılıq göstərmir, yenilikləri tələbələrə çatdırmırsa, o, qrupu idarə etməyi də bacarmaya-

caqdır.

Tələbə auditoriyasının idarəolunmasının fəlsəfəsi müəllimdən heç də proqramda nəzərdə tutulmuş mövzular üzrə materialları tədris edərək, jurnalda qeydlər aparmağı deyil, eyni zamanda tələbələrin tələbatlarını ödəməyi tələb edir. Bu tələbatlara daxildir: onların öyrənməyə, məlumatlanmağa, dünyagörüşünü genişləndirməyə, həyati bacarıqlara yiyələnməyə, bir gələcək mütəxəssis kimi seçdiyi ixtisasa aid bilik və bacarıqları əxz etməyə yönələn məsələlər. Fəlsəfi aspektdə bütün bunlar tələbə auditoriyasını idarəetmənin sisteminin vəzifələridir. Tələbə auditoriyasının idarəolunması fəlsəfəsi ali məktəbin fəlsəfəsinin və təhsil müəssisəsinin özünün ayrılmaz hissəsidir.

Tələbə auditoriyasının fəlsəfi postulatlarının pozulması müəllimlər və tələbələr arasında ixtilafların baş qaldırılması ilə nəticələnir. Beləliklə, həm təlim göstəriciləri aşağı düşür, həm də tələbə qruplarının tərbiyəlilik səviyyəsi qənaətləndirici olmur.

Tələbə auditoriyasının idarəolunması fəlsəfəsinin tələbləri gözlənildiyi hallarda nəinki ayrı-ayrı akademik qrupların müvəffəqiyyətləri və uğurları artır, həm də ali təhsil müəssisəsinin, fakültələrin göstəriciləri yüksəlir. Bu, inkaredilməz faktdır ki, institut və universitetlərin səviyyələri və nüfuzu tələbələrin göstəriciləri ilə müəyyən olunur, ali məktəbin inkişafını şərtləndirir. Yaxşı nəticə həm də müəllimin səviyyəsini göstərir.

Vaxtilə Aristotel yazırdı: “fəlsəfə təəccübdən başlanır” (1).

Bu fikir baxımından müəllim tələbələri təəccübləndirməyi bacarmalıdır. Özünün biliyi, savadı, məlumatlılığı, pedaqoji ustalığı, metodik hazırlığı, davranışı, nitqi, ünsiyyəti, rəftarı ilə!

Ona görə də ali təhsil müəssisələri - institut və universitetlər pedaqoji kadr seçiminə ciddi fikir verməlidir. Pedaqoji kollektiv ali məktəbin simasıdır. Ali məktəb müəllimləri vaxtlı-vaxtında attestasiyasından, təkmilləşmə və ixtisashazırlama kurslarından keçirilməli, müvafiq vəzifələri tutmaq üçün müsabiqələr elan olunarkən seçimə fikir verilməli, obyektivlik, ədalət gözlənilməlidir. Bu, bir həqiqətdir ki, ali təhsil müəssisələrində təsadüfən işə götürülmüş, az savadlı, hazırlıqsız, nəzəri və metodik səviyyəsi aşağı olan, pedaqoji ustalığa yiyələnməmiş, eyni zamanda müəllim-tələbə münasibətlərinə düzgün yanaşan müəllimlər öz yerlərində sabitliklə bişirlər. Çünki müəllim özünütəhsili və özünütərbiyə ilə məşğul olmalı, müntəzəm şəkildə öz fəaliyyətini təhlil etməli, işini planlaşdırmalı, gündəlik özünə hesabat verməli, işinin yaxşı tərəflərini bilməli, yol verdiyi qüsurları müəyyənləşdirib aradan qaldırmağa səy etməlidir.

Planlaşdırma, fasiləsiz proses olub tələbə auditoriyası ilə aparılacaq işin məqsədinin dəqiq və konkret müəyyənləşdirilməsini, həmin məqsədə çatmaq üçün üsul və vasitələrin seçilməsini nəzərdə tutur.

Fəaliyyət zamanı motivasiya da diqqətdə saxlanılmalıdır. Motivasiya müəllimin özünü və ali məktəbin məqsədlərini həyata keçirmək üçün özünü və tələbələri bu işə sövq etməkdir.

Nəzarət fəaliyyətin nəticələrinin monitorinqi və qiymətləndirilməsi üçün lazımdır. Təbii ki, müəllim də müəyyən çətinliklərlə üzləşir. Bu, təbiidir. Yaradıcı, səriştəli, usta müəllim həmin çətinliklərin səbəblərini öyrənib, onların da öhdəsindən gəlir.

Müəllim tələbələrə nümunə olmalı, tələbələr onun dəyərli keyfiyyətlərini bəyənib özlərini ona bənzətməlidirlər. Pedaqoji peşənin qiyməti bundadır.

Məlum olduğu kimi, Yaponiya iqtisadi baxımdan dünyanın ən mühüm güc mərkəzi hesab olunur. Yapon şirkətləri tex-

noloji üstünlüklərinə görə diqqət mər-kəzinə gəlir. Uğurlar təsadüfi deyildir. Yaponiyanın həyatının bütün sahələrinə, o cümlədən təhsil sisteminə işgüzar rəhbərlik və onlarda idarəetmənin səmərəli qurulması, şəffaflıq, bərabərlik müvəffəqiyyətin rəhnini təmin edir.

Ona görə də Yaponiyanın uğurlu idarəetmə sistemi ilə tanış olub ondan faydalanmaq bizim üçün də əhəmiyyətlidir.

Yapon şirkətlərinin uğurları ilə tanışlıq belə bir qənaətə gəlməyimizə əsas verir ki, bu müvəffəqiyyətin sirri heç də nə insan amili, nə də sistemdir. İdarəetmənin müvəffəqiyyəti “təşkilat mədəniyyəti” ilə bağlıdır. Təşkilat mədəniyyətinə rəhbərlik, işçilər, iş alətləri və ya texnika, sistem, ətraf mühit və s. daxildir.

Qeyd olunanlar ayrı-ayrılıqda heç biri əlahiddə götürüldükdə təşkilata uğur gətirməyə qadir deyil. Müəyyən təcrübəyə malik səriştəli insanın özünü qiymətləndirməyən, motivasiyanı təqdir edib yüksəltməyən və rəğbətləndirməyən idarəetmədə uğur qazanması çətindir. Deməli, müvəffəqiyyət keyfiyyətli insan resursları və keyfiyyətli sistem şəraitində qazanılır.

İdarəetmə nədir?

Alman filosofu və dilçisi Vilhelm fon Humbold XVIII-XIX əsrlərdə o zamanlar Avropa düşüncə tərzi üçün inqilabi sayıla biləcək belə bir bir ideyanı irəli sürdü: “müxtəlif dillər - bu və ya digər əşya üçün müxtəlif deyillər, amma onun müxtəlif şəkildə görünməsidir” (2).

Humboldun qənaətincə, dil təfəkkürə, mədəniyyətə, sosial münasibətlərə formalaşdırıcı təsir göstərərək, heç də yalnız ayrıca götürülmüş fərdə münasibətdə deyil, bu dildə danışan xalqa, münasibətdə yüksək mahiyyət daşıyır, dil şüuru milli varlıq müəyyən edir, “hər bir dil onun məxsus olduğu xalqı ifadə edir” (2).

Öz şəxsi, yalnız ona məxsus qanuna görə dil də doğulur və anlayışın dərin mənasını “sözün daxili formasını” inkişaf etdirir.

“İdarə etmək”: 1. gedişatı istiqamətləndirmək, hərəkət, kiminsə-nəyinsə hərəkətinə rəhbərlik etmək; 2. rəhbərlik etmək, kiminsə-nəyinsə fəaliyyətinə rəhbərlik etmək mənalarını verir (3).

“İdarəetmə” sözünə yaxın söz var. Lakin dildə tamamilə eyni məna daşıyan söz yoxdur. Əcnəbi dildən alınma sözlər olur. Onlar dilə daxil olsalar da, artıq dildə olan, yəni dilin öz sözünü təkrar etmir, sadəcə məna çalarına malik olur. İdarəetmə, adətən, rəhbərlik anlayışı vasitəsilə işlənir. Onlar mənaca yaxındırlar: kimi isə, nəyi isə idarə etmək; kimə isə, nəyə isə rəhbərlik etmək. Əks formaları da mövcuddur: “idarə edilmək”, “rəhbərlik edilmək”. Lakin bu formalar az işlədilir.

Bu anlayışlar arasında oxşarlıq olsa da, fərqli cəhətləri də vardır. “Rəhbərlik edən (rəhbər)” daha ümumi anlayışdır, onda daha çox uyğunluq, ahəng və uzlaşma vardır.

İdarə edən qayda-qanuna, intizama nəzarət edir, müəssisənin gündəlik fəaliyyətinə rəhbərliyi həyata keçirir.

Auditoriyanın idarəolunması fəlsəfəsi idarəetmə fenomeni tələbələrin ictimai və şəxsiyyətlərarası münasibətlərinin səciyyəvi və müstəqil sahəsi kimi öyrənir.

İdarəetmə fəlsəfəsi aşağıdakı problemləri diqqət mərkəzinə gətirir:

“1. Aksioloji problem, sosial dəyərlər sistemində idarəetmənin təhlilini nəzərdə tutur. Belə ki, idarəetmənin məqsədi fərdin dəyərlərindən kənarda, sosial qruplar sistemindən və cəmiyyətin özündən kənarda mövcud deyil, mövcud ola da bilməz.

2. İdarəetmə fəlsəfəsi idarəetmənin sosialdəyişdirici və sosial-inteqrativ funksiyalarının təhlilini aparır. Bu, isə çox mürəkkəb fəlsəfi mədəniyyət və hər şeydən

öncə, sosial fəlsəfə çərçivəsi daxilində mümkündür.

3. İdarəetmənin şəxsləndirmə və şəxsləndirilmə problemi nə fəlsəfi biliksiz, nə də sosial-fəlsəfi təhlil əsasında mümkündür.

4. İdarəetmə təsiri vasitəsi kimi informasiyanın fəlsəfi təhlili.

5. İdarəetmə və özünütəşkilin, insan və cəmiyyətin təbii və sosial özünütəşkilinin uyğunlaşdırılması, uzlaşdırılması.

6. İdarəetmə və zorakılığın; idarəetmə və hakimiyyətin; idarəetmə və azadlığın; idarəetmə və ədalətin; idarəetmə və həmrəyliyin; idarəetmə və təhsilin uyğunlaşdırılması.

İdarəetmə fəlsəfəsinin tədqiqat vəzifələrinin strukturuna və problemlərinə həm də insanla, onun təfəkkürü, təbiəti və həyatının mənası ilə bağlı olan başqa məsələlər də daxildir" (4).

Müəllim auditoriyada olarkən aşağıdakı idarəetmə vəzifələrini yerinə yetirməklə uğur qazana bilər: 1. Konkret məqsəd; 2. Vasitələrin seçilməsi. 3. Vasitələrin hazırlanması. 4. Nəticələrə nəzarət.

Müəllim məqsədi düzgün müəyyənləşdirməli, məqsəddən irəli gələn vəzifələri seçib ayırmalı, uzağı görməli, alınacaq nəticəni qabaqcadan təsəvvürünə gətirməli, planlaşdırma aparmalı, təşkil etməyi bacarmalı, fəal olmalı, razılaşmaya əsaslanmalı, nəzarət etməli.

İdarəetmə müvafiq istiqamətdə öz fəaliyyətini nəzərdən keçirib, yeri gəldikcə, təshihlər aparmaqla bir sistemdən digər sistemə məqsədyönlü informasiya təsiri kimi də başa düşülə bilər.

Hazırda müasir təhsil sistemində "menecment" anlayışına da müraciət edilir. "Menecment" ingilis sözüdür, latın dilindəki "manus" sözündən alınmışdır. İlk əvvəllər anlayış heyvanları idarə etmək kimi anlaşılırdı. Atların idarə olunması sənəti kimi qəbul edilir, daha doğrusu, başa düşülürdü. Sonradan bu anlayış əmək fəaliyyətinə, o cümlədən sözün həqiqi mənasında, istehsalın bir sahəsi olan təhsilə gətirildi, elmin bir sahəsinə çevrildi və insanların və təşkilatların idarə olunması praktikasında özünə yer tutdu.

Bu anlayışla bağlı sözlər bunlardır: Manage – idarə etmək; manager – idarə edən, menecment - idarəetməyə cavabdeh şəxs.

O. Ya. Helixə görə, idarəetmə dedikdə, kollektivlərin və insan qruplarının şüurlu təşkil olunmuş, məqsədyönlü qarşılıqlı təsiri anlaşılır (О. Я. Гелих. Философия и методология управления: учебник для вузов).

V.Dalin fikrincə, idarəetmə - insan üçün əlverişli şəraitin yaradılması məqsədilə aparılan fəaliyyətdir (5).

İdarəetmə elə təşkil olunmalıdır ki, hər bir fərd, hər bir şəxs öz məqsədlərinə nail olmaq üçün, təbii ki, başqasının məqsəd və gözləntilərinə xələl gətirmədən, maksimum imkan qazanmaq, idarəetməni sosial dəyər səviyyəsinə gətirməkdir. Fəqət idarəetmənin nə demək olduğunu fəlsəfi-nəzəri əsasda təşkil etmədən, onun insan həyatında nə üçün meydana gəldiyini, insanların və cəmiyyətin inkişafında onun nə kimi rola malik olduğunu anlamadan, məqsədyönlü fəaliyyət, problemə fəlsəfi yanaşma olmadan idarəetmə işini, o cümlədən tələbə auditoriyasının idarəolunmasını müvəffəqiyyətlə qurmaq mümkün deyil.

Tələbə auditoriyasının səmərəli idarəolunmasında peşə bacarıqları da müstəsna dərəcədə böyük rol oynayır.

İdarəetmə bu və ya digər idarə və təşkilatla, bizim tədqiqatda ali məktəblə bilavasitə bağlı olan bir məsələdir. "Təşkilat" (ali məktəb) və "idarəetmə" bir-biri ilə qarşılıqlı əlaqədə, qarşılıqlı asılılıqda, qarşılıqlı fəaliyyətdə olan anlayışlardır.

İdarəetmə gözlənilən nəticənin əldə olunmasına yönələn, tənzimlənən, əlaqələndirilən birgə əməkdir. Ona görə də ali təhsil müəssisəsinin rəhbərləri tələbə auditoriyasının düzgün idarə edilməsi işində maraqlı olmalı, bunun üçün lazımi şərait yaratmalıdırlar.

Mövcud ədəbiyyatda qeyd olunduğu kimi, “Təşkilat” heç də yalnız insan mühitində deyil, hər şeydən əvvəl, bütün canlı və cansız təbiətdə mövcuddur. Qarışqa ailəsi, ekoloji sistemlər, kosmik tellərin və kainatın qarşılıqlı əlaqəsi – təbiətin müəssisələridir. İnsan təşkilatı da buraya daxildir. Onların hər biri xüsusi növ təşkilatlardır. Niyə görə? Çünki ağılla idarə olunan təşkilatlardır. “Təşkilat” anlayışından fərqli olaraq, “idarəetmə” anlayışı tərəfimizdən daha məhdud mənada – insan mənasında anlaşılır. Odur ki, idarəetməni biz insan təşkilatı və insan idarəetməsi ilə müqayisə edirik. İnsandan kənarda idarəetmə yoxdur.

Təbiət açıq sistemlərin özünütəşkili prinsipinə əsasən qurulur ki, burada tənzimləmə rasional şəkildə deyil, dissipativ sistemlərin xassəsi kimi spotan şəkildə həyata keçir, qaydaları xaosdan yaradır (6). Biz isə, idarəolunan insan təşkilatından söz açırıq. Yuxarıda deyildiyi kimi, bu təşkilat da insanların spotan özünütəşkil birliyi kimi qurulur. Lakin insanlar rasional fəaliyyət göstərən fərdlər olmaqdan savayı, həm də müəyyən mənada bioloji varlıqlar, təbiətin bir hissəsidirlər. İnsan mühitində “təşkilat” müxtəlif çalarlara malikdir. Bəzi hallarda “təşkilat” anlayışı insanların birgə fəaliyyətini yoluna qoymaq, qaydaya və nizama salmaq mənasında işlədilir. Biz nəyi isə, “təşkil etmək” deyirik. Burada təşkilat proses kimi başa düşülür. Başqa halda təşkilat daxili nizamasalınma və quruluşu əhatə edən obyekt kimi nəzərdən keçirilir. Təşkilatın elmi təhlili “sistem” anlayışı vasitəsi ilə aparılır. Təşkilat qarşılıqlı əlaqədə olan elementlərin sistemidir. Sistem - xarici əlaqələrdən daha güclü olan elementlərin məcmusu, daxili əlaqələrdir.

Xarici əlaqələr daxili əlaqələrdən güclü olduğu təqdirdə elementlərin belə məcmusu dağılır. Beləliklə, sistemlərdə maksimum şəkildə zəruri daxili əlaqələr və minimum zəruri xarici əlaqələr mövcud olur.

Açıq sistemlər xeyli dərəcədə məhz onun xarici əlaqələrinin müxtəlifliyi və genişliyi ilə özünə həyat qazanır. Açıq sistemlər – xarici mühitlə, digər sistemlərlə fəal qarşılıqlı mübadilə sayəsində mövcud olan sistemlərdir. İnsan təşkilatları, bəzi başqalarının “qapalı cəmiyyət” adlandırmalarına baxmayaraq, daimi açıq sistemlərdir. Nə üçün?

Ona görə ki, birincisi, insan təşkilatları insanlardan ibarətdir. Onlar atmosfer havasının oksigeni ilə nəfəs alır, təbiətin suyunu içir, qidalarında bioloji məhsullardan istifadə edirlər. Açıq sistemlər kimi insanlar “mühitlə qidalanırlar”.

İkincisi, müəyyən bir müəssisədə çalışan insanlar digər insanlardan ibarət təşkilatlarla qarşılıqlı əlaqədə olurlar.

Beləliklə, insan dünyasının əksər təşkilatları açıq sistemlər kateqoriyasına məxsusdurlar. Belə sistemlərin idarə olunması xarici fəal qarşılıqlı fəaliyyətdən kənarda qala bilməz. Təşkilat rəhbərləri eyni zamanda təşkilatın daxili əlaqələrinin möhkəmləndirilməsi qayğısına qalmalıdırlar.

Təşkilatın sistemli təhlili daha bir üstünlük üçün əsas olur. Bu, ona qoşa nisbətdə, münasibətdə olan fəlsəfi kateqoriya vasitəsilə yanaşmağa imkan verir: sistem-altsistemlər-elementlər-struktur-funksiyalar; hissə və tam (əgər tam onun hissələrindən daha həcmlidirsə); vahid-xüsusi-ümumi vasitəsilə; forma və məzmun, təzahür və mahiyyət, səbəb və nəticə, səbəb,

bəhanə, zərurət və təsadüf, imkan və gerçəklik.

Həmçinin daha konkret kateqoriyaların vasitə kimi götürülməsi: informasiya, məqsəd, missiya, təşkilatlar və s. bütün bunlar təşkilatın təhlilində geniş imkanlar yaradır.

Hazırda idarəetmə "təşkiletmənin (təşkilatın) nəzəriyyəsi" və eyni zamanda "idarəetmənin nəzəriyyəsi" kimi elmi və tədris fənnini diqqət mərkəzinə gətirir.

İdarəetmə nəzəriyyəsi belə bir suala cavab axtarır: təşkilatda rəhbər hansı yeri tutmalıdır, onun səlahiyyətləri və məsuliyyət dərəcəsi nədən ibarət olmalıdır və bu nöqteyi-nəzərdən bu təşkilatın optimal quruluşu necə olmalıdır?

Təşkiletmə (təşkilat) nəzəriyyəsi bu məsələyə bir qədər daxildən yanaşır: yüksək nəticələrə nail olmaq üçün optimal quruluşu necə formalaşdırmalı və bu baxımdan onun rəhbərinin və rəhbərlərinin səlahiyyətləri və məsuliyyət dərəcəsi necə olmalıdır?

Bütün bu məsələlərin həllində idarəetmə fəlsəfəsi köməyə gəlir. Fəlsəfə təşkiletmənin (təşkilatın) və idarəetmənin fəlsəfi təhlilini verərək, insan təşkilatının və idarəetmənin təşkilati imkanlarının təhlilinin dərin metodoloji imkanlarını meydana çıxarır.

İdarəetmə sosiallaşmanın və həm də ictimai münasibətlərin bir hissəsidir. Bu elə mühüm hissə, elə mühüm sosial fenomendir ki, ondan kənarda insanların sosiallaşması və birgə həyatı sadəcə mümkün deyil. İdarəetmə insan, şəxsiyyətlərarası və ictimai münasibətlərin şüurlu şəkildə əlaqələndirilməsidir. İdarəetmə insanların şəxsiyyətlərarası münasibətlər sahəsində və daha sonra ictimai münasibətlər sahəsində təşəkkül tapıb formalaşır.

Bu münasibətləri əlaqələndirən və tənzimləyən, sistemli şəkildə təsir göstərən mərkəz yaranır. İdarəetmə fəlsəfəsi bu zaman sosial fəlsəfənin mühüm aspekti kimi özünü göstərir. Elmi istiqamət kimi idarəetmə fəlsəfəsinin predmeti isə, mərkəzin sosial münasibətlərini tənzimləyən tədqiqat xarakteri alır və bu münasibətlərə məqsədyönlü şəkildə təsir edən və eyni zamanda onun mahiyyətini əks etdirən səciyyəvi alətə çevrilir. Beləliklə, idarəetmə fəlsəfəsi ictimai və şəxsiyyətlərarası münasibətlərin səciyyəvi və nisbətən müstəqil hissəsi kimi idarəetmə fenomenini tədqiq edir.

İdarəetmədə güc tətbiq olunurmu? Hətta idarəetmədə də, o cümlədən tələbə auditoriyasının idarə olunmasında da müəyyən təzyiqlərə yol verilir.

Bu təzyiq hansı səviyyədədir? Müəllim təlim prosesində, tərbiyə işləri apararkən öz məqsədinə çatmaq üçün bəzən təzyiq vasitələrindən də istifadə edir.

Bu, əxlaqi baxımdan necə qiymətləndirilməlidir? Tələbə ilə iş zamanı vadaretmədən istifadə edən müəllimlərin hərəkətləri pedaqoji baxımdan necə qəbul edilməlidir? Təzyiq və vadaretmə yolu ilə xeyirxahlığa nail olmaq mümkündürmü?

İdarəetmədə ədalətli və eyni zamanda güclü olmaq - sosial və işgüzar nailiyyətlərdən ötrü daha önəmlidir.

İngilis mütəfəkkiri F.Bekonun "insan qüdrətinin işi və məqsədi yeni təbiəti, yaxud təbiətləri yaradıb öz bədəninə məlumat versin" (7) kəlamı idarəetmə mənası daşıyır. İnsanın ləyaqəti onun malik olduğu etikada, davranışında, ünsiyyətində, rəftarında, nitqində əsaslandığı etik qaydalardır.

Deyilənləri tələbə auditoriyasını idarə edərkən yada salmaq faydalı olardı.

Qeyd etmək lazımdır ki, tələbə auditoriyasının idarəolunması üzrə işin fəlsəfi əsaslarının diqqət mərkəzinə gətirilməsi öz aktuallığı ilə seçilir. Ona görə də, bu problemə həsr olunmuş tədqiqat əsərlərinin yaranmasına ehtiyac vardır.

***Rəyçi: prof. A.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Секацкий А. Два ларца, бирюзовый и нефритовый. СПб., 2008.
2. Гумбольдт В. Избранные труды по языкознанию. М., 1984.
3. Ожегов С. Словарь русского языка. М., 1973.
4. http://help-studenty.ru/?p=8
5. Даль В. Толковый словарь живого великорусского языка: В 4 т. Т. 1. М.: Терра – Книжный клуб, 1998.
6. См.: Гелих О. Проблема саморазвития в менеджменте (синергетический подход) // Теория организации и основы менеджмента / Под ред. В.А. Абчука. СПб.: Изд-во РГПУ им. А.И. Герцена, 2001.
7. Бэкон Ф. Новый Органон. Книга вторая афоризмов об истолковании природы, или О царстве человека // Бэкон Ф. Сочинения. В 2-х т. – Т. 2. – М.: Мысль, 1978.
8. Əlizadə Ə., Əlizadə H. Pedaqoji psixologiya. Bakı, 2010.
9. Xəlilov S. Təhsil. Təlim. Tərbiyə. Bakı, 2015.

**С.Мамедов**

**Философские основы работы по управлению студенческой аудиторией**

**Резюме**

Суть управления студенческой аудиторией заключается в том, чтобы студенты и студентки имели возможность расти как будущие специалисты, удовлетворили потребности воспитания и образовательного труда. Иными словами, в аудитории должна быть такая атмосфера, чтобы студенты посещали занятия не из-за необходимости присутствия на лекциях и семинарах, а участвовали в процессе обучения с энтузиазмом и рвением из-за встреч с профессорами, доцентами, ассистентами, из-за интересных лекций и приобретения новых знаний и жизненных навыков. В статье можно более подробно ознакомиться с философскими основами работы по управлению студенческой аудиторией.

**S.Mammadov**

**Philosophical foundations work on the student audience management**

**Summary**

The essence of the student audience of management is to ensure that students and students had the opportunity to grow as future professionals, satisfy the needs of education and educational work. In other words, the audience has to be such an atmosphere, the students attended classes not because of the necessity of the presence at lectures and seminars and participated in the process of learning with enthusiasm and zeal due to meet with professors, assistant professors, assistants, due to interesting lectures and the acquisition of new knowledge and life skills. The article can be found in more detail with the philosophical foundations of the work on the student audience management.

***İdarəetmə məsələləri***



# DÖVLƏT QAYĞISI CAVABSIZ QALMIR

**Mədinə Nurməmmədova,**
***Xaçmaz Rayon Təhsil Şöbəsinin müdiri***

***Açar sözlər:*** *davamlı inkişaf, kadr potensialı, təhsildə keyfiyyət, maliyyələşmə mexanizmi.*

***Ключевые слова:*** *устойчивое развитие, кадровый потенциал, качество образования, механизм финансирования.*

***Key words:*** *sustainable development, staff potential, the quality of education, financing mechanism.*

Müstəqil Azərbaycanın qurucusu kimi bütün sahələrdə islahatların əsasını qoymuş, inkişaf istiqamətlərini müəyyənləşdirmiş ulu öndər Heydər Əliyev Azərbaycan təhsilindən danışarkən onun başlıca məqsədini belə ifadə etmişdir: "İndi bizim təhsilimizin məqsədi gənc nəslə, uşaqlara təhsil verib onları gələcəyə hazırlamaqdır. Amma bununla yanaşı, ən böyük məqsədi Azərbaycan vətəndaşı hazırlamaqdır, müstəqil Azərbaycan cəmiyyətinin ləyaqətli üzvünü hazırlamaqdır".

Yeni əsrin ilk onillikləri müstəqil Azərbaycan dövlətinin hərtərəfli uğurları ilə yaddaşlara yazılır. Ölkəmizdə aparılan tikinti quruculuq işləri həyata keçirilir, sosial-iqtisadi sahələrdə nailiyyətlərin ildən-ilə artırılması dönməz xarakter almış, ölkəmizdə reallaşdırılan tədbirlər beynəlxalq aləmdə dövlətimizin nüfuzunu artırmışdır. Respub-likamızda keçirilən idman yarışları da Azərbaycanı dünyaya qabaqcıl, müasir, güclü dövlət kimi təqdim edir.

Son illərdə təhsil sistemində davamlı inkişafa yönəlmiş proqram və layihələrin həyata keçirilməsi, təhsilimizin inkişafı üçün çox dəyərli sərəncamların imzalanması milli təhsilimizin inkişaf etdirilməsi baxımından çox əhəmiyyətlidir.

"2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı", "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası", ali təhsil müəssisələrində yeni maliyyələşmə mexanizminin tətbiq edilməsi standartlarına cavab verən təhsilin qurulması və yüksəkhazırlıqlı kadr potensialının formalaşdırılması vəzifəsi qarşıya qoyulmuşdur.

Milli təhsilimizə olan dövlət qayğısı nəticəsində təhsilin maddi-texniki bazasının möhkəmləndirilməsi istiqamətində xeyli işlər görülmüşdür. Hər il respublikamızda yeni-yeni məktəblər tikilərək müəllim və şagirdlərimizin istifadəsinə verilir.

Son illər rayonumuzda 43-dən artıq yeni məktəb tikilmiş, bəzi məktəblərimizdə cari və əsaslı təmir işləri görülərək şagirdlərimizin istifadəsinə verilmişdir. Xaçmaz şəhər 7 nömrəli tam orta məktəbin 360 yerlik yeni binası inşa edilmiş, köhnə tədris korpusu ilə birləşdirilmişdir. Yeni məktəbdə müasir istilik sistemi quraşdırılmış, fənn kabinetləri, laboratoriyalar, kompüter otağı və idman zalı müasir avadanlıqlarla təchiz olunmuşdur. Xaçmaz şəhər 7 nömrəli tam orta məktəbin müəllim və şagirdləri yeni dərs ilini yeni-müasir məktəbdə qarşılayacaqlar.

Bunlarla yanaşı bu gün rayonda 30-a yaxın məktəb üçün yeni binaların tikilməsinə, layihə üzrə tikilmiş 19 və bir neçə uyğunlaşdırılmış binalarda fəaliyyət göstərən məktəblərimizin əsaslı təmir edilməsinə ehtiyac hələ də qalmaqdadır.

Rayonun Aşağı-Zeyid, Alıc-qışlaq, Dədəli, Hülövlü, Müqtədir, Əhmədoba, İlxıçı, Mürşüdoba, Xaçmaz şəhər 5 nömrəli tam orta, Armudpadar, Çılğır, Ağtala, Padar, Mollabürhan məktəbləri müasir tələblərə cavab verməyən binalarda fəaliyyət göstərirlər.

Rayonun birtipli layihə üzrə tikilmiş Xaçmaz şəhər 6 nömrəli, Xudat şəhər 2 nömrəli, Yeni Həyat, Yalama, Həsənqala, Alekseyevka, Qusarçay, Yergüc, Qımılqışlaq və Hacəlibəy kənd tam orta məktəblərinin əsaslı təmirə və yenidənqurulma işlərinə olan ehtiyac hələ də qalmaqdadır.

2015/2016-cı tədris ilində 56 tam orta, 33 ümumi orta, 34 ibtidai və 6 məktəbdənkənar təhsil müəssisələri fəaliyyət göstərib.

“Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminatı Proqramı”na əsasən rayonun 88 ümumtəhsil məktəbi 821 ədəd kompüterlə təchiz olunmuş, hazırda rayonun 27 məktəbi internet şəbəkəsinə qoşulmuşdur.

Məlum olduğu kimi, Azərbaycan Respublikası Prezidentinin 7 dekabr 2015-ci il tarixli, 698 nömrəli fərmanına əsasən Təhsil Nazirliyinin əmri ilə 1 aprel 2016-cı il tarixdən Ərazi Maliyyə Hesablaşma mərkəzləri fəaliyyətə başlamışdır. Bu mərkəzlər təhsil müəssisələrinin təmiri və təchizatı sahələrinə rəhbərlik edir və yerli təhsil idarəetmə orqanları ilə fəaliyyətlərini əlaqələndirir.

Ötən tədris ilində rayonun ümumtəhsil məktəblərinə 26809 nəfər şagird təhsilə cəlb olunmuş, 1568 sinif komplekti fəaliyyət göstərmişdir. IX siniflərə cəlb olunmuş şagirdlərdən 1980 nəfəri, XI siniflərdə təhsil alan 1581 nəfərdən 1566 nəfəri təhsillərini başa vurmuş, onlara müvafiq olaraq şəhadətnamə və attestatlar verilmişdir.

Rayon Təhsil Şöbəsi ümumtəhsil məktəblərində dərslik fondunun yaradılması və qorunub saxlanması istiqamətində bir sıra tədbirlər həyata keçirmişdir. Hər il olduğu kimi ötən tədris ilində də I-XI siniflər üçün dövlət hesabına çap olunmuş 137 adda, 108950 ədəd dərslik və müəllimlər üçün 76 adda 5706 ədəd dərs vəsaitləri Təhsil Nazirliyindən alınaraq bölgü əsasında ümumtəhsil məktəblərinin şagirdlərinə paylanmışdır.

Yeni dərs ilindən təhsil müəssisələrinin IX siniflərində fənn kurikulumları əsasında yeni proqram və dərsliklərlə tədrisə başlayırlar. Məktəblərə IX siniflər üçün yeni dərsliklər və dərs vəsaitləri paylanmışdır.

Təhsildə keyfiyyətin təmin olunması məqsədilə Təhsil Şöbəsinin Metodiki Kabineti “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın proqramından irəli gələn vəzifələrin icrası baxımından müəyyən tədbirlər həyata keçirmişdir. Belə ki, bu məqsədlə fənn müəllimləri üçün sentyabr bölmə iclasları, fənn kurikulumlarının tələblərinə uyğun olaraq hər ay Xaçmaz və Xudat şəhərlərində fənlər üzrə müəllimlər üçün təlimatı və praktik seminarlar təşkil olunmuş, müəllimlərin ixtisasının artırılması diqqət mərkəzində saxlanmış, eləcə də fənn kurikulumları ilə işləyən müəllimlər üçün təlim kursları təşkil olunmuşdur.

Təhsil müəssisələrində şagirdlərimizin milli-mənəvi dəyərlər, vətənpərvərlik ruhunda tərbiyəsinin gücləndirilməsi istiqamətində onların iştirakı ilə müxtəlif məzmunlu tədbirlər həyata keçirilmişdir. Ölkəmizin tarixinin, mədəniyyətinin, adət-ənənələrinin öyrənilməsi məqsədilə rayonumuzun bir qrup məktəbli gəncləri Naxçıvan, Gəncə və Qəbələ şəhərlərində olaraq “Ölkəmizi tanıyaq” devizi altında maarifləndirici tur-aksiyalarda iştirak etmişdir.

Uşaq və gənclərin milli-mənəvi və ümumbəşəri dəyərlərə hörmət ruhunda tərbiyə olunması məqsədilə ümumtəhsil məktəblərinin IX-XI sinif şagirdləri arasında “Milli-mənəvi dəyərlər haqqında düşüncə-

lərim" mövzusunda üç mərhələdən ibarət inşa yazı müsabiqəsi keçirilmişdir. Müsabiqənin qalibi Köhnə Xaçmaz kənd tam orta məktəbinin şagirdi Mənsurə İbrahimova Respublika mərhələsində iştirak edərək II yerə layiq görülmüşdür.

VIII-XI sinif şagirdləri arasında "Mənim doğma Xaçmazım" mövzusunda keçirilmiş inşa yazı müsabiqəsi rayonumuzun inzibati rayon kimi təşkil olunmasının 85 illiyinə həsr olunmuşdur. Müsabiqədə şagirdlərimiz rayonumuzun tarixi keçmişi, tarixi abidələri, milli adət-ənənələrimiz, rayonumuzda aparılmış abadlıq-quruculuq işlərindən geniş bəhs olunmuşdur.

Təhsil Nazirliyinin müvafiq əmrinə əsasən məktəblilər arasında "Ədəbiyyat biliciləri" müsabiqəsi keçirilmiş, müsabiqədə rayonun Xaçmaz şəhər 8 nömrəli, Xudat şəhər 3 nömrəli və Müqtədir qəsəbə tam orta məktəbinin şagirdləri respublika turunda iştirak edərək diplom və tərifnamələrlə təltif olunmuşdur.

Məktəblilər arasında "Ekoerudit" ekoloji-bilik yarışmasının rayon və zona yarışları keçirilmiş, rayonun Xaçmaz şəhər 2 nömrəli tam orta məktəbinin komandası rayon və zona yarışlarında qalib gəlmişdir. Məktəblilərimiz respublika mərhələsində də iştirak etmiş, II yerə layiq görülərək diplom və hədiyyələrlə təltif olunmuşdur. Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsi "İstedadlı Uşaqlar Festivalı-2016" müsabiqəsində əl işləri nominasiyası üzrə Qobuqıraq kənd ümumi orta məktəbin IX sinif şagirdi fərqlənərək diplom və hədiyyə ilə qiymətləndirilmişdir.

Önəmli tədbirlərdən biri də dahi şəxsiyyət ümummilli lider Heydər Əliyevin 93-cü ildönümünə həsr olunmuş "Ən yaxşı təqdimat" müsabiqəsidir. Müsabiqədə 79 nəfər şagird iştirak etmiş, bunlardan 16 nəfəri fərqlənmişdir. Xaçmaz şəhər 2 nömrəli tam orta məktəbin IX sinif şagirdi respublika mərhələsində iştirak edərək III yerə layiq görülmüş, ona "Gülüstan" sarayında keçirilmiş mükafatlandırma mərasimində diplom və noutbuk hədiyyə təqdim olunmuşdur.

Rayon mərhələsində fərqlənmiş 15 nəfər məktəbli isə YAP Xaçmaz Rayon Təşkilatı və Rayon Təhsil Şöbəsinin diplom və hədiyyələri ilə mükafatlandırılmışdır.

2016-cı ilin "Multikulturalizm ili" elan edilməsi ilə əlaqədar olaraq təhsil müəssisələrində bir sıra tədbirlər həyata keçirilmişdir. Rayonumuzda 22-dən artıq milli azlıqların nümayəndələri yaşayır, onların övladları bir yerdə təhsil alırlar. İyunun 24-də Mədəniyyət və Turizm Nazirliyi və Xaçmaz Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə "Multikultural dəyərləri yaşadaq" adlı beynəlxalq festival keçirilmiş, burada rayon məktəblilərinin müxtəlif nominasiyalar üzrə əl işləri də nümayiş etdirilmişdir.

Təhsil şöbəsi ötən tədris ilində məktəbli gənclərin hərbi vətənpərvərlik tərbiyəsini daim diqqət mərkəzində saxlayaraq məktəbli gənclər arasında idman və şahmat yarışları təşkil olunmuşdur. "Şahin" hərbi idman oyunlarının rayon mərhələsi keçirilmişdir. Xaçmaz şəhər 9 nömrəli tam orta məktəbin komandası rayon və zona yarışlarında fərqlənmiş, respublika mərhələsində isə 32 komanda arasında V yerə çıxaraq diplom və hədiyyələrlə təltif olunmuşdur.

Xaçmaz şəhər 5 nömrəli tam orta məktəbin "Gənc xilasedici və yanğınsöndürənlər" komandası Qəbələ şəhərində keçirilmiş Respublika mərhələsində VII yerə layiq görülmüşdür.

Ötən tədris ilində rayon məktəbliləri bir sıra müsabiqə, bilik yarışları və fənn olimpiadalarında iştirak etmiş və uğurlu nəticələr əldə olunmuşdur.

Məktəblilərin beynəlxalq fənn olimpiadalarına hazırlıqla əlaqədar Təhsil Nazirliyinin (25.08.2015, əmr № 912) əmrinə əsasən VII-VIII sinif şagirdləri arasında riyaziyyat, fizika, kimya, biologiya və

informatika fənləri üzrə 3 turdan ibarət fənn müsabiqəsi təşkil olunmuşdur. Müsabiqədə qeyd olunmuş fənlər üzrə 70 nəfər məktəbli iştirak etmişdir. Müsabiqənin üç turunun nəticələrinə görə riyaziyyat fənni üzrə rayonun Qaracik-Zeyid kənd, Nərəcan, Xaçmaz şəhər 1 və Xudat şəhər 3 nömrəli, biologiya fənni üzrə Xaçmaz şəhər 2, 6, 8 nömrəli tam orta məktəblərinin şagirdləri daha yüksək nəticələr əldə edərək respublika mərhələsində iştirak etmək hüququ qazanmışlar. Fizika və kimya fənləri üzrə müsabiqədə məktəblərdən az sayda şagirdlər iştirak etmişdir. Kənd ümumtəhsil məktəblərində istedadlı şagirdlərin aşkar edilməsi, onların müsabiqə, yarış və olimpiadalarda iştirakı məktəb rəhbərlərinin diqqət mərkəzində saxlanılmalıdır.

Ötən tədris ilində fənn olimpiadalarına hazırlıqla əlaqədar seçim turunda rayonun təhsil müəssisələrindən 7 fənn üzrə 463 şagird iştirak etmişdir.

Fənn olimpiadalarının rayon turunda 181 nəfər məktəbli iştirak etmiş, onlardan 41 nəfəri zona mərhələsində iştirak hüququ qazanmışdır. İnformatika fənni üzrə olimpiada internet vasitəsi ilə keçirilmiş, rayonun Xaçmaz 1, 6, 8 və Xudat 1 nömrəli, Çiləgir, Niyazabad və s. məktəblərin şagirdləri olimpiadada mümkün olan balı qazana bilməmişlər. Qeyd etmək istərdim ki, məktəblərimizin çoxunda internetin olmaması və ya zəif olması nəticəsində məktəblilər bu yarışmada zəif iştirak etmişlər.

Fənn olimpiadalarının zona mərhələsində rayonun Xaçmaz şəhər 8 nömrəli məktəbin 2, Xaçmaz şəhər 6 nömrəli məktəbin 1 nəfər şagirdi coğrafiya fənnindən, Hülövlü kənd tam orta məktəbinin məktəblisi isə tarix fənnindən keçid ballarını toplayaraq respublika mərhələsində iştirak etmək hüququ qazanmışdır.

Xaçmaz rayonu üzrə buraxılış imtahanlarının nəticələri ötən illərlə müqayisədə nisbətən yaxşılaşmışdır. Dövlət İmtahan Mərkəzinin IX və XI siniflər üzrə keçirdiyi buraxılış imtahanlarında IX siniflər üzrə 1980, XI siniflər üzrə isə 1566 nəfər şagird iştirak etmişdir. Hər iki təhsil pilləsi üzrə buraxılış imtahanlarının nəticələri əvvəlki illərlə müqayisədə nisbətən yüksək olmuşdur.

IX siniflər üzrə buraxılış imtahanlarında rayonun Xaçmaz şəhər 8 nömrəli məktəb-lisey, İlxıçı, Müqtədir, Nabran, Xaçmaz şəhər 6 nömrəli tam orta, Bayoba, Xudat şəhər 5 nömrəli ümumi orta məktəblərinin şagirdləri imtahanlarda yüksək nəticələrə nail olmuş, rayonun Əbilyataq, Aşağı-Zeyid, Həsənqala, Uzunoba kənd tam orta, Fərzəlioba kənd ümumi orta məktəblərinin imtahan nəticələri nisbətən zəif olmuşdur.

XI siniflər üzrə buraxılış imtahanlarında rayonun Xaçmaz 1, 6, 8 nömrəli şəhər, Müqtədir, Qaracik-Zeyid və Nabran kənd tam orta məktəblərinin şagirdlərinin imtahan göstəriciləri digər məktəblərlə müqayisədə daha yüksək olmuşdur.

Rayonun Yergüc, Uzunoba, Sayad, Palçıqoba, Gülalan, Mürşüdoba və Qoçaqlı kənd tam orta məktəbləri isə imtahanlarda zəif nəticələr göstərmişdir. Buraxılış imtahanlarının nəticələri Təhsil Şöbəsinin şura iclasında müzakirə olunmuş, yüksək nəticələr əldə etmiş məktəblərin müsbət işi qeyd edilmiş, nəticələri zəif olan məktəblərə isə işlərində dönüş yaradılması tövsiyə olunmuşdur.

Təhsil Şöbəsi rayonun ümumtəhsil məktəblərinin buraxılış siniflərində imtahanlara hazırlıq sahəsində bir sıra təbirlər həyata keçirmişdir. Belə ki, dərs ili boyu təhsil şöbəsinin əməkdaşları məktəblərə təhkim olunmuş, buraxılış siniflərində ümumməktəb valideyn iclasları keçirilmiş və həmin siniflərdə diaqnostik qiymətləndirmə aparılmışdır. Görülmüş tədbirlərin nəticəsidir ki, buraxılış siniflərində şagirdlərin imtahan nəticələri xeyli yaxşılaşmışdır.

Rayonumuzun buraxılış imtahanlarında qazanılan uğurlar bu ilin qəbul imtahanlarının nəticələrində də öz təsdiqini tapmışdır.

Ötən tədris ilində buraxılış imtahanlarında iştirak etmiş 1566 nəfər məzundan 656 nəfəri ali məktəblərə qəbul imtahanlarında iştirak etmişdir. Məzunlarımızın 335 nəfəri respublikamızın ali təhsil müəssisələrinə qəbul olunmuşdur. Bunlardan 272 nəfəri cari tədris ilinin məzunlarıdır.

Qəbul imtahanlarında məzunlarımızdan 44 nəfəri 500-dən, 9 nəfəri isə 600-dən yuxarı bal toplamışdır. Bu gün qəbul imtahanlarında yüksək bal toplamış bir qrup məzunlarımız konfransımızda iştirak edir.

Rayonun Akademik Z.Əliyeva adına Xaçmaz şəhər 8 nömrəli tam orta məktəbinin məzunu Rəfiqə Əliyeva qəbul imtahanlarında ən yüksək nəticə göstərərək 657 balla Azərbaycan Dövlət İqtisad Universitetinə qəbul olunmuşdur.

Ali məktəblərə qəbul imtahanlarında rayonun Xaçmaz şəhər 6, 8 nömrəli, Xudat şəhər 3 nömrəli, Yeni-Həyat, Qımıl-qışlaq və Çarxı kənd tam orta məktəbinin məzunları 500-dən yuxarı nəticə göstərərək respublikamızın müxtəlif ali məktəblərinə qəbul olmuşdur.

Yüksək bal toplamış məzunlarımızdan 106 nəfər I, 83 nəfər II, 58 nəfər III, 22 nəfəri IV, 3 nəfəri isə V qrupa aid ixtisasları seçmişdir.

2015-ci ilin qəbul imtahanlarına nisbətən bu ilki qəbul imtahanlarında 57 nəfər artım müşahidə olunmuşdur.

Müqayisə üçün bildirirəm ki, Xaçmaz rayonu üzrə 2006-cı ildə ali məktəblərə 134 nəfər qəbul olunmuşdursa, 2016-cı ildə əvvəlki illərin məzunları ilə birlikdə 335 nəfər olmuşdur. 2006-cı ildə rayon üzrə məzunlardan 3 nəfəri 500-dən yuxarı bal toplamış, 600-dən yuxarı nəticə göstərən olmamışdır. 2016-cı ildə isə 500-dən yuxarı nəticə göstərən məzunların sayı 44, 600-dən yuxarı bal toplamış məzunların sayı isə 9 nəfər olmuşdur. Müqayisədən göründüyü kimi, ali məktəblərə qəbul olunanların və yüksək bal toplamış məzunlarımızın sayında illər üzrə artım müşahidə olunmuşdur.

İllərlə ali məktəblərə daxil olanların sayında artım olduğu kimi, yüksək bal toplayanların sayı da ilbəil artmışdır. Belə ki, 2014/2015-ci dərs ilində 28 nəfər məzun 500-dən yuxarı nəticə göstərmişdirsə, bu il ali məktəblərə sənəd verənlərin 44 nəfəri 500-dən yuxarı bal toplayaraq ali təhsil müəssisələrinə qəbul olmaq imkanı qazanmışdır.

Qeyd etmək istərdim ki, ali məktəblərə qəbul imtahanlarında məzunların topladığı ballar üzrə müşahidə edilən artım tempi “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın müəyyən etdiyi hədəflərə uyğun həyata keçirilən tədbirlərin, müəllim və şagirdlərin səmərəli əməkdaşlığının yaxşı təşkili sayəsində mümkün olmuşdur.

Pedaqoji prosesin müvəffəqiyyətli təşkili və aparılmasında müəllim amili aparıcı rol oynayır. Nə qədər müasir texnologiyalardan istifadə olunsa da, müəllim amili pedaqoji prosesdə əvəzolunmaz bir qüvvə kimi qalmaqdadır. İslahatlar dövründə yeni pedaqoji innovasiyaların tətbiq olunması istər-istəməz müəllim amilinə olan tələbi daha da artırmışdır.

Yeni dərs ili üçün müxtəlif fənlər üzrə 70 nəfər vakant yer göstərilmişdir. Bu gün 47 nəfər müəllim boş vakant yerləri yüksək bal toplayaraq tutmuşlar.

Müəllimlərin diaqnostik qiymətləndirilməsinin də keçirilməsi məktəblərin müəllim kadrlarının inkişafı üçün təşkil olunan tədbirlərdən hesab edilir və bu tədbir təlimin keyfiyyətinin yüksəldilməsində başlıca amillərdən biri kimi dəyərləndirilir. Ötən il dekabr ayında rayonumuz üzrə keçirilmiş bu qiymətləndirmədə 2342 nəfər

müəllim iştirak etmişdir. Bu tədbirlərin keçirilməsi onların fənn bilikləri və peşəkarlıq səviyyəsini, eləcə də yeni texnologiya ilə işləmə bacarıqlarını müəyyənləşdirməyə imkan yaradır. Müəllim təhsil verməklə yanaşı, ömrü boyu öyrənməli, özünü inkişaf etdirməklə məşğul olmalıdır. Bunu onun işinin xüsusiyyəti tələb edir.

Müasir şəraitdə yeniləşən müasir informasiya cəmiyyətində uşaq və gənclərin vətənpərvərlik ruhunda milli-mənəvi dəyərlər əsasında formalaşdırılmasında mühüm əhəmiyyəti vardır. Bu sahədə məktəbdənkənar təhsil müəssisələrinin mühüm əhəmiyyəti vardır.

Hazırda rayonumuzda 6 məktəbdənkənar müəssisə fəaliyyət göstərir. Dövlətimizin təhsilə olan qayğısı nəticəsində müasir tələblərə cavab verən İdman və Şahmat məktəbləri fəaliyyət göstərir. Burada gənclərin asudə vaxtlarının səmərəli təşkili rayon və respublika səviyyəsində yarışlarda iştirak etmələri üçün hər cür şərait yaradılmışdır. Belə ki, rayonumuzda fəaliyyət göstərən məktəbdənkənar müəssisələrdə müxtəlif adda dərnəklər, idman bölmələri və dərnəklər təşkil olunmuşdur.

Gənc nəslin təlim-tərbiyəsində, onların milli və ümumbəşəri dəyərlər ruhunda tərbiyə olunması da müəllimlərin pedaqoji fəaliyyətindən asılıdır.

Təhsildə keyfiyyətin idarə olunmasında əsas rol oynayan yeni qiymətləndirmə sisteminin tətbiqi təhsil işçilərinin qarşısında duran mühüm vəzifələrdəndir. Bununla əlaqədar olaraq Təhsil Şöbəsi tərəfindən bir sıra məktəblərdə təlim-tərbiyə prosesinin monitorinqi aparılmış, buraxılış siniflərində imtahanların nəticələri Dövlət İmtahan Mərkəzinin ali məktəblərə qəbul imtahanlarının statistik göstəriciləri, mövcud nöqsan və çatışmazlıqlar məktəb direktorlarının iştirakı ilə Təhsil Şurasında müzakirə olunmuşdur.

Pedaqoji kollektivlərimiz təhsilin keyfiyyətinin yaxşılaşdırılması istiqamətində səylərini artırmaqla, təhsil sahəsində Dövlət Proqramının qarşıya qoyduğu vəzifələrin həyata keçirilməsinə səylə çalışmaqdadırlar.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat


1. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı”. // Azərbaycan məktəbi, 2015, №1.
2. Cabbarov M. Təhsil dövlət siyasətinin prioritetləri sırasında ilk yerlərdən birini tutur. // Azərbaycan məktəbi, 2015, №2.
3. Azərbaycan Respublikasının təhsil naziri M.Cabbarovun Azərbaycan müəllimlərinin XIV qurultayında məruzəsi. // Azərbaycan məktəbi, 2014, №1.
4. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. // Kurikulum, 2009, №2.
5. Azərbaycanda müəllimlər təhsil islahatları kontekstində öz peşəkarlıqlarını necə dərk edirlər. // Azərbaycan məktəbi, 2016, №4.


**М.Нурмамедова**

**Государственная забота не остается без ответной**

**Резюме**

В статье говорится об оказанной заботе к образованию со стороны государства. Повествуется о достижениях Хачмазского образования и о предстоящих задачах в этой области.

**M.Nurmammadova**

**State care doesn’t remain without respond**

**Summary**

The article is dedicated to the state care to education, educational achievements in Khachmaz region and challenges ahead.



# MÜSBƏT DİNAMİKAYA DOĞRU

**İxtiyar Hüseynov,**
***Qəbələ Rayon Təhsil Şöbəsinin müdir müavini***

***Açar sözlər:*** *dinamika, maddi baza, göstəricilər, keyfiyyət.*
***Ключевые слова:*** *динамика, материальные ресурсы, производительность, качество.*
***Key words:*** *dynamics, material resources, performance, quality.*

Son illərdə milli təhsilimizin inkişafı üçün ölkəmizdə həm hüquqi, həm də maddi baza yaradılmış, təhsil müəssisələrinin infrastrukturunun müasir tələblər səviyyəsində yenilənməsi istiqamətində əsaslı işlər görülmüşdür. Elektron hökumətin qurulması elementlərindən biri kimi, təhsil sahəsində də xüsusi proqram əsasında məlumat bazası yaradılmış, təhsil müəssisələri tərəfindən yeni proqram əsasında məktəblərin pedaqoji heyəti, şagirdlər, texniki işçilər haqqında məlumatlar, həmçinin maddi bazaya aid olan digər saytların işlənməsi başa çatdırılmışdır.

Ölkənin ən öndə gedən regionlarından biri olan Qəbələdə 68 ümumtəhsil məktəbi, o cümlədən 53 tam orta, 12 ümumi orta, 3 ibtidai məktəb fəaliyyət göstərir. Bu məktəblərdə 16087 şagird təhsil alır, onların təlim-tərbiyəsi ilə 2266 müəllim məşğul olur. Bunlardan əlavə rayonda 5 məktəbdənkənar tərbiyə müəssisəsinə 1171 nəfər dərnək üzvü cəlb olunmuşdur.

Rayonun ümumtəhsil müəssisələrində çalışan müəllimlərdən 418-i orta ixtisas təhsilli, 1848-i, yəni bütün müəllimlərin 81,6%-i ali təhsillidir. Müəllimlərin əksəriyyətini, yəni 1741 nəfərini qadınlar təşkil edir ki, bu da bütün təhsil işçilərinin 76,8 %-i deməkdir.

Rayonumuzun məktəblərində kadrların keyfiyyət tərkibinin yaxşılaşdırılması, onların elmi-metodiki hazırlığının yüksəldilməsi, eləcə də kadrlara olan ehtiyacın ödənilməsi istiqamətində müntəzəm iş aparılır. Bu məqsədlə müxtəlif ixtisaslar üzrə Təhsil Nazirliyinə 10 vakant yer təqdim olunmuş, həmin yerlər nazirlik tərəfindən aparılan yerdəyişmə və yeni işə qəbul imtahanlarından, o cümlədən fərdi söhbətlərdən keçərək işə qəbul olunan yeni müəllimlər tərəfindən tutulmuşdur.

Müasir dövrdə ümumtəhsil məktəblərinin qarşısında duran ən ümdə vəzifə şagirdlərə dərin, fundamental, keyfiyyətli təhsil vermək, ölkəmiz üçün vətənpərvər vətəndaş yetişdirməkdən ibarətdir. Hər bir müəllimin isə vəzifəsi təhsilalanların tələbatını sürətlə dəyişən dünya ilə uzlaşdırmaqdır. Bu isə hər bir müəllimin əsas işi olan dərs prosesindən keçir. Dərs müasir informasiyaların mərkəzində dayanan, daim yaradıcılıq tələb edən təlim texnologiyalarından biridir. Rayonda təlimin texniki vasitələrindən, informasiya-kommunikasiya texnologiyalarından, müasir elektron lövhələrdən istifadə etməklə öz dərslərini yüksək təlim göstəriciləri ilə quran müəllimlərimiz çoxdur. Anaxanım Məmmədova (şəhər 1 nömrəli), Kazımova Sədaqət (şəhər 2 nömrəli), Mirzəmmədova Məlahət (şəhər 4 nömrəli), Yusifova Diləfruz (Həmzəlli kənd), Şükürzadə Aidə (Bunud kənd tam orta məktəbi), Qasımova Mədinə (Vəndam qəsəbə 1 nömrəli tam orta məktəb) belə müəllimlərdəndir.

Fərəhli haldır ki, adları çəkilən qabaqcıl müəllimlərimizin əksəriyyəti gənc müəllimlərdir. Belə gənc müəllimlərimizdən biri Vəndam qəsəbə 1

nömrəli tam orta məktəbin riyaziyyat müəllimi Zöhrə Mirzəyevadır. O, 2015/2016-cı dərs ilində böyük uğurlara imza atmış, möhtərəm Prezidentimizin sərəncamı ilə Respublikanın “Əməkdar müəllimi” adına layiq görülmüşdür.

Ölkəmizdə aparılan təhsil islahatının mühüm və aparıcı tərkib hissələrindən biri milli kurikulumun yaradılması və həyata keçirilməsidir. 2016/2017-ci dərs ilində IX siniflərdə də təhsil kurikulumla aparılır və cari ildə ümumi orta təhsil kursu üzrə tədrisin kurikulumla aparılması prosesi başa çatmaq üzrədir. Bunun da nəticələri söz yox ki, təhsil prosesinə öz təsirini göstərəcəkdir.

Məktəblərdə təlim-tərbiyə işlərinə müntəzəm nəzarət məqsədilə təhsilyanı şura iclaslarında ən aktual məsələlər müzakirə edilir və qərarlar qəbul edilir. İl ərzində seçmə yolla bir sıra məktəblərdə əsas aparıcı fənlərin tədrisi vəziyyəti, I-VIII siniflərdə kurikulumla bağlı monitorinqlər keçirilmiş, nəticələr həm məktəblərin pedaqoji kollektivlərində, həm də təhsilyanı şura iclasında müzakirə olunmuşdur.

Görülmüş işlərin nəticəsidir ki, 2015/2016-cı dərs ilinin əsas təhsil göstəriciləri xeyli yaxşılaşmışdır. Keçən dərs ilinin yekunlarına görə müvəffəqiyyət faizi 99,9%, keyfiyyət göstəricisi isə 63,8 % olmuşdur.

Biliyi qiymətləndirilən 15762-şagirddən 3995 nəfəri əla, 6042 nəfəri isə “4” və “5” qiymətlərlə, qalanları isə, “3” və “4” qiymətlərlə yuxarı siniflərə keçmişlər.

IX siniflərdə şagirdlərin buraxılış imtahanlarının nəticələri ümumi orta təhsilin əsas göstəricisi hesab olunduğundan son üç ildə rayon üzrə IX siniflərdə buraxılış imtahanlarının nəticələri müqayisəli şəkildə öyrənilmişdir:

2013/2014-cü dərs ilində: 55,18%
2014/2015-ci dərs ilində: 60,47%
2015/2016-cı dərs ilində: 64,47%

Göründüyü kimi, IX siniflərdə buraxılış imtahanlarının nəticələri dinamik şəkildə artmışdır. IX siniflər üzrə buraxılış imtahanlarının nəticəsi rayonun ümumi göstəricisindən yüksək olan təhsil ocaqlarında: Şəhər 5 nömrəli tam orta məktəbi, Vəndam qəsəbə 2 nömrəli tam orta məktəbi, Kiçik Pirəlli, Bunud, Çarxana, Aydınqışlaq, Nohurqışlaq, Zalam, Zarağan kənd tam orta məktəblərində vəziyyət daha yaxşıdır.

Nəticələri rayonun ümumi göstəricisindən aşağı olan Qaş, Ziring, Topbağ kənd ümumi orta, Nic qəsəbə 1 və 2 nömrəli, Çuxur Qəbələ tam orta məktəblərinin işinə nəzarət artırılıb.

Rayon üzrə 1377 nəfər ümumiorta təhsil kursu üzrə şəhadətnamə, o cümlədən 14 ədəd fərqlənmə şəhadətnaməsi, 1419 nəfər isə tam orta təhsil kursu üzrə attestat almışlar ki, onlardan 3 nəfəri: Qurbanova Nigar (şəhər 2 nömrəli tam orta məktəb), Zəkəriyyəli Zəkəriyyə (Zarağan kənd 1 nömrəli tam orta məktəb), Səfərəliyeva Gültəkin (şəhər 2 nömrəli tam orta məktəb) qızıl medala layiq görülmüşdür.

Keçən dərs ilində müəllim və şagirdlərimiz respublika səviyyəli müxtəlif müsabiqələrdə, yarışlarda, fənn olimpiadalarında, beynəlxalq səviyyəli layihələrdə yenə də uğurla iştirak etmişlər.

Artıq üçüncü ildir ki, şəhər 1 nömrəli və şəhər 3 nömrəli tam orta məktəblərdə ingilis dilinin intensiv tədrisi ilə bağlı pilot layihə həyata keçirilir.

Şəhər 2 nömrəli tam orta məktəbin riyaziyyat müəllimi Kərimova Natella, şəhər 3 nömrəli tam orta məktəbin Azərbaycan dili və ədəbiyyatı müəllimi Həsənova Sona informasiya-kommunikasiya texnologiyalarından və elektron lövhədən istifadə etmək sahəsində böyük təcrübə qazanmışlar. Keçən dərs ilində qeyd olunan vəsaitlərin tətbiqi ilə qonşu məktəblərin fənn müəllimlərini dəvət etməklə həmin müəllimlərin dəfələrlə açıq dərsləri keçiril-

mişdir.

Vəndam qəsəbə 1 nömrəli tam orta məktəbin xarici dil müəllimi Mədinə Qasımova beynəlxalq TEA proqramında iştirak etmiş, 4 mərhələli proqramın artıq 2 mərhələsindən keçmişdir.

Cari dərs ilində 13 nəfər şagirdimiz fənn olimpiadalarının Şəki şəhərində keçirilən Zona yarışlarında I yeri tutmuş və respublika turunda iştirak etmək hüququ qazanmışlar. Onlardan 4 nəfəri respublika turunun qalibi olmuş, 2 nəfəri qızıl, 1nəfəri gümüş, 1nəfər isə bürünc medal almışlar.

Qeyd etmək lazımdır ki, şəhər 2 nömrəli tam orta məktəbin məzunu Qurbanova Nigar tarix fənnindən ən yüksək bal toplamış və "Birincilərin birincisi" xüsusi mükafatına layiq görülmüşdür.

Şəhər 2 nömrəli tam orta məktəbin XI sinif şagirdi Səfərəliyeva Gültəkin respublika üzrə ilk dəfə keçirilən "Milli – mənəvi dəyərlər haqqında düşüncələrim" mövzusunda inşa müsabiqəsində birinci yeri tutmuş, I dərəcəli diplom və qiymətli hədiyyələrlə mükafatlandırılmışdır.

Təhsil Nazirliyinin 10 mart 2016-cı il tarixli 157 nömrəli əmrinə müvafiq olaraq keçirilmiş "ən yaxşı təqdimat" respublika müsabiqəsində Soltannuxa kənd tam orta məktəbinin X sinif şagirdi Əsədova Fidan qalib olmuş və qiymətli hədiyyələrlə mükafatlandırılmışdır.

Zalam kənd tam orta məktəbin X sinif şagirdi Eyyubova Almaz "Sərhədlərimizin keşiyində" inşa müsabiqəsində II yeri tutmuş, Dövlət Sərhəd Xidmətinin diplomu və pul mükafatına layiq görülmüşdür.

Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyinin yaradılmasının 10 illiyi münasibətilə bu nazirliyin Təhsil Nazirliyi ilə birgə keçirdiyi "Fövqəladə Hallar Uşaqların gözü ilə" V Respublika və Beynəlxalq yaradıcılıq müsabiqəsində Uşaq yaradıcılıq mərkəzinin dərnək üzvləri Həmidova Adilə və Şıxqəmzəyeva Şəbnəm II yeri tutmuş, onlar hər iki Nazirliyin diplomları, həmçinin qiymətli hədiyyələri ilə təltif olunmuşlar.

Ümumtəhsil məktəblərində təlimin keyfiyyətinin yüksək olmasını təsdiq edən amillərinin əsasını məzunlarımızın respublikanın ali və orta ixtisas təhsili müəssisələrinə qəbul olunma səviyyəsi təşkil edir. Bu sahədə rayonumuz son illərdə davamlı olaraq respublikamızın qabaqcıl regionları sırasına daxil olmuşdur. Bu il də rayonumuzun məzunları həmin ənənəni qoruyub saxlaya bilmişdir. Qürur hissi ilə qeyd etmək lazımdır ki, ali məktəblərə sənəd verən 760 nəfərdən 424-ü tələbə adını qazanmış və onların 36-sı 600-dən çox bal toplamışdır. Fərəhli haldır ki, şəhər 3 nömrəli tam orta məktəbin məzunu Osmanova Şəhla Seçenov adına Moskva Tibb Akademiyasının Bakı filialının müalicə işi, Məmmədova Fidan isə Moskva Dövlət Universitetinin Bakı filalının fizika fakültəsinə daxil olmuşlar.

Məzunları yüksək bal toplayaraq ali məktəblərə qəbul olunan məktəblər sırasında şəhər 1, 2, 3, 4 və 5 nömrəli, Vəndam qəsəbə 1 nömrəli, Nohurqışlaq, Bunud, Hacallı, Həmzəlli, Məlikli, Soltannuxa, Dızaxlı, Yemişənli, Mıxlıqovaq kənd tam orta məktəblərinin adlarını iftixarla çəkmək olar.

Respublika Nazirlər Kabinetinin məlum qərarı ilə 2016/2017-ci dərs ilindən başlayaraq ümumtəhsil məktəblərində məktəbə hazırlıq qrupları fəaliyyətə başlayıb. Həmin qərara əsasən 15 sentyabr 2016-cı il tarixə kimi 5 yaşı tamam olan uşaqların

55% -i məktəbə hazırlıq qruplarına cəlb edilib. Bu zaman uşaq sayı çox olan, normal şəraiti, kadr potensialı olan məktəblərə üstünlük verilib. Nazirlər Kabinetinin məktəbə hazırlıq qruplarının yaradılması ilə əlaqədar verdiyi qərarla bağlı valideynlər arasında maarifləndirmə işlərinin aparılması davam etdirilir.

Məktəbə hazırlıq qruplarının fəaliyyət göstərdiyi məktəblər, həmçinin orada məşğələ aparan müəllimlər haqqında məlumatlar Təhsil Nazirliyinə təqdim olunmuşdur.

Məlumdur ki, “Təhsil haqqında Qanun”da tam orta təhsil səviyyəsində təhsilin təmayülləşməsi nəzərdə tutulur. Bu işə 2011-ci ildə Bakının 5 məktəbində başlanılmış və 2015/2016-cı dərs ilində bu layihə respublikanın 50 məktəbində həyata keçirilmişdir.

Təhsil Nazirliyinin 24 may 2016-cı il tarixli 35 nömrəli qərarı ilə 2016/2017-ci dərs ilində pilot məktəblərin şəbəkəsinin daha da genişləndirilməsi nəzərdə tutulub. Bununla əlaqədar 5 şəhər və 36 rayon olmaqla daha 41 regionda təmayülləşmənin həyata keçirilməsi qərara alınıb. Yeni dərs ilində bu layihəyə Vəndam qəsəbə 1 nömrəli tam orta məktəbi də qoşulub.

Məktəblilərin dərsliklə təminatında, eləcə də məktəb kitabxanalarının fondunun zənginləşdirilməsi istiqamətində əhəmiyyətli işlər görülüb. Belə ki, yeni dərs ilinə hazırlıqla əlaqədar rayonun ümumtəhsil məktəblərinə 136 adda 65244 ədəd dərslik verilmişdir. I, V və IX siniflər 100% , II-III-VII siniflər isə 38-40% yeni dərsliklərlə təmin olunub. Təhsil Nazirliyi tərəfindən təhsil şöbəsinə göndərilmiş dərsliklər bölgü əsasında məktəb şəbəkəsində olan şagirdlərin sayına uyğun məktəb kitabxanalarına təhvil verilib.

***Rəyçi: dos. N.Nəcəfov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.
2. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum). Bakı, 2006.
3. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.
4. Süleymanova A. Keyfiyyətin idarəedilməsinin qiymətləndirilməsi mexanizmləri. //Azərbaycan məktəbi, 2016, № 4.

**И.Гусейнов**

**К положенительной динамике**

**Резюме**

В статье говорится о новостях в области образования за последние годы, в том числе о положительной жинамике развития в районе Габала.

**İ.Huseynov**

**The positive dynamics**

**Summary**

In the article it is spoken about educational innovations in the recent years, as well as the positive dynamics in the development of education in Gabala region.



# О ПЕДАГОГИЧЕСКОЙ КУЛЬТУРОЛОГИИ

**Лачин Гасанова,**
***кандидат философских наук, доцент***

В статье речь идет о важных процессах в современной педагогике. Связь культуры и образования привела к рождению концептуально нового подхода в образовании культурологического.

Синтез музыкальной педагогики с культурологическими позициями имеет инновационный потенциал и требует внедрения в современный педагогический процесс.

***Açar sözlər:*** *kulturologiya, pedaqoji mədəniyyət, paradiqma, innovasiya problemləri.*

***Ключевые слова:*** *културология, педагогическая культура, парадигма, инновационные проблемы.*

***Key words:*** *culturology, pedagogical culture, paradigm, innovative problems.*

Каждый исторический этап вносит свои изменения в образовательный процесс, позволяя осуществлять поиск механизмов и путей его модернизации, наращивания потенциала, противостояния условиям современного усложняющего мира. Образование является социокультурной системой и выступает в качестве механизма консолидации общества, сохранения и воспроизводства его культурно-пространственной модели. С помощью образования происходит непрерывное воссоздание важнейших элементов социальной структуры общества, его материальных и духовных ценностей. Для выработки стратегии развития образования на современном этапе требуется умелое сочетание разных прогрессивных инновационных подходов и на основе этого создание качественно нового типа преподавания, который учитывал бы в равной степени сложившиеся традиции и новации. Результативный вектор такого типа образования находится на стыке взаимодействия глобальных, региональных и национальных концепций его развития.

Связь культуры и образования привела к рождению концептуально нового подхода в образовании – культурологического, целью которого является познание окружающей действительности на основе ценностей культуры, на основе множественности и многоликости картин мира. Методологический основой культурологического подхода служит идея о диалоге культур (В.С.Библер), теория культуросообразности (А.Ф.Дистерверг), положение о приобщении личности к культуре еще в дошкольном возрасте, об освоение культурного наследия в активной созидательной деятельности

(Л.С.Выготский, А.Н.Леонтьев, С.А.Рубинштейн). Культурологическая парадигма при этом выступает основанием развития гуманитаризации образования, реализации личностно-ориентированных педагогических систем. Культурологическая база необходима для профессиональной подготовки специалиста, который способен содействовать развитию национальной самобытности, который готов к разработке действенных мер к сохранению и развитию культурного наследия.

Сегодня наблюдается разрыв между теоретическим осмыслением роли культуры в жизни человека, общества и практическим использованием в структуре образования, как среднего, так и высшего уровней. Проблема культурологизации образования, проблема соответствия системы образования как школьного, так и вузовского, новой научной картине мира, новой социокультурной реальности, заявленная еще в прошлом XX веке, не решена по сей день. Повышенный интерес общества к проблемам образования всегда возникал в период глобальных преобразований на рубеже веков. Каков будет культурный облик нашей страны в XXI веке во многом зависит от образования, которое становится важнейшей сферой жизнедеятельности, определяющим фактором развития страны. Между образованием и культурой существует тесная, неразрывная связь, так как образование наиболее эффективно выполняет функцию передачи культурного опыта между поколениями. Это, в свою очередь, обращает внимание современных педагогов, теоретиков и практиков, к культурологической проблематике в поиске методологического ключа построения инновационной образовательной системы. Специфика последней определяется особенностями конкретного территориального и культурного пространства.

Педагогика – это не только область научных знаний, обращенных к воспитанию, обучению, образованию личности. Педагогика – это часть гуманитарного знания, которое направлено на изучение «закономерностей осознанной целенаправленной передачи социального опыта (то есть содержание культуры) из поколения в поколение» (1). Таким образом, новая парадигма педагогики является частью культуры, она служит ее развитию и становится базой сохранения традиционных ценностей культуры. В этом смысле, основу педагогического процесса, основу конкретной формы профессиональной деятельности педагога составляет исторически обусловленный, сформировавшийся социокультурный комплекс. Закономерности функционирования этого социокультурного комплекса оказывают воздействие на систему образования в обществе, задают границы воспитательных и образовательных возможностей. Этот постулат становится основой педагогических инноваций.

Сегодня существует необходимость инновационного понимания образования как механизма культуры и социального института, а на этой основе в теории и практике закрепилось понятие «педагогическая культурология.

Педагогическая культурология рассматривает взаимосвязь культуры и каждой личности на всех уровнях в социуме», - отмечает Е.Олесина (2). Культурные модели образования, как теоретические, так и методическе, опережают социальное развитие. Последние,

как правило, формируются в процессе апробации инновационных идей, а в итоге практики и опыта эти идеи окончательно обретают форму зрелой культурной модели. Культурологический анализ проблем помогает синтезировать на единой методологической основе отдельные представления об образовании, привнести их через образование в жизнь общества. В этом смысле огромную роль играет педагогическая культурология, которая анализирует три уровня деятельности. Речь идет о следующих взаимосвязанных уровнях:

1. уровень практики;
2. уровень создания практико-ориентированных теорий и конкретных методик;
3. уровень методологического осмысления, анализа и целенаправленной координации первых двух составляющих.

Педагогическая культурология обладает своей логикой, своей историей и инновационными идеями относительно культурных процессов, деятельности в обществе, обладает своим взглядом на культурное пространство и социокультурную систему. В результате, формируется системный подход к комплексному блоку соотношений педагогики, образования и культуры. Рассмотрение указанных взаимосвязей стимулирует инновационные процессы в педагогике. В этот блок входят культурное содержание и формы образования в целом. Соответственно, культурное содержание включает понятия ценности, функции, цели, задачи, соответствующей направленностиь и культуроемкость. Формы опираются на культуросообразность и качество технологических стратегий, методов, средств, методик и приемов, которые внедряются в образовательную систему. Педагогическая культура представляет собой интегративную характеристику педагогического процесса. Она вбирает в себе как единство непосредственной деятельности людей по передаче накопленного социального опыта, так и результаты этой деятельности, зафиксированные в виде знаний, умений, специфических институтов такой передачи от одного поколения к другому. Таким образом, педагогическая культурология – это элемент общей культуры и, одновременно специализированно профессиональная сфера, которая проникает как бы во все структуры общества и становится его «сквозным» течением. С одной стороны, педагогическая культурология – это особая подсистема, особый вид культуры. С другой, она, как ее основной элемент, имеет место в каждом из типов культуры, объединяя последний с системой социального наследования.

Справедливо по этому поводу высказал свои мысли доктор педагогических наук, профессор Бенин В.Л. Ученый отметил, что в разные времена у разных народов конкретные проявления педагогического процесса имели свою специфику. Однако, при всем многообразии вариантов всегда был тот, кто учит, и тот, кого учат. Так, была сумма знаний, которую передаются; были социальные институты, где осуществляется эта передача и всегда были и будут необходимые обществу результаты подобной деятельности. «Первый из названных «всегда» представляет собой субъект педагогического воздействия, второй – его объект, третий – его содержание, четвертый – его механизм, пятый – его систему, шестой – его цель. Каждый из них педагогикой хорошо исследован и подробно описан. Но изолированно изученные в реальности названные шесть элементов взаимообусловлены, тесно интегрированы и

выступают в неразрывном единстве, качественная специфика которого определяется как педагогическая культура» (3). Развиваясь на перекрестном пути культурологики и педагогики, педагогическая культурология собирает воедино в свое научное пространство теоретических и практических исследований данные многих наук – философских, культурологических, социологических психологических, педагогических и других, что позволяет ей решать актуальные проблемы в современном мировом культурном пространстве.

Как известно, «в рамках любой формальной системы можно составить гипотезы, истинность которых нельзя ни доказать, ни опровергнуть средствами одной системы» (1). Ученый имеет в виду принципиальную информационную неполноту формальных искусственных систем, к которым можно отнести любые формальные знания и информационные модели. На сегодняшний день абсолютная формализация предмета в рамках одной научной парадигмы или теории принципиально невозможна. Так, в рамках дефактического анализа образование – это процесс и результат усвоения систематизированных знаний и навыков. Исходя из методологического аппарата дидактики, фундаментальные понятия теории не могут быть корректно определены в пространстве понятийного регулятива этой теории. Для подобного осмысления необходимо выйти за границы понятийной системы классической педагогики. Выход из данной ситуации, соответственно выход за рамки традиционной педагогики, представляет педагогическая культурология. Она выступает в качестве методологии социокультурного воспроизводства, она изучает общие закономерности педагогического процесса. Она направлена на получение систематизированных знаний о формах и методах не только трансляции социального опыта, но и разработки вариантов практической организации культурно-образовательной политики на современном этапе. Именно выходы за рамки принятых педагогических позиций означает инновационный подход в современной педагогике.

Безусловно, что в условиях модернизации профессионального музыкального образования происходит совмещение, «наложение», сосуществование инноваций и элементов традиционной системы. Динамика общественного сознания определяется движением «от рецептивно-отражательного подхода к мышлению и образованию человека к конструктивно-деятельному» (4).

Переосмысление целей образования на теоретическом уровне происходит достаточно быстро, однако привнесение их в образовательную практику отстает от первого этапа. Здесь важно уяснить, что должен поменяться сам стиль преподавания. Если раньше в педагогическом ВУЗе стиль преподавания имел рецептурную направленность, то в условиях модернизации его необходимо персонифицировать. Только в этом случае возможен разговор об инновациях. В сложившейся практике музыкальной педагогики существует противоречия между объективной потребностью в подготовке профессионалов с высоким уровнем компетентности и недостаточностью знаний о ее сущности, содержании, организации педагогического процесса. В результате, в системе высшего образования возникает две инновационные проблемы: проблема изменения качества педагогической деятельности и проблема обновления педагогического образования. В ситуации творчества и свободы выбора

возрастает степень личной ответственности педагога за выбор стиля и стратегии профессиональной деятельности. В свете сказанного, возрастает необходимость «сознательно проектируемой личностно-ориентированной педагогической деятельности на основании компетентностного подхода» (4).

Высокий уровень профессиональной подготовки специалиста включает в себя широкую эрудицию, адаптироваться к разнообразию современного культурного мира. Воспитание перечисленных качеств и возлагает на себя культурология, потому именно с ее позиций и осуществляются инновационные процессы в образовании. Важнейшим фактором, который демонстрирует прогрессивность методов и внедрения инновационных технологий в образовательную среду, служит актуализация компетентностного подхода. Компетентностная модель опирается, прежде всего, на углубление специализации, позволяет воспитывать грамотных представителей определенной области. Привнесение же культурологической направленности в традиционную систему методологии компетентного подхода формирует умение работать в мультикультурной среде, быть толерантным и открытым к диалогу. Совмещение задач личностного и общекультурного планов компетенций формирует междисциплинарный характер образовательного процесса. В результате, компетентностный подход открывает новые перспективы в сфере современного вузовского образования и позволяет определить значение культурологии в системе. Креативность включает в себя комплекс мыслительных и личностных качеств, способствующих творческому самоопределению личности. К числу последних можно отнести такие характеристики и особенности, которые стимулируют инновационный потенциал:
- высокий энергетический потенциал. Высокую продуктивность и интерес к множеству предметов;
- чрезвычайную любознательность и пытливость, способность полностью раскрыть свой талант в избранной сфере;
- изобретательность, гибкость и оригинальность в решении проблем;
- способность не только продуцировать оригинальные идеи, но и отстаивать их в любой ситуации;
- склонность к завершенности и точности;
- способность к конструктивной критике (авторитетные мнения) принимаются с учетом их критической оценки);
- предприимчивость, решительность, способность рисковать;
- обладание чувством прекрасного (уделяется внимание эстетическим и художественным свойствам явлений и предметов).

Развитие креативности в процессе обучения – это сложная педагогическая задача, направленная на поиск педагогических подходов, приемов, методик организации учебного процесса, происходящего в условиях творческой деятельности ученика. История развития философских, культурологических и педагогических взглядов на проблему творческой активности (креативности) обучаемого свидетельству о том, что данная проблема вызывала интерес многих ученых-мыслителей. Обращаясь к философским, педагогическим и психологическим открытиям, сделанным на протяжении многих веков в этой области, можно выделить следующие педагогические подходы:

1. гуманно-демократический;
2. личностный;
3. опытно-экспериментальный;

4. природосообразный;
5. деятельностно-трудовой;
6. человекоцентрический;
7. полухудожественный;
8. интегрированный;
9. культуросообразный.

Опираясь на труды философов прошлого, которые посвящены вопросам активного познания мира и изучению способов мыслительной деятельности, ученые пришли к выводу о том, что философские методы познания можно использовать в педагогике. Они выделили два различных метода познания по способу мыслительной деятельности:
продуктивный метод – метод Аристотеля (силлолистика);
метод Р.Декарта (рационализм);
индуктивный метод – метод Сократа (майевтика),
метод Ф.Бекона (эмпиризм).

Педагоги и психологи XIX-XX веков изучали процессы мышления новыми методами, в которых особое место занимал творческий процесс. В их исследованиях на первый план выходили такие познавательные процессы, как память, психологические аспекты языка и речи, восприятия, решения задач, мышления, вынимая, воображения, феномена творчества. Творчество – это атрибутивное качество человека. Культура XXI столетия, определяемая как «личностно-креативная» - культура с ярко выраженной инновационной доминантой, которой требуется креативная творческая личность. Потребность в творчестве, способность к творчеству и умение творить наиболее полно формируются и развиваются именно в процессе обучения личности человека, на всех этапах его образовательной деятельности.

Инновационные проблемы тесно связана с социальными условиями и общественными институтами, которые направлены на развитие и реализацию творческой активности человека. Музыкально-учебные заведения занимают в этом ряду очень важное место. Студенты должны приобретать индивидуальный, связанный с их будущей профессией «алгоритм творчества». Воспитание культуры творчества, развитие навыков самостоятельного творческого мышления и речи – необходимая задача высшего образования. Важнейшие пути реализации этой задачи обращены к инновационным методикам интегративного характера, вместе с тем опираются на традиционный опыт классического гуманитарного образования.

В заключение добавим также следующее: «Движение от монолога к диалогу, от культуры речи – к профессиональной риторике, от языковых норм – к речевому творчеству – такой, на наш взгляд, должна быть стратегия обучения студентов искусству речевой коммуникации. Подобная стратегия позволит создать необходимые условия для реализации «алгоритма творчества» в социальной практике будущих выпускников, определяя и завершая вектор движения от педагогического творчества к социальным инновациям» - звучала на третьем Российском культурологическом конгрессе в октябре 2010 года (6).

Современному музыкальному обществу требуется гармонично развитая личность, умеющая действовать креативно и продуктивно. Сформировать такую личность поможет экстраполяция основных инновационных законов на современный уровень социального и культурного развития общество. Однако, данный

процесс возможно осуществить лишь на креативных началах в условиях целостной системы культурологически выстроенной учебной и воспитательной работы. Современная модель образования, в том числе и музыкального, должна соответствовать новому информационному обществу. Она должна опираться на такие принципы, как непрерывность образовательного процесса, его индивидуализация, глобализация, интенсивность, а также лучшие традиции прошедших поколений в том числе креативность. Культурологическое образование в системе музыкальной педагогики, как процесс непрерывного образования на всех его стадиях должны быть направлен на достижение следующих результатов:

1. культурологическую граммотность (начальная школа);
2. культурологическая образованность (средняя школа и средние специальные учебные заведения);
3. профессиональная компетентность (высшее образование);
4. культуру личности, которая характеризуется глубинными мировосприятием, мировоззрением, зданием основных типов художественной, в том числе музыкальной культуры, истории современной теории культуры и т.п.

***Рецензент: проф. В.Халилов***

## Литература

1. Бенин В. Педагогическая культурология и культурологическая компетентность педагогов. //Тезисы докладов II Российского культурологического конгресса «Культурное многообразие: от прошлого к будущему». С.-Петербург, 2008, Эйдос, Астерион.

2. Олесина Е. Педагогическая культурология: современное состояние и перспективы. //Тезисы докладов III Российского культурологического конгресса «Креативность в пространстве традиции и инновации». С.-Петербург, 2010, Эйдос.

3. Бенин В. Педагогическая культурология: явление и сущность. //Тезисы докладов III Российского культурологического конгресса «Креативность в пространстве традиции и инновации». С.-Петербург, 2010, Эйдос.

4. Максименко С. Проблемы профессионально-многочисленного определения студентов в педагогическом вузе. //Тезисы докладов II Российского культурологического конгресса «Культурное многообразие: от прошлого к будущему». С.-Петербург, 2008, Эйдос, Астерион.

**L.Həsənova**

**Pedaqoji kulturologiya haqqında**

**Xülasə**

Məqalədə müasir pedaqogikanın mühüm məsələlərindən, o cümlədən, mədəniyyətlə təhsilin əlaqəsi, təhsildə konseptual cəhətdən yeni kulturoloji yanaşmalardan bəhs edilmişdir.

Məqalədə həmçinin musiqi pedaqogikasının kulturoloji mövqelərlə sintezinin innovativ potensiala malik müasir pedaqoji prosesə tətbiqinə də toxunulmuşdur.

**L.Hasanova**

**About pedagogical culturology**

**Summary**

The article is dedicated to the important issues of contemporary pedagogy. The relation between culture and education led to culturological approach in education. Culturological synthesis of music pedagogy acquires innovative potentials and is required to apply to contemporary pedagogical process.



# MİLLİ TƏHSİLİMİZDƏ PRİORİTET SAHƏ



**Şəmistan Mikayılov,**
***pedaqogika üzrə elmlər doktoru, professor***
**Asya Bəkirova,**
***pedaqogika üzrə fəlsəfə doktoru***

Məqalədə Azərbaycan dilinin saflığının qorunmasından bəhs edilir. Müəlliflər bu sahədə dövlət səviyyəsində görülən işlərdən, tərcümə məsələlərindən söhbət açır, şagirdlərin mütaliəyə istiqamətləndirilməsi problemlərinə də toxunurlar.

***Açar sözlər:*** *milli dəyərlər, ana dili, dilin saflığı, dilin ahəngdarlığı, orfoepiya, orfoqrafiya.*

***Ключевые слова:*** *национальные ценности, радной язык, ясность языка, закономерность языка, орфоэпия, орфография.*

***Key words:*** *national values, native language, the purity of the language, language harmony, orthoepy, spelling.*

“Bizim çox gözəl, zəngin, cazibədar dilimiz var. Bəlkə də biz bu dildə danışdığımıza görə öz dilimizin zənginliyini və gözəlliyini tam dərk edə bilməmişik...Hər bir Azərbaycan vətəndaşı, hər bir azərbaycanlı öz ana dilini - Azərbaycan dilini, dövlət dilini mükəmməl bilməlidir. Gənclərə tövsiyə edirəm ki, əgər kiminsə bu barədə çatışmazlığı varsa, çalışsın bunu aradan qaldırsın.

Xalqın, millətin, insanın öz ana dilindən əziz heç bir şey ola bilməz”.

Bu sözlər ulu öndər Heydər Əliyevə məxsusdur. Onun gənclərə tövsiyəsi bütün təhsil müəssisələrinin təhsilalanlarına aiddir. Qloballaşan dünyada xalqın özünəməxsusluğunun bariz ifadəsi olan dil məsələsi ən vacib problemlərdən biridir.

Əsrlər boyu Azərbaycan xalqının milli varlığının qorunub saxlanmasında mədəniyyətimizin, incəsənətimizin, musiqimizin böyük rolu olduğunun və bunların da əsasında Azərbaycan dilinin dayandığı fikrinin ölkənin Prezidenti tərəfindən qeyd olunması qəlbimizi iftixar hissi ilə doldurur. Azərbaycanın böyük imperiyalar tərkibində olduğu dövrlərdə də öz varlığını, mənəvi dəyərlərini qoruyub saxladığını məmnunluqla xatırladan Prezidentimiz İlham Əliyev alimlərin gələcək elmi fəaliyyətlərinə istiqamət verərək qeyd etmişdir: “Mən çox istəyirəm ki, Azərbaycan alimləri gələcəkdə də ölkəmizin hərtərəfli inkişafında daha fəal rol oynasınlar. Çünki ölkəmizin gələcəyi elmi potensialının səviyyəsi ilə bilavasitə bağlıdır”.

Əsrimiz intellekt əsridir, möcüzələr əsridir. Müasir dövrdə insanlardan daha çox dərin düşüncə, aydın təfəkkürlə həyat hadisələrinə fəal müdaxilə tələb olunur. Ümumi inkişafla ayaqlaşma zərurətindən yaranan bu tələb başqa sahələrdə olduğu kimi, təhsil sahəsində çalışan insanların da qarşısında mühüm vəzifələr qoyur. Təhsil illəri, xüsusilə ümumi təhsil illəri elmlərin əsasını öyrənmə, bir vətəndaş kimi formalaşma dövrüdür. Bu illərdə insan təkcə elmi bilik qazanmaqla məhdudlaşmır, eyni zamanda tərbiyə olunur, xalqın böyük məqsədlər uğrunda apardığı mübarizələrin mahiyyətini dərk edir, adət-ənənələr, milli-

mənəvi dəyərlər haqqında təsəvvürü yaranır, ən əsası da şəxsiyyət kimi formalaşır. Bu mühüm işdə ümumtəhsil müəssisələrinin üzərinə daha ciddi məsuliyyət düşür. Bu səbəbdən də ana dilimizə sevginin yaranması, milli-mənəvi dəyərləri gənc nəslə aşılamağın bünövrəsi əsasən məktəb illərində qoyulur.

Xalqımızın keçdiyi mübarizə yolunun, elmi biliklərin böyüməkdə olan gənclərə çatdırılmasında maarifçi ziyalıların—alimlərin əməyi, çəkdikləri zəhməti böyük əhəmiyyət kəsb edir. Bu mənada Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin AMEA-nın 70 illik yubileyinə həsr olunmuş ümumi yığıncaqdakı çıxışı olduqca diqqətəlayiqdir. O, Akademiyanın ötən onilliklər ərzində Azərbaycan elminə gətirdiyi yenilikləri yüksək qiymətləndirərək demişdir: "Azərbaycan Milli Elmlər Akademiyası ölkəmizin intellektual potensialının möhkəmlənməsinə çox dəyərli töhfələr vermişdir. Bu gün də Azərbaycan Milli Elmlər Akademiyası ölkəmizin ümumi inkişafında fəal rol oynayır, alimlər öz elmi araşdırmalarını apararaq ölkəmizin gələcək inkişaf dinamikasını sürətləndirirlər".

Cənab Prezident sözünə davam edərək Azərbaycan xalqının milli-mənəvi dəyərlərinin zənginliyini nəzərə çatdıraraq onun qorunub saxlanılmasını, gələcək nəsillərə ötürülməsini bir vəzifə kimi alimlərin qarşısında qoymuşdur. Prezidentin bu məsələ ilə bağlı aşağıdakı fikirləri rəğbətlə qarşılanmışdır. O demişdir: "Əsrlər boyu Azərbaycan xalqını bir xalq kimi qoruyan bizim mədəniyyətimiz, incəsənətimiz, musiqimiz, xalçaçılıq sənətimiz və digər ənənələrimiz olubdur. Bizim bu sahədəki bütün fəaliyyətimizin əsasında Azərbaycan dili dayanır. Azərbaycan dili bizi bir xalq, millət kimi qoruyub. Əsrlər boyu biz başqa ölkələrin, imperiyaların tərkibində yaşadığımız, müstəqil olmadığımız dövrdə milli dəyərlərimizi, ana dilimizi qoruya, saxlaya bilmişik, Azərbaycan dilinin saflığını qoruya bilmişik. Ona görə bu gün bəzi hallarda dilimizə xaricdən müdaxilələr edilir və bəzi hallarda Azərbaycanda da dəstək qazanır, bu, məni doğrudan da, narahat edir. Azərbaycan dili o qədər zəngindir ki, heç bir xarici kəlməyə ehtiyac yoxdur. Bir daha demək istəyirəm ki, biz əsrlər boyu dilimizi qorumuşuq. Bu gün də qorumalıyıq. Biz Azərbaycan dilinin saflığını təmin etməliyik. Əlbəttə, bizim vətəndaşlar, xüsusilə gənc nəsil nə qədər çox xarici dil bilsələr, o qədər yaxşıdır. Ancaq ilk növbədə öz ana dilini bilməlidirlər. Digər tərəfdən imkan verməməlidirlər ki, ana dilimizə yad kəlmələr daxil olsun. Buna ehtiyac yoxdur".

Ölkə başçısının proqram xarakterli çıxışı alimlərin, təhsil işçilərinin, eləcə də ziyalılarımızın qarşısına da milli-mənəvi dəyərləri qorumaq, onlara hörmətlə yanaşmaq kimi mühüm vəzifələr qoyur. O, alimlərin elmi araşdırmalarını yüksək qiymətləndirir.

Göründüyü kimi, Azərbaycan dilinin saflığının qorunması bir vəzifə, tələb kimi qarşıya qoyulur. Əsrlər boyu xalqımızın yaratdığı mənəvi dəyərlər qorunaraq gələcək nəsillərə təhvil verilməlidir. Bu, dövlət siyasətimizin tərkib hissəsidir. Bu da aydındır ki, bütün sahələr üzrə yaranıb formalaşan milli dəyərlərimizin əsasında Azərbaycan dili dayanır, həmin dəyərlər əsrlər, illər keçdikcə nəsildən-nəslə bu dildə ötürülməli, qorunub saxlanılmalıdır. Bu məsuliyyətli, müqəddəs iş bizim indiki nəslin, xüsusilə ziyalıların üzərinə düşür. Biz ana dilimizin, Azərbaycan dilinin saflığının, ahəngdarlığının keşiyində durub onu xarici təsirlərdən qorumalıyıq. AMEA-nın yığıncağında, haqlı olaraq deyildiyi kimi, bəzən dilimizə zərurət yaranmadan xarici təsirlər olur. Biz də bir azərbaycanlı olaraq dilimizdə xarici sözün qarşılığı varkən yad sözə müqavimət göstərmək əvəzinə, onun yayılmasına imkan veririk. Lakin "buna imkan verilməməlidir ki, ana dilimizə yad kəlmələr daxil olsun". Çox təəssüf ki, bəzən ehtiyac yaranmadıqda

belə danışıq zamanı yad kəlmələrin işlədilməsinə yol verilir. Məsələn, Azərbaycan dilində keyfiyyət bildirən “yaxşı”, “çox yaxşı”, “lap yaxşı”, “əla” sözləri olduğu halda, dilimizə yad ünsür kimi daxil olan “super”, “afərin”, “əhsən”, “sağ ol”, “bəyənilsin” kimi təqdiredici sözlər varkən, “bravo”; “görüntü”, “görmə bucağı” əvəzinə “rakurs”; “sərbəst yazı”, “müstəqil yazı”, “inşa” kimi işlək sözlərin əvəzinə “esse”; “dükan”, “mağaza” sözləri varikən “market”, “super market” kimi kəlmələr işlədilir. Əlbəttə, müxtəlif sahələr üzrə bəzi hallarda işlədilən belə sözlərin sayını artırmaq olar. Bu sözlər əksəriyyət tərəfindən başa düşülmür. Təəssüf doğuran odur ki, belə kəlmələrin dilimizə daxil olmasına təşəbbüs göstərənlərin əksəriyyəti ziyalılardır. Elə təsəvvür yaranmasın ki, biz xarici dil bilməyin əleyhinəyik, onu qüsur hesab edirik, əksinə bu, hünərdir, böyük qabiliyyətdir, şəxsiyyəti başqalarından fərqləndirən keyfiyyətdir, xatırladaq ki, Mirzə Fətəli Axundzadə elmi-bədii əsərlərini, əsasən, öz ana dilində yazdığı halda, “A.S.Puşkinin ölümünə Şərq poeması”nı fars dilində yazmış, özü rus dilinə tərcümə etmişdir. O, gürcü dilini də mükəmməl bilirdi. Yaxud yazıçı-publisist Mikayıl Rzaquluzadə Homerin “İliada” əsərini rus dilindən, Nizaminin “İsgəndərnamə”sini fars dilindən Azərbaycan dilinə tərcümə etmiş, başqa hansı dildə yazmışsa, bildiyi digər dillərdən bir kəlmə də işlətməmişlər. Nitqdə (yazılı, yaxud şifahi), mükalimədə yad kəlmədən istifadə etmək yolverilməzdir, dilin ahəngini korlamaqdır.

Bununla əlaqədar ümumtəhsil məktəblərində Azərbaycan dilinin tədrisini dövrün tələblərinə tam cavab vermək səviyyəsinə yüksəltmək üçün bəzi mülahizələri də söyləməyi lazım bilirik. Sovet hakimiyyəti dövründə hansı fənnin, məsələn, rus dilinin tədrisinə verilən saatın (vaxtın) miqdarını artırmaq tələb olunduqda, Azərbaycan dili və ədəbiyyatın tədrisinə ayrılan vaxtdan kəsib rus dilinə verilən vaxta əlavə etmişlər. Son zamanlar cəmiyyətdə belə bir fikir formalaşmışdır ki, insanların, xüsusilə məktəblilərin kitaba marağı aşağı səviyyədədir. Bu, belədir. Mütaliə olmadan sərbəst düşüncədən, fikir aydınlığından, gözəl nitqdən danışmaq mümkün deyil. Bu keyfiyyətlərin inkişafına təkan verən, qüvvətli təsir göstərən bədii ədəbiyyatdır. Burada Təhsil naziri Mikayıl Cabbarovun 16 dekabr 2014-cü il tarixli əmrindəki bir fikrə diqqət etmək də yerinə düşür: “... son zamanlar ümumtəhsil məktəblərində şagirdlərin mütaliəyə istiqamətləndirilməsi, onlarda mütaliə mədəniyyətinin formalaşdırılması üzrə zəruri tədbirlərin həyata keçirilməsi əvvəlki dövrlərlə müqayisədə zəifləmişdir. Bununla əlaqədar şagirdlərin mütaliəsi işinin təşkilindəki təcrübədə sınaqdan çıxmış ənənələri bərpa etmək, onların mütaliəyə həvəsini daha da gücləndirmək və mütaliə vərdişini inkişaf etdirmək təhsil sahəsində prioritet vəzifələrdən biridir”.

Əlbəttə, hər sahədə olduğu kimi, təhsil sahəsində də illər boyu yaxşı ənənələr formalaşmışdır. Bunlardan ən mühümü kitab oxumaq ənənəsi idi. Təəssüflə deməliyik ki, məktəbdə tədris materiallarından əlavə, kitab oxumağa əvvəlki onilliklərdə olan maraq bu gün yox dərəcəsindədir. İndi çoxları lazım olan informasiyanı kompüter vasitəsilə əldə edirlər. Doğrudur, kompüter çox böyük imkanlara malikdir, ondan istifadə etmək həyati zərurətə çevrilib. Lakin təcrübə göstərir ki, kompüterdən istifadə şagirdlərin nitqini inkişafdan qoyur, hətta arzuolunmaz səviyyəyə gətirir. Bu baxımdan bədii ədəbiyyatın, mütaliənin yerini heç nə verə bilmir. Belə ki, dilin zənginliyi, nitqin əlvanlığı yalnız mütaliə ilə yaranır. Ona görə də kompüterə aludə olub, mütaliəni nəzərdən qaçırmaq yolverilməzdir.

Bütün bunlar onu göstərir ki, Azərbaycan dilinin ümumtəhsil məktəblərində tədrisi keyfiyyətinin yüksəldilməsi zamanın tələbidir.

Əlbəttə, Azərbaycan dilinin nəzəri-elmi xüsusiyyətləri dilçi-filoloq alimlər tərəfindən işlənmiş, işlənir və işlənəcəkdir. Onun məktəbdə öyrədilməsi dilçi metodist alimlərin və müəllimlərin ən ümdə vəzifəsidir.

Fikrimizcə, ümumtəhsil məktəblərində müəllimlər aşağıda qeyd etdiyimiz məsələlərə diqqət yetirməlidirlər:

- Azərbaycan dili dərsliklərində sözlərin düzgün tələffüzü, vurğunun, fasilənin yaxşı nitq üçün əsas olduğu şagirdlərə öyrədilməlidir. Bu işdə müəllimlərə istiqamət verən daha keyfiyyətli metodik əsərlər yazılmalıdır;
- Azərbaycan dilinin zənginliyi barədə aydın təsəvvür yaratmaq və şagirdlərin hafizəsində möhkəmləndirmək məqsədilə onlar dilimizə zənginlik gətirən sözləri, ifadələri yazılış etibarilə müxtəlif olan, lakin eyni mənanı verən sinonimlər, yazılışı eyni olan, lakin müxtəlif mənada işlənən (omonimlər) və digər vahidlər üzərində ardıcıl işlədilməlidir. Nəzərdə tutulan fikri ifadə etmək üçün məqsədəmüvafiq söz seçilməsinin əhəmiyyəti şagirdlərə anladılmalıdır;
- nitqdə aydın müşahidə olunan nöqsanların bir qismi orfoepiya qaydalarını yaxşı bilməməkdən irəli gəlir. Azərbaycan dilində orfoepiyanın xüsusiyyətlərinin öyrədilməsinə dair sanballı metodik vəsaitin hazırlanmasına zəruri ehtiyac duyulur;
- mütaliəyə marağın artırılması metodiki baxımdan tədqiq olunmalıdır. Aydın danışıq, cəlbedici nitq, dil zənginliyi, söz ehtiyatı onun çalarları ilə bağlıdır, bu isə ardıcıl mütaliə tələb edir.

Biz ümumtəhsil məktəblərində Azərbaycan dilinin xüsusiyyətlərini, ahəngdarlığını mənimsətməklə, onlarda gözəl nitq vərdişi yaratmalıyıq və dilimizin zənginliyini gələcək nəsillərə ərməğan etməliyik. Bu, dövlətimizin və dövlət başçımız cənab İlham Əliyevin Azərbaycan dilinin saflığının qorunması ilə bağlı ziyalıların qarşısında qoyduğu vəzifələrə əməli işimizlə xidmət göstərməkdir.

***Rəyçi*: *prof. R.Mustafayeva***

## İstifadə edilmiş ədəbiyyat


1. Xuduyev N. Heydər Əliyev və Azərbaycan dili. Bakı, 2004.
2. Babayev A. Azərbaycan dili və nitq mədəniyyəti.
3. Qurbanov A. Müasir Azərbaycan ədəbi dili. Bakı, 2003.
4. Hacıyev T., Cəfərov N., Xuduyev N. Azərbaycan dili. 11-ci siniflər üçün dərslik. Bakı, 2005.
5. Mikayılov Ş. Elmi-metodiki əsərlərdən seçmələr. Bakı, 2002.


**Ш.Микаилов,**
**А.Бекирова**

**Приоритетная область национального образования**

**Резюме**

В статье говорится о заботе чистоты азербайджанского языка. Авторы охватывают всех дел проделанных государством в этой области, рассказывают о задачах перевода, и о том как важно направлять детей к чтению.

**Sh.Mikhailov,**
**A.Bakhirova**

**Priority area in national education**

**Summary**

The article is dedicated to preserving the purity of the Azerbaijan language. The authors focus on the job done in this sphere and touched upon the problems which concern translation issues, and increasing students’ interest to reading.



# MÜASİR PEDAQOJİ PROSESİN BƏZİ ASPEKTLƏRİ

**Məlahət Nuriyeva,**
***BDU-nun gender və tətbiqi psixologiya kafedrasının müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru***

Məqalədə dərsin keyfiyyətindən, təlim-tərbiyə işinin optimallaşdırılmasından, yeni paradiqmalardan, motivasiyanı yüksəltməkdən və b. məsələlərdən bəhs edilir.

***Açar sözlər:*** *pedaqoji proses, modernləşdirmə, innovasiya, pedaqoji takt.*
***Ключевые слова:*** *учебный процесс, модернизация, инновация, педагогическая тактичность.*
***Key words:*** *educational process, modernization, innovation, pedagogical tact.*

Azərbaycanda təhsilin inkişafı, uşaq və gənclərin dünya standartlarına uyğun təhsillə təmin olunması, yüksəkixtisaslı kadrların yetişdirilməsi ölkə prezidentinin neft kapitalını intellektin, kadrlaşmanın, peşəkarlığın inkişafına çevirmək strategiyasının mühüm hissəsini təşkil edir.

Təhsil sistemində müasir dünyanı, onun yeni tələblərini və çağırışlarını üzə çıxarmaq, sabahın tələblərini qiymətləndirmək lazımdır. Bu prosesdə şəxsiyyətin tərbiyəsi, təlimi və bacarığı ilə bağlı aparılan məqsədyönlü, planlı və mütəşəkkil işlər öz həllini tapmaqdadır.

Azərbaycan öz müstəqilliyini əldə edəndən sonra digər sahələrdə olduğu kimi təhsildə də köklü islahatlar zərurəti ortaya çıxdı. Təhsil müəssisələrinə xeyli müstəqillik, geniş səlahiyyətlər verilib.

Bütün zamanlarda dərsin keyfiyyətini yüksəltmək aktual olmuşdur. Fənnindən asılı olmayaraq tədris edilmiş hər hansı mövzu, ilk növbədə pedaqoji prosesin tamlığını təmin etməyə yönəldildikdə gözlənilən nəticəyə nail olmaq da asanlaşır.

Müəllim pedaqoji prosesdə öyrədənlə öyrənənin qarşılıqlı əlaqəsini, prosesin inkişafını, məqsədini, qanunauyğunluğunu, prinsiplərin forma və metodlarını gözəl bilməlidir. Pedaqoji prosesin tamlığı onun təşkili proseslərinin tərkib hissəsidir. Dəstəkləyici mühitin yaradılması, fəaliyyətin stimullaşdırılması, inkişafyönümlülük, şagirdyönümlülük, pedaqoji prosesin tamlığı, təlimdə bərabər imkanların yaradılması bu prosesdə mühüm həlqələrdir. Qloballaşma insanlarda təfəkkürün yeni reallıqlara uyğunlaşmasını önə çəkir, əhatəli informasiyanı qiymətləndirərək çevik qərar qəbul edən, dövlətin bir sıra vacib sahələrinin perspektivini proqnozlaşdıra bilən yeni nəsil kadrların hazırlanmasının vacibliyini gündəmə gətirir. Bu şəraitdə ali təhsil sistemi xüsusi funksiya yerinə yetirir. Çünki təhsil siyasəti yenidən elə qurulmalıdır ki, informasiya-texnoloji, texniki, mədəni sahələrdə innovasiya proseslərinin genişlənməsi şəraitində düzgün istiqamət götürmək qabiliyyətinə malik mütəxəssislər hazırlana bilsin. Prezident İlham Əliyev bununla bağlı demişdir: “Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik”.

Ali təhsilin modernləşdirilməsinin əsas məqsədi ölkənin ali təhsilinin Avropa

təhsil məkanına inteqrasiyası, onun məzmununun Bolonya prosesinin prinsiplərinə uyğun qurulması, cəlbediciliyinin və rəqabət qabiliyyətinin təmin edilməsi, ölkə iqtisadiyyatının inkişaf tələblərinə uyğun ali təhsilli kadrlara yaranan tələbatın ödənilməsi, habelə informasiya cəmiyyətinin və müasir biliklərə əsaslanan iqtisadiyyatın tələblərinə uyğun olaraq kadr potensialının yaradılması, əhalinin müasir tələblərə cavab verən ali təhsil almaq imkanlarının təmin edilməsi üçün iqtisadi və sosial baxımdan səmərəli ali təhsil sisteminin formalaşdırılmasıdır. Müasir təhsilin modernləşdirilməsi son dərəcə vacibdır. Biz bunu gündəlik işimizdə görürük və hiss edirik. Nümunə üçün Avropa gerçəkliyinə baxaq. Birliyə daxil olan ölkələrdə məqsəd əhalinin 60%-nin ali təhsilli olmasıdır. Qloballaşan dünya bunu tələb edir. Elm və texnika elə sürətlə inkişaf edir ki, artıq ali təhsili olmayan insan çətinliklərlə üzləşməli olur.

Ənənəvi sinif-dərs sistemi çərçivəsində istər texniki, istərsə də sosial olsun, istənilən sistem üçün bəzi fundamental ziddiyyətlər paradiqması çərçivəsində mümkün deyildir. Mədəniyyət standartlarını əldən verməmək şərti ilə tədrisin dinamizmi, forma müxtəlifliyi və mahiyyəti vəhdət halına gətirilməlidir. Təhsil müəssisələrinin müxtəlif formaları, təlim texnologiyaları, fənnə müxtəlif dərəcədə yiyələnməyi nəzərdə tutan külli miqdarda fənn seçimi imkanları və standart tələblər çərçivəsində imtahanlar tətbiq etmək qaçılmazdır.

Ədalət naminə qeyd edək ki, yeni təhsil sistemi innovasiya iqtisadiyyatının təşəkkülünun nəticəsi kimi avtomatik surətdə meydana çıxa bilməz. Əksinə, innovasiya iqtisadiyyatının təşəkkülü layihələndirmə və onunla bağlı müvafiq təhsil sisteminin təşəkkülü olmadan mümkün deyildir. Təhsil və iqtisadiyyat bir çox baxımdan bir-birini qarşılıqlı surətdə tamamlayır.

Bu prinsiplərin pedaqoji prosesdə qarşılıqlı əlaqəsinin tətbiqini müəllim həmişə təmin etməlidir. Pedaqoji prosesdə təlimin funksiyaları-öyrədici, tərbiyəedici və inkişafetdirici formaları həyata keçməlidir. Nəticələr yalnız müəllim və şagird fəaliyyətini əhatə etməlidir. Pedaqoji prosesdə bütün şagirdlərə eyni təlim şəraiti yaratmaqla onların potensial inkişafları tənzimlənir. Müəllim və şagirdyönümlülük prinsipindən istifadə edərək öyrənənlərin maraq və tələbatlarının ödənilməsinə təlim işini yönəltməlidir. Cəmiyyət inkişaf etdikcə, hər sahədə olduğu kimi, pedaqoji sahədə də yeni-yeni tələblər irəli sürülür. Bu isə pedaqoji prosesi təkmilləşdirməyi, yeni məzmun, forma və metodları tətbiq etməyi zəruri edir.

Bildiyimiz kimi pedaqoji sistemin təkmilləşdirilməsi iki yolla həyata keçirilir: a) intensiv yol; b) ekstensiv yol. İntensiv yol pedaqoji sistemin daxili ehtiyatlarını işə salmaqla bağlıdır. Ekstensiv yol pedaqoji prosesə əlavə qüvvə, vaxt və vəsait cəlb olunmasını nəzərdə tutur. Məsələn, gənc nəslə daha möhkəm bilik vermək üçün təlim müddətini uzatmaq, proqramları genişləndirmək olar. Bu ekstensiv yoldur. Halbuki bunsuz da həmin məqsədə nail olmaq mümkündür. Məsələn, yeni metodlar tətbiq etməklə, mövcud forma və məzmunu təkmilləşdirməklə, şagirdlərə müstəqil iş bacarıqları aşılamaqla. Bu onları özünütəhsilə cəlb etmənin intensiv yoludur. Pedaqoji prosesdə yeniliklərin miqyası müxtəlif ola bilər: müəyyən bir metodu, formanı təkmilləşdirmək, yeni iş texnologiyaları tətbiq etmək,

yaxud təhsil-tərbiyə sistemini yeniləşdirmək.

Respublikamızda hazırda təhsil sahəsində islahatlar aparılır, təhsilin maddi bazasında təhsil və tərbiyə işinin məzmununda, metodikasında, müəllim-şagird münasibətlərində, idarəetmədə böyük dəyişikliklər baş verir. Pedaqoji sistemdə yeniliklərin əsas istiqamətləri özündə məktəbin demokratikləşdirilməsini, pedaqoji prosesin humanistləşdirilməsini, əməkdaşlıq pedaqogikasının tətbiqini, təlim-tərbiyə prosesinin fərdiləşdirilməsini, təhsil və tərbiyə işinin məzmununun genişlənməsini, təlim-tərbiyə prosesinin optimallaşdırılmasını, yeni pedaqoji texnologiyaların tətbiqini, məktəbin idarə edilməsi sisteminin təkmilləşdirilməsini, ixtisasartırma sisteminin yenidən qurulmasını, təhsilin dünya standartlarına uyğun qurulmasını və s. birləşdirir.

Təhsil sistemində innovasiya dedikdə geniş mənada təlim, təhsil-tərbiyə prosesinin gedişini və nəticələrini yaxşılaşdırmaq məqsədilə pedaqoji sistemdə həyata keçirilən yenilik başa düşülür. İnnovasiya, yəni yenilik pedaqoji sistemin daxili ehtiyatları hesabına (in – daxili deməkdir) baş verir. İnnovasiya keyfiyyətcə təkmilləşmiş pedaqoji sistemdə vəhdət halında götürülmüş ideyalar, proseslər, vasitələr və nəticələrdir. Pedaqoji sistemin yeniləşməsi çox vacib və aktual bir işdir, o, səriştəli təhlil, yaradıcı müəllim tələb edir. Son onillikdə çox şey dəyişmişdir. Yeni paradiqmalar, konsepsiyalar, innovasiyalar və investisiyalar (sərmayələr), dövlət standartları və alternativ tədris planları, yeni tip məktəblər yaradılmışdır. Pedaqoji proses pedaqoji sistemdə baş verir. Pedaqoji sistem komponentlərin (hissələrin) sabit və möhkəm birliyidir. Əgər bu birlikdə baş verən dəyişikliklər (yeniliklər) müəyyən edilmiş həddi keçərsə, onda sistem dağılar, onun yerində başqa xassələri olan yeni sistem əmələ gələr. Hər hansı pedaqoji sistemin strukturu bir-biri ilə qarşılıqlı əlaqədə olan elementlərin məcmusundan ibarətdir: şagirdlər; təlim və tərbiyənin ümumi və xüsusi məqsədləri, təlim və tərbiyənin məzmunu, təlim və tərbiyə prosesi, müəllimlər, texniki təlim vasitələri, təlim və tərbiyə işinin təşkili formaları, təlim, təhsil-tərbiyə prosesinin idarə olunması, təlim və tərbiyə prosesinin texnologiyası, təlim və tərbiyə prosesinin nəticələri. Bu sistemin komponentlərindən hər biri ən kiçik elementlərə parçalana bilər. Başqa sözlə, pedaqoji sistem qarşıya qoyulmuş məqsədə çatmağı təmin edən sabit təşkilati-texnoloji kompleksdir. Pedaqoji sistem texnologiyasız ola bilməz. Texnologiya olan yerdə keyfiyyət də olur. Keyfiyyət pedaqoji sistemin imkanlarını müəyyən edir və o, müəyyən mənada idarəetmədən asılıdır. Təlim və tərbiyə prosesinin məhsuldarlığı həmişə pedaqoji sistemin təkmilləşdirilməsi ilə bağlıdır. Bəzi aparıcı nəzəriyyəçilər belə bir fikir söyləyirlər ki, yaxın vaxtlarda pedaqogikada innovasiyalar keçmişə qayıtmağa gətirib çıxaracaqdır. Qərb məktəbi ekstensiv yolla inkişaf edir. O, yeni innovasiya texnologiyaları, tədris fəaliyyətinin müxtəlif növləri arasında vaxt bölgüsünü yenidən aparmaq, sinif işinin diferensiasiyası və fərdiləşdirilməsi hesabına pedaqoji məhsulun kəmiyyət göstəricilərini artırır. Pedaqoji sistemin səmərəliliyini bəlkə bu yolla yaxşılaşdırmaq olar. İnnovasiyaların obyekti aşağıdakı problemlərdir: təlim və tərbiyə fəaliyyətinin motivasiyasını (öyrənməyə, oxumağa olan marağı) necə yüksəltmək; dərsdə öyrənilən materialın həcmini necə artırmaq; təlimin sürətini necə artırmaq; vaxt itkisini necə aradan qaldırmaq və s. Yeni pedaqoji ədəbiyyatda innovasiya pedaqogikası (bu onun qeyri-rəsmi, şərti adıdır) təhsil-tərbiyənin paradiqmalarını dəyişməyi tələb

edir. Paradiqma nəzəri və praktik problemlərin həllinin əsasına qoyulan hakim nəzəriyyədir. İnnovatorlar belə hesab edirlər ki, klassik pedaqoji nəzəriyyə köhnəlmişdir, yeni şəraitdə indiki nəsillərə o nəzəriyyə əsasında təhsil-tərbiyə vermək olmaz. Müasir pedaqogika praktikada o qədər də dəyişdirici təsir göstərə bilmir. Belə olduğu halda o, inzibati-amirlik dövründə formalaşan ideyaları ilə ölkəmizin təhsil sistemini “qidalandırmaqda” davam edir. Əgər pedaqoji fikrin inkişafını təmin etmək istəyiriksə, pedaqogikanın metodoloji əsasını yeniləşdirmək lazım gələcəkdir. İdeoloji ehkamlar pedaqogikanı öz təbii inkişaf axarından çıxarmışdır. Uşaqların anadangəlmə bərabər doğulması, təhsil-tərbiyədə bərabər imkanlara malik olması kimi qeyri-real metodoloji prinsiplər buna misal ola bilər. Elm və təcrübə sübut edir ki, təhsil-tərbiyənin köməyi ilə çox şeyi dəyişmək olmaz. Pedaqogikada ziddiyyətli məsələlər çoxdur və ona görə də burada innovasiya son dərəcə vacibdir. Pedaqoji nəzəriyyənin və onun ardınca məktəbin gedəcəyi yol təlimin, təhsil-tərbiyə prosesinin fundamental əsaslarını müəyyənləşdirməsindən, yeni elmin və təhsil-tərbiyənin praktikasının hansı metodoloji əsas üzərində qurulmasından asılıdır. Pedaqogika elmi nəzəriyyələr sistemidir. Obyektivlik, məqsədəuyğunluq, sabitlik, ziddiyyətsizlik onun əsas səciyyəvi xüsusiyyətləridir. Hər hansı bir elmi nəzəriyyə kimi pedaqogikanın sistemini də elmi prinsip layihələşdirir, birləşdirir və saxlayır. Çünki obyektiv nəzəriyyənin əsas prinsipi ideoloji prinsip yox, ancaq elmi prinsip ola bilər. Pedaqoji sistemin optimallaşdırılması təhsil, təlim, tərbiyə prosesinin optimallaşdırılması bütünlükdə pedaqoji sistemə aid edilən innovasiyadır. Optimallaşdırma mümkün olan variantlardan ən yaxşısını seçib götürmək prosesidir. Pedaqoji sistem kimi mürəkkəb, dinamik, çoxplanlı sistemdə təlim, təhsil, tərbiyə prosesinin qurulmasının və təşkilinin, orada məqsədlərə nail olmağın minlərlə mümkün variantları mövcuddur. Konkret şəraitdə onlardan ancaq biri ən yaxşı ola bilər. Onu axtarıb tapmaq optimallaşdırmanın başlıca vəzifəsidir. Bu vəzifə mümkün variantları müqayisə etmək və alternativləri qiymətləndirmək yolu ilə həll edilir. Optimallaşdırma pedaqoji sistemin qarşıya qoyulmuş məqsədinə uyğun olmalıdır. Çünki həmin sistem o məqsədə nail olmaq üçün yaradılıb. Bu şəraitdə əldə edilən optimallıq digər şərait üçün yararlı olmaya da bilər. Ona görə ki, optimallaşdırma anlayışı həmişə konkretdir. Optimallaşdırmanın nəzəri və praktik istiqamətləri vardır. Nəzəri aspektdə – “optimallaşdırma” anlayışının sinonim variantları hesaba alma, müqayisə, tutuşdurma hesab olunur. Praktik aspektdə “optimallaşdırma” pedaqoji sistemin innovasiyası, yenidən təşkili və qurulması, qarşıya qoyulmuş vəzifələri həll etmək üçün onun ən yaxşı vəziyyətə gətirilməsi kimi başa düşülür. Optimallaşdırma vəzifələrin həlli meyarlarının seçilməsindən başlayır. Optimallaşdırmanın meyarı əlamətdir, göstəricidir. Onun əsasında inkişaf prosesinin mümkün variantları qiymətləndirilir və onlardan ən yaxşısı seçilir. Məntiq tələb edir ki, meyarda ancaq və ancaq bir göstərici (parametr) olsun. Amma pedaqogikada o, kompleks halda olur. Çünki pedaqoji sistemdə baş verən proseslərin səbəb-nəticə əlaqələrini bir-birindən ayırmaq mümkün deyil. Təlim-tərbiyə prosesi o zaman optimal hesab olunur ki, orada şagirdlər və müəllimlər yüklənmir və maksimum nəticə əldə olunur. Təcrübə göstərir ki, müəllim və şagirdlərin həddindən artıq yüklənməsi onların iş qabiliyyətini azaldır və sağlamlıqlarına pis təsir göstərir.

Pedaqoji ədəbiyyatda təlim-tərbiyə prosesinin optimallaşdırılmasının əsas

meyarı müəyyən şəraitdə şagirdlərin təhsil-tərbiyəsi və inkişafında maksimum mümkün olan nəticələr əldə etmək və həmin yaşda olan şagirdlərin sinif və ev işinə ayrılan vaxt normalarını gözləməkdir. Sistemli yanaşma optimallaşdırmanın metodoloji əsasını təşkil edir. O, pedaqoji prosesin bütün komponentlərini, qarşılıqlı əlaqələrin qanunauyğunluqlarını vəhdətdə götürməli, mürəkkəb dinamik sistemlərin idarə olunmasının ümumi nəzəriyyəsinə istinad etməyi tələb edir. Optimallaşdırma pedaqoji prosesi mövcud vəziyyətə, şəraitə uyğunlaşdırmağı nəzərdə tutur. Bununla belə, o, özü yeni şərait yaradır və pedaqoji prosesin ona tabe olmasını tələb edir. Burada heç bir ziddiyyət yoxdur. Belə ki, hər iki proses arasında qarşılıqlı əlaqə vardır. Təlim-tərbiyə prosesinin optimallaşdırılması o zaman mümkündür ki, pedaqoq əsas pedaqoji bilik və bacarıqlara, pedaqogikanın müəyyən etdiyi aparıcı qanunauyğunluqlarına və prinsiplərinə, kollektiv, qrup və fərdi fəaliyyətin təşkili texnologiyasına yiyələnmiş olsun, təhsilin, tərbiyənin və inkişafın vəzifələrini başa düşsün. Ancaq bu da həqiqətdir ki, bütövlükdə sistemi və onun hər bir elementini bilməklə optimal variantı seçmək olar. Əgər belə olmasa onda optimallıq ideyası həddindən artıq mürəkkəb bir şey hesab olunar, öz əhəmiyyətini itirər. Optimallaşdırma həm də qabaqcıl müəllimlərin təcrübəsinə istinad edir. Lakin onunla məhdudlaşmır. Tədqiqatlar göstərir ki, təlim-tərbiyə prosesini müvəffəqiyyətlə optimallaşdırmaq üçün müəllim müəyyən şəxsi keyfiyyətlərə, o cümlədən yaradıcı təfəkkür üslubuna, təfəkkür çevikliyinə, təfəkkür konkretliyinə, təfəkkür sistemliliyinə, qərarlar qəbul edən və fəaliyyət göstərən zaman həddi gözləmək qabiliyyətinə, daha tez ünsiyyətə girmək və pedaqoji taktı gözləmək bacarığına malik olmalıdır.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006.
2. Ağayev Ə. Yeni təlim metod və texnologiyalarından istifadənin nəzəri və praktik məsələləri // ARTPİ-nin “Elmi əsərləri”. Bakı, 2006.
3. Bayramov Ə., Əlizadə Ə. Psixologiya. Bakı: Maarif, 1989.
4. Əhmədov B., Hacıyev A. Pedaqogikanın qanunları və prinsipləri. Bakı: Maarif, 1993.
5. İbrahimov F. Ümumi pedaqogikadan mühazirələr. Bakı: Mütərcim, 2010.
6. Kazımov N., Həşimov Ə. Pedaqogika. Bakı: Maarif, 1996.

**М.Нуриева**

**Некоторые аспекты педагогического процесса**

**Резюме**

В статье говорится о качестве урока, об оптимализации учебно-воспитательной работы, о новых парадигмах, о задачах повышения мотивации.

**M.Nuriyeva**

**Some aspects of modern pedagogical process**

**Summary**

In the article the quality of education, optimization of educational issues, new paradigms, increasing motivation and other issues are discussed.

# MİLLİ PEDAQOGİKANIN PATRİARXI

Pedaqoji elmlər doktoru, professor, əməkdar elm xadimi, Rusiya Təhsil Akademiyasının akademiki Nurəddin Mustafa oğlu Kazımov ömrünün 90-cı ilini yaşayır. Onun pedaqoji elmin inkişafı ilə bağlı fəaliyyəti dövlətimiz tərəfindən yüksək qiymətləndirilmiş, "Şərəf nişanı" ordeni, "Əmək veteranı" medalı ilə təltif olunmuşdur. Prezidentin fərdi təqaüdçüsüdür. Uzun illər çalışdığı Azərbaycan Dillər Universitetinin professor-müəllim heyəti və tələbələr arasında böyük nüfuza malikdir. Respublika Pedaqoji Cəmiyyətinin sədri kimi ölkə müəllimlərinin böyük rəğbətini qazanmışdır.

Professor N.Kazımovun ideya-mənəvi siqlətində yaşanan nikbin notlar ətrafındakılar üçün həmişə xoş təmas, ibrətamiz nümunə xarakteri daşımışdır. Bu müqtədir insanın nurani çöhrəsindən süzülən məlhəm baxışlarda daima insana dəstək olan səmimiyyət, onu fərəhləndirən qüdsi keyfiyyətlər öz bariz təcəssümünü tapmışdır. Sözlə əməlin vəhdətini icra etmək, bu yolun ehtişamını ucaltmaq, ona qənşər gələn hər cür maneələri aradan qaldırmaq, bu yolda insana, insanlığa layiq qüdrət sahibi olmaq da onun xarakterinə aid cəhətlərdir.

Bu gün birmənalı olaraq demək olar ki, Nurəddin müəllimin elmi-pedaqoji ictimaiyyət arasında müstəsna xidmətləri vardır. O, pedaqoji elm və proses paradiqmaları (nümunələri) haqqında dərin elmi nəzəriyyələr sistemi vermiş, akademik tərbiyə səviyyəsini yüksəltməyin ənənəvi və müasir tendensiyalarının tətbiqi imkanlarını üzə çıxartmışdır. Müstəqillik şəraitində milli pedaqogika yaratmaq sahəsində uğurlu ideyaları ümumxalq və ümumdövlət səviyyəsində dəyərləndirilmişdir. O, ilk dəfə milli pedaqogikanın patriarxı kimi müstəqil bir məmləkətin təhsil inkişafı yolunda gərgin əmək sərf edərək, pedaqoji elmə özünəməxsus yeniliklər gətirmişdir. Onun yaradıcı platformasının əsas qayəsini azərbaycançılıq məfkurəsi, türkçülük mənəviyyatı və eləcə də mütərəqqi islami dəyərlər yolunda aparılan milli islahatçılıq nəzəriyyələrini reallaşdırmaq imkanları ilə ölçülən fəaliyyətin məzmunu təşkil edir.

Nurəddin müəllimin milli pedaqogikada "pedaqoji elmin əlifbası" kimi dəyər verdiyi pedaqoji məfhumlar, pedaqoji kateqoriyalar və pedaqoji anlayışlar haqqında bitkin metodologiyaya istinad edən faktoloji materiallar üzrə konseptual ideyaları bu gün də elmi ictimaiyyətin nəzərini cəlb edən problematik məsələlərdən biri kimi çox aktual səciyyə daşıyır.

Görkəmli pedaqoqun yaradıcılıq dünyasını işıqlandıran nəzəri-pedaqoji ideyalar sistemi metodoloji baxımdan real gerçəkliklərə, dialektik təfəkkür qanunauyğunluqlarına, xüsusən pedaqogikanın təşəkkülündə təzahür edən elmi prinsiplərə istinad edən faktlar üzərində qurulmuşdur.

O, elmi axtarışlarının ideya istiqamətini birmənalı olaraq tarixi-müqayisəli təhlil zəminində, milli-mənəvi dəyərlərə əsaslanmaqla daha çox tədqiqatlara cəlb etmişdir. O, daim pedaqogikanın nəzəri və təcrübi problemləri üzərində vicdanla çalışmış, bu işlərə vətəndaş-alim mövqeyindən yanaşmışdır.

Bir həqiqəti də qeyd etməliyik ki, bu işdə pedaqoji ictimaiyyəti ruhlandıran həm də o oldu ki, milli pedaqogika ruhunda yazılmış "Məktəb pedaqogikası", "Ali məktəb pedaqogikası", "Tətbiqi peda-

qogika” respublikamızda təhsil nazirinin əmri ilə ilk dəfə dərsliklər kimi çap olunmuşdur. Təsadüfi deyil ki, milli pedaqogika ideyaları əsasında ərsəyə gəlmiş “Məktəb pedaqogikası”nın müddəaları təhsil nazirinin xüsusi əmri ilə Bakı şəhərindəki 9 nömrəli məktəbdə sınaqdan keçirilmiş və nəticəsi Təhsil Nazirliyində ətraflı müzakirə olunmuşdur. O da təsadüfi deyil ki, həmin müzakirənin yekunu olaraq təhsil nazirinin “N.Kazımovun “Məktəb pedaqogikası” dərsliyinin müddəalarının pedaqoji prosesdə tətbiqi üzrə işlərin təşkili barədə” 2007-ci il avqustun 30-da 995 nömrəli əmri olmuşdur. Bu əmrə əsasən dərsliyin müddəaları həm təkmilləşmə və yenidənhazırlanma institutlarında, həm də Sumqayıt və Bakı şəhərlərinin bəzi məktəblərində tətbiq edilmişdir.

Bunlardan əlavə, Nurəddin müəllimin bilavasitə rəhbərliyi, redaktəsi və iştirakı ilə işıq üzü görmüş bir sıra əsərləri, o cümlədən “Azərbaycan milli izahlı ensiklopedik pedaqoji lüğət” (2005), “Pedaqogika kafedrası üzrə təhsil proqramı” (Kurikulum) (2007), “Məktəb pedaqogikası sxemlərdə” (2003) alimin uğurlu yaradıcılıq yolu hesab etmək olar.

Nurəddin müəllimin məhsuldar fəaliyyəti, çevik və işgüzar psixologiyası həmişə ona başucalığı gətirmişdir. Ağıl və zəka mədəniyyəti onun tərəf-müqabilləri ilə olan ünsiyyətində daim fərqlənir. Onun həssas müşahidəçi kredosu ilə pedaqoji proses təcrübəsini zənginləşdirməyi özündə ehtiva edən, milli və ümumbəşəri siqlətli dərslik, dərs vəsaitləri və tövsiyələri elmi-pedaqoji məzmun baxımından daha bitkin və yığcam nümunələrdir. Vaxtilə onun qaynar fəaliyyətinə daha böyük önəm verən pedaqogika üzrə fəlsəfə doktoru, dosent, mərhum Ayaz Kazımovun araya-ərsəyə gətirdiyi 16 cilddən ibarət “Seçilmiş əsərləri” bir daha yeni mündəricədə oxuculara təqdim olundu. Nurəddin müəllim fundamental elmi-tədqiqatlar müəllifi kimi də küll şəklində bu işləri toplamaqda, qruplaşdırmaqda, sistemə salıb, çapına nail olmaqda cəmi 50 il ömür yaşamış çox dəyanətli və mübariz ruhlu övladına bir ata qayğısı ilə dəstək oldu.

Nurəddin müəllimin pedaqoji fikirləri bu gün də aktual məzmun daşıyan didaktik ideyalarla zəngindir. Onun xalq arasında mədəni-maarif işlərini təbliğ və təşviqetmə sahəsində uğurlu yaradıcı fəaliyyəti – xüsusən Azərbaycan Pedaqoji Cəmiyyəti idarə heyətinin sədri kimi uzun illərin təcrübəsindən çıxmış bir ictimai qurumun dinamik iş sistemində daha canlı və cəlbedici nümunələrlə öz əksini tapmışdır.

Nurəddin müəllimin bir şəxsiyyət kimi xarakter bütövlüyü də olduqca maraqlıdır. O, sözünün kəsərini bilən, “ağır oturub-batman gələn” simalardandır. Ailədə, ictimai mühitdə, kollektivdə ona doğma, isti münasibətin olması da bunları bir daha təsdiqləyir.

Onun yüksək elmi erudisiyasında təfəkkür itiliyi, ağıl və idrak düşüncəliliyi, zəngin baxışlar sistemi nə qədər dərin və əhatəli mündəricəyə qadirdisə, mənəviyyat problematikasında da əldə etdiyi nəcib və munis davranış normaları gənc nəsil üçün qiymətli nümunədir. Onun istər pedaqoji yaradıcılığında, istərsə də ictimai fəaliyyətində vətən anlayışı xalq anlayışı ilə vəhdət təşkil edir. Nurəddin müəllimin irəli sürdüyü vətənpərvərlik doğma yurdu xarici hücumlardan müdafiə etmək, millətin müstəqilliyi və tərəqqisi uğrunda, onun yenilməzliyi və mübarizliyi yolunda fəal mövqe tutmağı özündə ehtiva edən əsl vətəndaş baxışı, cəsarətli və dönməz Vətən sevgisindən irəli gəlir. Bu gün də, o öz fədakar yaradıcı fəaliyyətinin fövqündə gedir. Ümidli gələcəyə böyük inam bəsləyir. Qarşıda onu hələ neçə-neçə uğurlu həyat ehtişamları

gözləməkdədir.

Nurəddin müəllim sadə bir Azərbaycan ziyalısının həyat yolunu keçmişdir. O, 1926-cı ildə Gəncədə anadan olmuş, orta təhsilini Gəncədə almışdır. Sonra Azərbaycan Dövlət Universitetində fəlsəfə fakültəsinə daxil olmuş (1945), III kursdan Leninqrad (Sankt-Peterburq) Universitetinə köçürülmüş (1947), oranı bitirdikdən sonra Azərbaycan Müəllimlər İnstitutunda, Bakı Vilayət Maarif Şöbəsində, Maarif Nazirliyində çalışmış (1950-1953), əyani aspiranturada təhsil aldıqdan (1953-1956) sonra irəli çəkilərək Azərbaycan Dövlət Elmi Tədqiqat Pedaqogika İnstitutunda direktor müavini (1957-1973), direktor (1973-1976), V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunda elmi işlər üzrə prorektor vəzifələrində işləmişdir (1976-1982). 1982-ci ildən 2015-ci ilədək Azərbaycan Dillər Universitetinin pedaqogika kafedrasının müdiri vəzifəsində çalışmışdır. N.Kazımov pedaqogikanın mövzusuna, məqsədinə, vəzifələrinə, tədqiqat sahələrinə, təlim-tərbiyə və təhsil kateqoriyalarının mahiyyətinə, onların qarşılıqlı əlaqəsinə, pedaqoji prosesin ziddiyyətlərinə, qanunauyğunluqlarına, qanunlarına, prinsip-lərinə, üsullarına, şəxsiyyətin formalaşmasına, tərbiyə komponentlərinə (ağıl tərbiyəsi) və digər məsələlərə dair irəli sürdüyü yenilikləri respublikada ilk dəfə olaraq hazırladığı “Məktəb pedaqogikası”, “Ali məktəb pedaqogikası” və digər əsərləri vasitəsilə respublika və dünya ictimaiyyətinə təqdim etmişdir. Nəticə olaraq N.Kazımov yeni pedaqoji cərəyan olan milli pedaqogika formalaşdırmışdır.

Onun orta ümumtəhsil məktəblərinin III, IV sinifləri üçün “Ana dili” (1970-2003) və “Oxu” (1970-2005) dərslikləri, “Məktəbdə müqayisə üzərində işin nəzəriyyəsi və təcrübəsi” (1970), “Tərbiyənin elmi-pedaqoji əsasları” (1983) adlı monoqrafiyaları, ümumiyyətlə, 500-dən artıq müxtəlif xarakterli əsərləri orijinallığı ilə fərqlənir.

Altmış illik zəngin pedaqoji fəaliyyəti dövründə 100-ə qədər elmi konfranslarda məruzəçi olan, 30-a qədər aspirant, dissertant və doktoranta elmi rəhbərlik edən N.Kazımov bir ictimai xadim kimi Azərbaycan pedaqoji və psixoloji tədqiqatları əlaqələndirmə şurasının sədri (1970-1976), Maarif və Xalq Təhsili Nazirliklərində pedaqogika və psixologiya üzrə Elmi Metodik Şuranın sədri və digər ictimai vəzifələr aparmışdır.

N.Kazımov 10 il Tbilisi şəhərində pedaqoji elmlər doktoru alimlik dərəcəsi almaq üçün Regional İxtisaslaşdırılmış müdafiə şurasının, Azərbaycanda Ali Attestasiya Komissiyası yaranandan sonra pedaqogika və psixologiya elmləri üzrə ekspert şurasının üzvü olmuşdur.

Nurəddin Kazımov 1960-cı ildə “Qabaqcıl maarif xadimi”, 1971-ci ildə “SSRİ maarif əlaçısı” döş nişanları ilə təltif olunmuşdur.

Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin 1 fevral 1990-cı il tarixli fərmanı ilə respublikada elmin inkişafında və yüksəkixtisaslı kadrların hazırlanmasında xidmətlərinə görə Kazımov Nurəddin Mustafa oğluna “Əməkdar elm xadimi” fəxri adı verilmişdir.

Azərbaycan Müəllimlərinin Yaradıcı İttifaqı idarə heyətinin 25 aprel 1996-cı il tarixli qərarı ilə məktəbdə təlim-tərbiyə prosesinin yeniləşməsi sahəsində səmərəli praktik və elmi nailiyyətlər qazandığına görə akademik M.Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.

Ən əsası budur ki, Nurəddin müəllim ənənəvi pedaqogikanın tədqiqat mövzusundan tutmuş bütün kateqoriya və məfhumlarını respublikamızın dövlət müstəqilliyi baxımından təhlil etmiş və demək olar ki,

yeni pedaqogika - Milli pedaqogika yaratmışdır. 2006-cı ildən “Milli pedaqogika məktəbi” adında qurum və eyni adda jurnal fəaliyyətdədir. Onun əsərləri, fəaliyyəti və şəx-siyyəti barədə 200-dən artıq çap olunmuş mənbədə məlumat vardır.

Nurəddin müəllim respublikamızın ictimai həyatında fəal iştirak edir. O, 1968-ci ildən “Azərbaycan məktəbi” jurnalı redaksiya heyətinin üzvüdür. Müxtəlif illərdə Bakıda, Tbilisidə və Naxçıvanda yaradılmış müdafiə şurasının sədri və ya üzvü olmuşdur. O, layiqli bir vətəndaş olaraq milli təəssübkeş keyfiyyətlərə malik qədirbilən insandır.

Ən başlıcası budur ki, Nurəddin Kazımov Ermənistan-Azərbaycan və Rusiya-Azərbaycan münasibətlərinə dair cəsarətli vətəndaş-ziyalı mövqeyini öz yazılarında dönə-dönə nümayiş etdirmiş və etdirməkdədir.

Milli pedaqogikanın memarı və yaradıcısı olan bu münəvvər insanı bir daha 90 illik yubileyi münasibətilə təbrik edir, ömür-gün yaşamında ona cansağlığı və uzun ömür arzulayırıq.

**Vidadi Bəşirov,**
***Azərbaycan Dillər Universitetinin pedaqogika kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

# ELM FƏDAİSİ, GÖRKƏMLİ PEDAQOQ

Azərbaycan elmi anatomiya məktəbinin banisi, görkəmli pedaqoq və ictimai xadim, əməkdar elm xadimi, tibb elmlər doktoru, professor, tibb elmi üzrə tanınmış mütəxəssis Kamil Əbdül Salam oğlu Balakişiyev 1906-cı il sentyabrın 20-də Bakının Novxanı kəndində anadan olub. O, Bakıdakı rusdilli gimnaziyanı bitirdikdən sonra 1921-ci ildə Bakı Universitetinin tibb fakültəsinə qəbul olunub və 1926-cı ildə həmin fakültəni əla qiymətlərlə bitirərək normal anatomiya kafedrasında saxlanılıb. O, bu kafedrada assistentlikdən professor, kafedra müdiri vəzifəsinə qədər yüksəlib, 1930-cu ildə privat dosent, dosent vəzifələrinə seçilib. O, 36 il N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun normal anatomiya kafedrasının müdiri, 17 il ATİ-nin tədris işləri üzrə prorektoru, uzun illər Azərbaycan SSR Elmlər Akademiyasının "Tibbi Terminologiya Komitəsi"nin sədri vəzifələrində çalışmışdır.

1930-cu ildə Azərbaycan Dövlət Tibb İnstitutu yaradıldıqdan sonra Azərbaycan bölməsində (BDU-nun tibb fakültəsində dərslər ancaq rus dilində aparılırdı) təhsil alan tələbələr dərsliksiz qalmışdı. Ona görə də 1932-ci ildə ATİ-nin yaradıcılarından biri və eyni zamanda rektoru olan görkəmli elm və dövlət xadimi professor Əziz Əliyev göstəriş vermişdi ki, mövcud olan hər kafedrada təcili şəkildə orada tədris edilən fənnin profilinə uyğun olaraq Azərbaycan dilində dərsliklər yazılsın. Normal anatomiya kafedrasında bu iş K.Balakişiyevə həvalə edildi və o, ona tapşırılan işlərin öhdəsindən bacarıqla gələrək Azərbaycan dilində anatomiyanın bütün bölmələri üzrə orijinal dərs kitabları hazırladı. Alim bu illər ərzində həm də Azərbaycan-latın-rus dillərində "Tibb terminləri lüğəti" adlı kitabları da çap etdirdi.

Yeri gəlmişkən qeyd edək ki, akademik Mustafa bəy Topçubaşov K.Balakişiyevin 1976-cı ildə keçirilən 70 illik yubiley tədbirində çıxış edərkən demişdi ki, mən professor K.Balakişiyevin ruhu qarşısında baş əyirəm, ona görə ki, əgər K.Balakişiyev



Azərbaycan dilində tibbi terminologiya tərtib etməsəydi, mən 5 cildlik "Cərrahiyyə" adlı dərsliyi yazıb başa çatdıra bilməzdim. Azərbaycan dilində tibb terminlərinin olmaması böyük çətinliklər yaradardı. Professor Kamil Balakişiyev bizi bu çətinliklərdən xilas elədi. Bu da onun alim böyüklüyünün təzahürlərindəndir.

K.Balakişiyev 1948-1959-cu illərdə dünyada analoqu olmayan 4 cildlik "İnsanın normal anatomiyası" adlı orijinal dərsliklər çap etdirdi. 1964-cü ildə isə latın, Azərbaycan və rus dillərində yazdığı "Anatomik Terminologiya" kitabı işıq üzü

gördü.

K.Balakişiyevin apardığı elmi-tədqiqat işlərinin əsas istiqamətini periferik sinir sisteminin və vəzilərin morfogenezi, struktur elementləri, onların fərdi, cinsi və yaş xüsusiyyətlərinin təhlili, əldə olunan nəticələrin səhiyyə təcrübəsinə tətbiqi təşkil edirdi. Onun yaratdığı elmi məktəbin tələbələri də mövzular ətrafında namizədlik və doktorluq dissertasiyaları müdafiə edirdilər. Bilavasitə onun rəhbərliyi altında 15 nəfər elmlər doktoru və elmlər namizədi hazırlamışdır.

1936-cı ildə K.Balakişiyev bel kələfinin ən böyük şaxələrindən olan bud sinirinin makromikroskopik anatomiyasının öyrənilməsi üzrə apardığı silsilə elmi-tədqiqat işlərinin nəticələrinə görə tibb elmləri namizədi, 1937-ci ildə isə paralel olaraq yerinə yetirdiyi sidik kanalı soğanağı vəzilərinin (Meri və ya Kuper vəzilərinin) mükəmməl tədqiqinə əsasən dissertasiya müdafiə edib və tibb elmləri doktoru elmi dərəcəsinə layiq görülüb. Elə həmin ildə professor elmi adı təsdiq edilən alim həm də normal anatomiya kafedrasının müdiri vəzifəsini yerinə yetirməyə başlayıb və ömrünün sonuna qədər bu vəzifəni şərəflə yerinə yetirib. Professor K.Balakişiyev uzun illər SSRİ Anatom, Histoloq və Embrioloqlar Elmi Cəmiyyətinin üzvü, Azərbaycan Anatom, Histoloq və Embrioloqlar Elmi Cəmiyyətinin sədri vəzifələrində çalışıb.

Kamil Balakişiyevin rəhbərlik etdiyi kollektiv 1941-1945-ci illər müharibəsi dövründə arxa cəbhədə fədakarlıq və əzmkarlıqla çalışaraq vətən üçün, cəbhə üçün savadlı həkimlər ordusunun hazırlanmasında gecə-gündüz yorulmaq bilmədən fəaliyyətlərini davam etdirərək əsl qəhrəmanlıq nümunəsi nümayiş etdiriblər. Elə bu illərdə professor K.Balakişiyevin arxa cəbhədə tibb kadrları hazırladığı üzrə yerinə yetirdiyi əvəzsiz xidmətlər dövlət tərəfindən yüksək qiymətləndirilmiş və o, “Əməkdar elm xadimi” fəxri adına layiq görülmüşdür.

Kamil müəllimin hazırladığı milli kadrların əksəriyyəti normal anatomiya kafedrasında əsl həyat məktəbi keçdikdən, püxtələşdikdən sonra Azərbaycan Dövlət Tibb İnstitutunun digər kafedralarında, eləcə də Moskvada, Sankt-Peterburqda, Ukraynada, Rusiyanın digər şəhərlərində aparıcı mütəxəssis, kafedra müdiri vəzifələrində çalışırdılar və onlardan bəziləri fəaliyyətlərini hazırda da davam etdirirlər.

Görkəmli alim 1946-1963-cü illərdə 17 il müddətində Tibb İnstitutunun tədris işləri üzrə prorektoru vəzifəsində çalışaraq bu işi də zərgər dəqiqliyi, büllur çeşmə təmizliyi, vicdan səsinin nəcib hökmü ilə yerinə yetirirdi. Ona görə də hamı onu ölkəmizin ən təvazökar, ən xeyirxah pedaqoqlarından biri kimi tanıyırdı.

Professor K.Balakişiyevin tibb təhsilinin və tibb elminin inkişafı, tibb kadrlarının hazırlanması yolunda göstərdiyi xidmətlər dövlət və xalq tərəfindən yüksək qiymətləndirilib. O, vətənin orden və medallarına, mükafat və təltiflərinə layiq görülüb. Bakı şəhərində onun adını daşıyan küçə vardır. Kafedrada, onun yaratdığı unikal elm və tədris muzeyində Balakişiyev guşəsi yaradılıb. Bu guşə hər gün müəllim və tələbələr tərəfindən ziyarət edilir.

Kamil müəllim böyük alim olmaqla yanaşı, xeyirxah və təvazökar bir insan kimi tələbələrinin və onu tanıyan ziyalıların qəlbində daim yaşayacaqdır.

**Vaqif Şadlinski,**
***ATU-nun insan anatomiyası kafedrasının müdiri, Rusiya Elmlər Akademiyasının akademiki, əməkdar elm xadimi, professor***



# ŞƏHRİYAR YARADICILIĞI MİLLİ-MƏNƏVİ DƏYƏRLƏR KONTEKSTİNDƏ

**Elman Quliyev,**
***filologiya üzrə elmlər doktoru, professor***

Məqalədə böyük Azərbaycan şairi Şəhriyarın yaradıcılıq yolundan, onun şeirlərindəki milli-mənəvi dəyərlərdən bəhs edilir. Təhlildə "Heydərbabaya salam" poemasının əhəmiyyətindən danışılır.

***Açar sözlər:*** *milli-mənəvi dəyərlər, vətəndaş mövqeyi, müasir ədəbi proses, milli duyğular.*

***Ключевые слова:*** *национально-духовные ценности, гражданство, современный литературный процесс, национальные чувства.*

***Key words:*** *national and moral values, citizenship, modern literary process, national feelings.*

XX əsr Şərq şeirinin nadir simalarından olan Məhəmmədhüseyn Şəhriyar (1906-1988) Azərbaycan ədəbiyyatının korifey sənətkarlarındandır. "Şəhriyar" təxəllüsü ilə çağdaş dünyanın fars və türkdilli regionlarında məşhurlaşan, yaradıcılığı xalq kütləsinin müxtəlif təbəqələri arasında geniş miqyasda yayılan və kütləvi sürətdə oxunan Seyid Məhəmmədhüseyn Mirağa oğlu Xoşginabi Azərbaycan şeirinə yeni nəfəs gətirmişdir.

Ədəbiyyatşünas alimlər, xüsusilə Şərq poeziyasının biliciləri və araşdırıcıları belə ümumi bir rəydədirlər ki, "son altı yüz ildə Şəhriyar lirikası Hafizdən sonra bütün sələflərindən üstün mövqe tutmaqdadır" (1). Əlbəttə, sitatda müəyyən mübahisə çalarları olsa da, Hafizin fars dilli şeirin inkişafı tarixində tamamilə yeni və orijinal bir mərhələ təşkil etdiyini nəzərə alsaq, ona bərabər və üstün tutulan Şəhriyarın poetik qüdrəti haqqında aydın təsəvvür hasil etmək olar. Bu mənada Şəhriyar lirikası yaradıcılığı ilə Şərq xalqlarının poetik təfəkkürünü zənginləşdirən və yeni - rəngarəng çeşnilərlə onu rövnəqləndirən Firdovsi, Nizami, Xaqani, Sədi, Hafiz, Xəyyam, Cami, Füzuli, Seyid Əzim, Sabir, Bahar, S.Vurğun kimi şairlər silsiləsində yeni ədəbi zirvə təşkil edir.

Şəhriyar şeirinin qüdrəti bütün klassiklərdə olduğu kimi məzmun və formanın vəhdətdə olub, insan şüuruna və hissinə sərrast təsir göstərməklə məhdudlaşmır. Onun zəngin yaradıcılığı çoxçalarlı və müxtəlifistiqamətlidir. Bu sənətdə şairin mənsub olduğu cəmiyyətin, yaşadığı mühitin hadisə və əhvalatlarının həyati, fəlsəfi, tarixi anlamda dərki və qiymətləndirilməsi əsas yerlərdən birini tutur.

Şəhriyar bütün mütərəqqi sələfləri kimi hər şeydən əvvəl öz əsrinin oğludur. Onun yaradıcılığında İran siyasi - ictimai mühitinin əlli ildən artıq bir mərhələsi, sosial mühitin doğurduğu duyğular poetik ifadəsini tapmışdır.

Şəhriyar yaradıcılığının milli təkamül prosesi keçməsi onun milli-bədii,

milli-estetik göstəricisi anlamında bu sənətin əhəmiyyətini daha da artırır. Məlum olduğu kimi, uşaqlıq illəri istisna edilərsə, onun ömrünün əvvəlki otuz ili İran-fars mühitində – Tehran, Nişabur və Məşhəd siyasi - coğrafi mühitində keçmişdir. Doğma Azərbaycan türk mühitindən ayrılıb Tehranda Pəhləvi rejiminin təzyiqi altında yad dildə yazmağa, türk ruhunu farsca ifadə etməyə məcbur olmuşdur. Bu mənada Şəhriyar yaradıcılığının tədqiqi milli mənliyi və dili qadağan olmuş Azərbaycan xalqının azadlıq mübarizələrinin tarixini öyrənmək baxımından xüsusi əhəmiyyət kəsb edir.

Qeyd edək ki, Şəhriyar yaradıcılığı fars və Azərbaycan dillərində formalaşmışdır. Lakin onun yaradıcılığında fars dilli nümunələr əksəriyyət təşkil etsə də, Şəhriyar bütün hallarda milli Azərbaycan şairi təsirindədir. Hər şeydən əvvəl ona görə ki, onun yaradıcılığında Azərbaycan mənəviyyatına, Azərbaycan ruhuna xidmət, millilik, azərbaycançılıq və türkçülük ideyalarına bağlılıq üstünlük təşkil edir. Yaradıcılığının ayrı - ayrı nümunələrində olduğu kimi, "Səhəndim" şeirində dediyi "elimin farsca da dərdini söylər diliyəm mən" sözləri fikrimizin təsdiqi baxımından əhəmiyyətlidir. Şəhriyar sənətində milli dəyərlər xalqımızın tarixi və bugünkü gerçəkliyi ilə onun gələcək həyatına münasibətinin şairin bədii düşüncə və ifadəsi tərzindədir. Şəhriyar yaradıcılığı Azərbaycan xalqının tarixi gerçəklik, həyati baxış, gələcək arzu və istəklərini əks etdirmək baxımından xüsusi olaraq xarakterikdir. Onun sənət dünyası sirr və möcüzələr dünyasıdır. Şəhriyar yaradıcılığının milli dəyərlərindən danışarkən, ilk növbədə, onun vətənpərvərlik mövqeyini əks etdirən əsərlərindən bəhs açmaq lazımdır. Nəzərə alsaq ki, onun poeziyasının təxminən yarıdan çoxu ictimai-siyasi səciyyə daşıyır və bunların böyük əksəriyyəti bir çox mənalarda sırf milli duyğuların ifadəsinə xidmət edir, onda böyük ustadın bu xüsusda hansı səviyyədə dayanması tamamilə açıqlana bilər.

Şəhriyar elinə, obasına, xalqına möhkəm tellərlə bağlı olan, bu səbəbdən də sənətində qeyrətli vətəndaş mövqeyini daim nümayiş etdirən sənətkar olmuşdur. Vahid vətən problemi onun poeziyasında daha böyük məna və ideya kəsb etmişdir. Çünki parçalanmış Azərbaycan dərdi Şəhriyar yaradıcılığında aparıcı və ardıcıl səciyyə daşıyır. Və ən maraqlı hal odur ki, ustad sənətkar bu məsələni faktik vəziyyət, tarixi reallıq səviyyəsindən təsvir edərkən münasibətini kəskin etiraz və barışmazlıq şəklində nümayiş etdirmişdir.

Şəhriyar poeziyasının üfüqlərinin genişliyi bilavasitə onun xalq həyatına yaxınlıq və bağlılığı ilə əlaqədardır. Fikirlə hissin vəhdətindən yaranmış lirik şeirlərində şair insan qəlbinə daha tez yol tapır və qəzəlin, qəsidənin, məsnəvinin, qitə və rübailərin gözəl nümunələrini yaradır. Şəhriyarın sənəti klassik irs və müasir ədəbi proseslə möhkəm bağlıdır. Lakin ustad şairin başqaları ilə müqayisədə böyüklük və fərqi ondadır ki, o, klassik və müasir ədəbi ənənə və proseslərə yaradıcılıqla yanaşmış, özünün novatorluğunu daim nümayiş etdirmişdir.

Şəhriyar maddi aləmdə heç nəyi "şeirsiz" təsəvvür etmək istəmir. Və kainatda olan hər cür pisliklərin səbəbini "şeirsizlikdə" axtarır. O, cənnəti bir varlıq kimi qəbul edir, lakin "şeirsiz" cənnəti heç cür təsəvvür edə bilmir. Şair bədii şərtilik daxilində fikirlərini belə ifadə edir:

Şeirsiz bir dünya - kədər, qəm kimi,
Şeirsiz cənnət də cəhənnəm kimi (14).

Şəhriyarın zəngin yaradıcılıq irsi özünün mövzu dairəsinə, əhatə imkanlarına görə olduqca genişdir.

Şəhriyar bir sənətkar kimi həyata daha çox bağlı olmuşdur. Bəzi sufi və guşənişinlik məqamları çıxmaq şərti ilə o,

*6

realistliyinə, sənətinin dünyəvi mahiyyətinə görə daha çox fərqlənmişdir. Bu səbəbdəndir ki, Şəhriyar lirikasının ictimai mahiyyəti daha dərin, daha genişdir. Nəzərə alaq ki, şairin məhəbbətin tərənnümünə, təbiət təsvirinə, tərcümeyi-hal xarakterli və digər bölümə aid şeirlərində də ictimai-siyasi cəhət az əhəmiyyət kəsb etmir. Hər şeydən əvvəl, bu halın normal təzahürünü Şəhriyarın həyata, həyat hadisələrinə fəal müdaxilə və münasibətində, onun layiqli, qeyrətli vətəndaş-şair mövqeyində axtarmaq düzgün səslənərdi.

Yaradıcılığı ilə dərindən tanışlıq onu göstərir ki, Azərbaycan mövzusu geniş mənada Şəhriyar poeziyasının baş mövzusudur. "Azərbaycan", "Əziz Azərbaycanıma xitab", "El bülbülü", "Döyünmə-söyünmə", "Süleyman Rüstəmə", "Can Rüstəm", "Oyun olduq" və bu kimi çoxsaylı şeirlərində böyük Azərbaycan obrazı timsalında bu diyarın keçmiş və bu günü gözlərimiz qarşısında canlanır, millətimizin zaman-zaman üzləşdiyi problemlər diqqətə çatdırılır, türk iradəsinin əyilməzliyi nümayiş etdirilir:

Yaman günlər keçib-gedib itəndi
Bir yaxşılıq muradına yetəndi
O tay-bu tay fərqi yoxdu Vətəndi.

Şəhriyar Azərbaycan xalqının tarixinin, mədəniyyətinin qədim və böyüklüyünə görə daim fərəh duymuş, dünya xalqları arasında millətinin zəngin mədəni-mənəvi keyfiyyətlərini ən qabarıq formada tərənnüm etmişdir. "Türkün dili tək sevgili, istəkli dil olmaz", "Türkü vallah analar oxşarı laylay dilidir" və s. kimi misralarda milli təəssübkeşlik amili ön planda dayanır.

"Heydərbabaya salam" poeması dahi Şəhriyar yaradıcılığının zirvəsidir. Heydərbaba dağ adıdır. "Heydərbabaya salam" isə möhtəşəm bir sənət dağıdır. Şəhriyar "Heydərbabaya salam" əsəri ilə "Azərbaycan türkünün milli həyatını bütün cəhətləri ilə göstərməyə müvəffəq ola bilmişdir" (4).

"Heydərbabaya salam" poeması zəngin xüsusiyyət və keyfiyyət göstəricilərinə görə həmişə diqqət mərkəzində olmuşdur. Hər şeydən əvvəl, poemanın doğma ana dilində - Azərbaycan dilində yazılması xüsusi hadisə hesab olunmalıdır.

Ustad Şəhriyar bu əsəri ilə milli duyğuların tərənnümü və təntənəsini əks etdirmiş, söz sənətinin uca zirvəsini fəth etmişdir. Əsərin ümdə cəhətlərindən biri də o idi ki, qeyri-azərbaycanlılar, xüsusilə də farslar əsəri oxumaq üçün Azərbaycan dilini öyrənmək məcburiyyətində qaldılar. Nəticədə, əsərlə üz-üzə dayanan hər bir oxucu xalqımızın mənəviyyatı, həyata baxışları, arzu və istəkləri, irili-xırdalı məişət tərzi və s. ilə yaxından tanış olmağa başlamış və türk milli ruh dəyərlərinin intəhasızlığının şahidi olmuşlar. Əsərdə xalqımızın dilinə xas olan ləhcə və spesifik sözlərin işlədilməsi də bir növ millilik amilinə xidmət göstərir. Bu mənada ədəbiyyatşünas alim Mehdi Rövşənzəmirin fikirlərinə M.Rəsulzadənin reaksiyası təsadüfü deyildir: "Qoy quzular ayın-şayın otlasın" misrasındakı "ayın - şayın" ifadəsini hansı bacarıqlı tərcüməçi Azərbaycancadan başqa bir dilə çevirə bilər? – deyir" (13). Göründüyü kimi, Şəhriyar "Heydər-babaya salam" əsəri üçün elə bir forma seçdi ki, heç kim tərəfindən gələcəkdə dəyişdirilə bilməyəcək bu formada (qadağan olunmuş mühitdə belə) Azərbaycan xalqı özünü bütün mənalarda təsdiq etdi.

Poema üzərində şair xeyli vaxt, uzun illər işləməsə də, əsər şairin çoxdan bəri kökləndiyi, qəlbində yaşatdığı, qanına keçirdiyi, ömrünə hopdurduğu hadisə, əhvalat və təəssüratların yenidən dirilməsi və canlandırılması nəticəsində ortaya çıxmışdır. Onu da qeyd edək ki, şair poemanı qəlbində uzun müddət yaşatmış, onun ortaya çıxması üçün şərait "axtarmışdır". Anasının şirin

xatirələrindən təsirlənən Şəhriyar öz poemasını anasının ilıq nəfəsinə qatıb gözəl əsər yaratmışdır. Bəlkə də bu səbəbdəndir ki, "Heydərbabaya salam" poeması hər bir azərbaycanlı üçün ana laylası qədər əziz və müqəddəsdir. Ustad Şəhriyar Heydərbaba dağından bir tribuna kimi istifadə edərək öz arzu və istəklərini bütün dünyaya bəyan etmişdir.

Akademik Mirzə İbrahimov öz tədqiqlərində "Heydərbabaya salam" poemasını xüsusi hal hesab edir və bu baxımdan qiymətləndirir: "Şəhriyarın "Heydərbabaya salam" poeması onun əsərləri içərisində xüsusi yer tutur, onun vətənpərvərlik duyğularının və humanizminin parlaq ifadəsidir" (7). "Heydərbabaya salam" poeması xalqın arzu və istəyinin, onun keçmişi və bu gününün, dərd və ehtiyaclarının, adət və ənənələrinin, gələcəyə baxışlarının və s. bədii salnaməsidir. Şair poemanın mövzusunu xalqın həyatından götürdüyü kimi, onun ideyasını da xalq və vətən problemləri fonunda tərənnüm edir. Şəhriyarın poemada toxunduğu, həllinə çalışdığı problemlər say etibarilə olduqca çoxdur, rəngarəngdir. Poemada çoxsaylı problemlər içərisində birinci növbədə Şəhriyarın doğulduğu, ayaq tutub yeridiyi, boya-başa çatdığı Vətən torpağı, Vətən gözəlliklərinin və s. təsvir və tərənnümünə geniş yer verilir.

Poemanın ilk bəndləri haradasa əsərin bədii müqəddiməsidir. Əsər boyu bir-iki bəndi çıxmaq şərti ilə digər bəndlərin də yuxarıdakı funksiyanı yerinə yetirmək xüsusiyyəti vardır:

Heydərbaba, Qərə kölün dərəsi,
Xoşginabın yolu, bəndi, bərəsi,
Orda düşər çil kəhliyin fərəsi,
Ordan keçər yurdumuzun özünə,
Biz də keçək yurdumuzun sözünə (14).

Poemada realizm özünü canlı həyat həqiqətlərinin təzahüründə göstərir. Doğma yurdundan uzaq düşən şair bu yurdda keçirdiyi uşaqlıq illərinin fərəhini təsəvvüründə xəyalən canlandırır və belə təsvirlərdə təsir real və təbii alınır. Bəndin sonunda şair ani olaraq ictimai mənaya keçidi təmin edir:

Bu damlarda çoxlu cızıx atmışam,
Uşaqların aşıqların udmuşam,
Qurquşunlu saqqa alıb satmışam,
Uşaq necə heç zadınan şad olar,
İndi bizim qəmi tutmur dünyalar (14).

Ustad Şəhriyar Cənub poeziyasında forma və məzmun baxımından poemanın yeni cəhətlərini kəşf etmişdir. Təbii ki, bu hal sənətkar istedadı ilə bağlanır. Şəhriyar "Heydərbabaya salam" poemasında diqqət mərkəzində saxladığı sevincin, kədərin, dərdin, ümumiyyətlə, bütün hadisə və əhvalatların təsirini özünəməxsus şair hisləri ilə aşılamışdır.

Şəhriyar maraqlı, həm də orijinal üslublu sənətkardır. Bu üslub sadə, səmimi və təbiidir. "Heydərbabaya salam" poeması məhz bu üslubda yazılmışdır. Əsəri oxuyanda oxucu özünü poemadakı hadisə və əhvalatların mərkəzində hiss edir. Poemada oxucu ən güclü müşahidəçidir. O, müşahidələrində sənətkar təsvirinin real, təbii və həqiqiliyinə şübhə ilə yanaşmır. Poemada adı çəkilən şəxslər də, yerlər də sanki oxucunun şəxsən tanıdığı, həmsöhbət olduğu adamdır, səyahət etdiyi məkandır. Şübhəsiz, bu təsvirlərdə tipik Azərbaycan həyatı öz əksini tapır:

Bu xırmanda "aradanxır" oynardux,
Comalaşıb qarışqatək qaynardux,
Yavaş-yavaş baxçalarda ağnardux,
Ağaclardan çilingağac kəsərdux,
Qoruqçunun qorxusundan əsərdux (14).

"Heydərbabaya salam" poeması şairin həm öz keçmişinə, həm də yaşamış olduğu həyatın özünə səyahət etmək, hadisələri nağıl etmək yolu ilə qələmə alınmışdır.

Poemada şair özü əsas obrazdır. Poema bir şəxsin dilindən danışılır. Təhkiyəçi Şəhriyarın özüdür. O, türkcənin sadə və saflığından istifadə edərək xüsusi bir yol seçir. Şair bu yolu özü üçün asan hesab edir. Ona görə yox ki, Şəhriyar öz istedadına və şairlik məharətinə sığınıb yeni yol kəşf edir, həm də bu yolla hadisələrin ardıcıllıq və vəhdətinin özünəməxsus nizamını yaradır. Bu yolla Şəhriyar eyni zamanda əsərdə bütün məsuliyyəti öz üzərinə götürmüşdür. Elə bu səbəbdəndir ki, poemada oxucu şairin özü ilə bərabər təsvir olunan hadisələrlə sıx bağlana bilir. Oxucu üçün təsvir olunan hadisə və əhvalatların bütün daxili aləmi açılır, nəticədə mahiyyət üzə çıxır:

Mənim yolum məhəbbət caddəsiydi,
Son sözlərim haqqın iradəsiydi,
Məhəbbətin risalət vədəsiydi,
Yoxsa məndə bir kəs ilə qərəz yox,
Siyasət adlı məndə bir mərəz yox (14).

Bütün poema boyu "siyasət mərəzi" olmayan sənətkar heç bir şeyə ideoloji don geyindirmədən obyektiv təsvir və münasibətə yer verir. Ona görə də poemadakı fikirlər mövcud həyatın, şəraitin reallıqları şəklində təsir bağışlayır:

Səhər tezdən naxırçılar gələrdi,
Qoyun-quzu dam-bacada mələrdi,
Əmməcanım körpələrin bələrdi
Təndirlərin qovzanardı tüstüsü,
Çörəklərin gözəl iyi, istisi (14).

Poemada hadisələrə özünəməxsus yanaşmaq və ifadə etmək xüsusiyyəti diqqəti cəlb edir. Məsələn, poemanın birinci hissəsində qəribçiliyin təsirindən Heydərbabaya xitab, ayrı-ayrı şəxslərə müraciət və onların yada salınması daha çoxluq təşkil edir. Bu hissədə 29 dəfə Heydərbaba dağına müraciət edilir, onlarla şəxsin adı sadalanır. Ona görə ki, şair birinci hissəni Vətəndən uzaqda, qərib məkanda yazmışdı. İkinci hissədə isə bu cür qəribçilik nisgilini biz az müşahidə edirik. Bu hissədə şair doğma Vətəndə görünür, müqəddəs sandığı torpağı qarış-qarış gəzir. Torpağın hər yerində özünün uşaqlıq dövrünün izlərini görür. Şair üçün Vətən daha da şirin, daha da müqəddəs olur:

Burda şirin xatirələr yatıblar,
Daşlarıylan başı - başa çatıblar
Aşnalığın daşın bizdən atıblar,
Mən baxanda qovzanıllar, baxıllar,
Bir də yatıb yandırıllar, yaxıllar (14).

Poemada Şəhriyar faktın daxili mənasını açarkən məzmunu bədii həqiqət səviyyəsinə qaldırır, oxucunu zəngin mənəvi-fikir aləminə salır. Məhz yuxarıda adları çəkilən adamların obrazlarının yaradılması Şəhriyar yaradıcılığında reallıq və müasirlik prinsipləri ilə üzvi bağlılıq təşkil edir.

Şəhriyar poemada həyat hadisələri ilə bağlı fikir və mülahizələrini qələmə alarkən səmimi və humanist insan təsiri bağışlayır. Bu mənada dünyanın dialektikasını dərk edən şair təbiət və cəmiyyətdə hər şeyin dəyişmə prosesində olduğunu qeyd edir. Təbiət və cəmiyyətin bir üzvü kimi insanın da dəyişməsini şair təbii qəbul edir:

Heydərbaba, dünya yalan dünyadı,
Süleymandan, Nuhdan qalan dünyadı.
Oğul doğan, dərdə salan dünyadı,
Hər kimsəyə hər nə verib, alıbdı,
Əflatundan bir quru ad qalıbdır (14).
Evlər qalır, ev sahibi yox özü,
Ocaqların ancaq işıldır közü.
Gedənlərin az-çox qalıbdır sözü,
Bizdən də bir söz qalacaq, ay aman!
Kimlər bizdən söz salacaq, ay aman! (14).

Şəhriyarın “Heydərbabaya salam” poeması Azərbaycan xalqının adi məişət tərzindən tutmuş ən ali fəlsəfi düşüncələri fonunda tipik Azərbaycan xarakteri, psixologiyası və milli xüsusiyyətlərinin yüksək bədii tərənnümünü nümayiş etdirən bir əsərdir.

Şəhriyar xalqımızın adət və ənənələrinə, məişətinə, milli xüsusiyyətlərinə bütün incəliklərinə qədər bələd olan sənətkardır. Yaradıcılığı ilə yaxından tanışlıq bir daha onu sübut edir ki, şairin əsərlərində milli-mənəvi ruhun hakimliyi xüsusi bir xətt təşkil edir.

***Rəyçi: prof. Himalay Qasımov***

## İstifadə edilmiş ədəbiyyat

1. Beqdeli Q. Məhəmmədhüseyn Şəhriyar. Bakı: Azərbaycan Dövlət Nəşriyyatı, 1963.
2. Billuri H. Məhəmmədhüseyn Şəhriyar. Bakı: Elm, 1984.
3. Budaqov B. Şəhriyarın “Heydərbabaya salam” poemasında təbiət. Bakı: Oğuz eli, 1998.
4. Əhməd Cəfəroğlu. Şair Şəhriyar. “Türk kültürü araşdırmaları” dərgisi. Ankara, 1964, № 1.
5. Gədikli Y. Şəhriyar və bütün türkcə şe’rləri. İstanbul: “Türkyıldızı AŞ” baskısı, 1990.
6. Həbibbəyli İ. Ustad Məhəmmədhüseyn Şəhriyar. Bakı: Elm, 1999.
7. İbrahimov M. Heydərbaba şairi. “Ədəbiyyat və incəsənət” qəzeti, 1963, 21 sentyabr.
8. İbrahimov M. Ədəbi qeydlər. Bakı: Azərnəşr, 1970.
9. Qasımov H. Şəhriyarın lirikası və etiqadı. Bakı: Elm, 1999.
10. Quliyev E. Seyid Məhəmmədhüseyn Şəhriyar. Bakı: Mütərcim, 1999.
11. Quliyev E. Şəhriyar poeziyası və milli təkamül. Bakı: Elm, 2004.
12. Quliyev E. “Heydərbabaya salam” necə varsa. Bakı: Elm, 2001.
13. Rəsulzadə M. Ədəbi bir hadisə. Ankara, “Azərbaycan” dərgisi, 1955, №4-5.
14. Şəhriyar. Yalan dünya. Bakı, 1993.

**Е.Гулиев**

**Творчество Шахрияр в контексте духовно-национальных ценностей**

**Резюме**

В статье говорится о пути творчества великого азербайджанского поэта Шахрияр, повествуется о духовно-национальных ценностях в его стихах.

**E.Guliyev**

**Shahriyar’s literary activity in the context of national values**

**Summary**

In the article it is spoken about the great Azerbaijani poet Shahriyar’s literary activity and about national-spiritual values in his poems. The importance of the poem “Haydar babaya salam” is also analysed.

# XALQIN MİLLİ VARLIĞININ AYNASI

**Aida Salahova,**
***Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin dosenti***

**Safura Gözəlova,**
***həmin universitetin baş müəllimi***

Məqalədə I Türkoloji Qurultayın işindən, xüsusən bu sahədə o dövrdə əlifba məsələsinə dair görülmüş işlərdən bəhs edilir. Məqalədə, həmçinin Azərbaycanda latın qrafikasına keçilməsi tarixinə də nəzər salınmışdır.

***Açar sözlər:*** *orfoqrafiya, orfoepiya, terminologiya, əlifba islahatı, etnoqrafiya.*
***Ключевые слова:*** *орфография, орфоэпия, терминология, реформа алфавита, этнография.*
***Key words:*** *orthography, orthoepy, terminology, alphabet reform, ethnography.*

I Türkoloji Qurultay Şərq xalqlarının, o cümlədən Azərbaycan xalqının həyatında, onun ictimai-siyasi inkişafında mühüm rol oynayan xüsusi mərhələ kimi qiymətləndirilir. Qurultay XX əsrin ən tanınmış türkoloqlarının iştirak etdiyi tarixi bir toplantı olmuşdur.

1926-cı ildə Bakı şəhərində çağırılmış I Beynəlxalq Türkoloji Qurultay bütün türk dünyasında yaddaşlara türkologiyanın intibah dövrü kimi həkk olunmuşdur. Bir əsrə yaxın vaxt keçsə də, Qurultayın müzakirə etdiyi problemlər yenə də öz aktuallığını itirməmiş, türk xalqlarının milli-mənəvi, mədəni, iqtisadi-siyasi, elmi və s. sahələrində yeni məna kəsb etmişdir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin I Türkoloji Qurultayın 90 illik yubileyi ilə əlaqədar imzaladığı sərəncamı türkdilli ölkələrdə də böyük ruh yüksəkliyi ilə qarşılanmış, keçilən yola bir daha nəzər salınmışdır. Ölkə prezidentinin imzaladığı tarixi sənəddə qurultayın əhəmiyyəti, dəyəri, tarixi rolu çox dəqiq və incəliklə öz əksini tapmışdır.

I Türkoloji Qurultay türkdilli xalqların tarix və etnoqrafiyasının, dil və ədəbiyyatının aktual problemlərinin həllində mühüm rol oynamış, bu xalqların mədəni inkişafında yeni bir mərhələnin başlanğıcı olmuşdur. Qurultayda müzakirə olunan məsələlər sırasında türk dillərinin əlifba, orfoqrafiya və terminologiyası xüsusi yer tutmuş, hər şeydən əvvəl, latın qrafikalı əlifbaya keçmək kimi bir problem öz həllini tapmışdır.

Latın qrafikalı əlifbaya keçmək məsələsi ilk dəfə M.F.Axundzadə tərəfindən qaldırılmışdır. O bu işə ərəb əlifbasını islah etmək və ya dəyişdirmək ideyası ilə başlamış, əlifba islahatına Şərq xalqlarının xilası üçün yeganə yol kimi baxmışdır.

M.F.Axundzadə əlifba məsələsini dövrün çox vacib işlərindən sayırdı. Əlifba məsələsinə o ciddi yanaşmağı tələb edir və deyirdi: "...bizə elə bir əlifba istifadə etmək lazımdır ki, onun nəticəsində üç məqsədə çatmaq mümkün olsun: yəni birinci – asan oxumaq; ikinci – asan yazmaq; üçüncü – asan çap etmək. Ancaq belə olduqda köhnə

əlifbanı dəyişdirmək vacib işlərdən sayıla bilər”. M.F.Axundzadə yeni əlifbanın tətbiqi yolunda çox böyük əmək sərf etmiş və məqsədinə nail olmaq üçün bütün imkanlara əl atmış, bu məqsədlə dəfələrlə Türkiyə və İrana səfər etmişdir.

Təsadüfi deyildir ki, görkəmli maarifçi Fərhad Ağazadə Azərbaycanda latın qrafikalı əlifbaya keçidin üç dövründən bəhs edərkən birinci dövrü M.F.Axundov mərhələsi adlandırmışdır.

Azərbaycanın qabaqcıl fikirli klassikləri bu fikirlərin davamçısı olmuşlar. Ədəbiyyatşünas F.Köçərlinin “Ərəb əlifbası və onun çatışmazlıqları” adlı məqaləsi rəğbətlə qarşılanmışdır. C.Məmmədquluzadə “Molla Nəsrəddin”də ərəb yazısı və əlifba islahatı ilə bağlı fikirlərini çox açıq bildirmişdi: “Bu heroqlifləri latın əlifbası ilə əvəzləmək vacibdir”.

Ölkədə ictimai quruluş dəyişsə də, ötən əsrin 20-ci illərində 12 may 1920-ci il tarixli qərarla Azərbaycanda təhsili ana dilində olan yeni tipli məktəblər yaradıldı. Onların şəbəkəsi ildən-ilə genişləndi.

Azərbaycanda latın əlifbasına keçmək üçün 1921-ci ildə Xalq Komissarları Soveti yanında yaradılan Əlifba Komitəsi yeni əlifbanın layihəsini hazırladı və həmin layihə 1922-ci ildə elan edildi. Maraqlıdır ki, o dövr mətbuatında bu əlifbanın əhəmiyyətindən, böyük hadisə və gözəl təşəbbüs olmasından geniş bəhs edilirdi. Əlifba Komitəsinin orqanı olan “Yeni yol” qəzeti 1922-ci il sentyabrın 23-dən etibarən latın əlifbası ilə çap olunmağa başladı. “Yeni yol” qəzetində ən qabaqcıl elm, təhsil adamları çıxış edirdi. Hələ qurultaydan xeyli əvvəl 1923-cü il oktyabrın 20-də Azərbaycan rəsmi olaraq latın qrafikalı əlifbaya keçdi. İlk illərdə hər iki əlifbadan istifadə olunmağı məqsədəuyğun sayırdı. Lakin hər yerdə üstünlük latın qrafikalı əlifbaya verilirdi.

Ona görə də 20-ci illərdə yeni əlifbaya keçid, ərəb əlifbasının Azərbaycan dilinə uyğunlaşdırılması məsələləri daha da aktuallaşdı. Görkəmli türkoloq-alim Bəkir Çobanzadə “Yeni yol” qəzetinə müsahibəsində məsələyə münasibətini belə ifadə edirdi: “...bütün mahiyyəti ilə dilimizə uymayan ərəb əlifbasını islah etmək çətindir. Ərəb əlifbasını islah etmək, yalnız yeni hərflər icad etmək deyil, bəlkə bütün sistemi dəyişmək məsələsidir ki, bu təqdirdə də yeni bir əlifba meydana gətirmiş oluruq. Latın əlifbası xaricdən əvvəl Azərbaycanda tam müvəffəqiyyət qazanmalıdır”.

1922-ci ildə əlifba məsələsi ilə əlaqədar N.Nərimanovun tövsiyəsi ilə yaradılan əlifba komissiyası geniş müzakirələrdən sonra latın qrafikalı yeni Azərbaycan əlifbasına keçmək işini sürətləndirdi. 1924-cü ildən başlayaraq, ayrıca dekretlə ərəb əlifbası tamamilə sıradan çıxarılmadan yeni əlifba rəsmi olaraq dövlət əlifbası kimi qəbul edildi.

Şərq və Qərbin qarşısında mədəniyyət bayrağı qaldıran bir məmləkət kimi Azərbaycana strateji mövqeyinə və tarixi ənənələrinə sadiq qalaraq mütərəqqi fikirləri ilə türk, eləcə də digər xalqlar arasında qabaqcıl mövqeyi olan dövlət kimi baxılırdı. Bunun ən bariz inikası qurultayın Azərbaycanda çağırılması idi. O dövrdə Azərbaycan xalqı mütərəqqi fikirlərə can atan ümumitürk və beynəlmiləl ideyaları özündə yaşadan bir xalq kimi çıxış edirdi. Qurultaya qədər Azərbaycanda savadsızlığı ləğv etmək üçün 1925-ci il mayın 25-də Bakıda keçirilən Azərbaycan Müəllimlərinin I Qurultayında (indiki anlamda V qurultayda) məktəblərdə yeni əlifbaya keçmək haqqında məsələ müzakirə olunmuş, 1925-1926-cı tədris ilində ibtidai siniflərdə dərslərin yeni əlifba əsasında keçilməsi məqsədəuyğun sayılmışdı. Deməli, ölkəmizdə bu möhtəşəm tədbirin Bakı

şəhərində keçirilməsi tarixi bir zərurət kimi meydana çıxmışdı.

Türkologiyanın intibah dövrü kimi tarixə daxil olan bu qurultay türk xalqlarının bugünkü dirçəlişinin təməl daşını qoymuşdur. Şərqdə ilk respublikanın vətəni kimi tanınan Azərbaycan hələ o illərdən inkişaf səviyyəsinə görə türk respublikaları içərisində öndə gedən respublika idi. Qurultayda və qurultaydan sonra Özbəkistan, Qazaxıstan, Türkmənistan nümayəndələri özləri də bunu etiraf edirdilər. Qurultayda SSRİ-dən və xarici ölkələrdən 131 nəfər nümayəndə iştirak edirdi. İlk iclasda 20 nəfər rəyasət heyətinə, 6 nəfər isə fəxri Rəyasət Heyətinə seçilmişdir. Qurultayda türkologiyanın gələcək inkişaf yolları, türk dilləri əlifbası, orfoqrafiya və texnologiyası, tədrisi, metodikası və s. kimi mühüm məsələlər müzakirə olunmuşdu.

Latın qrafikalı əlifbanın tətbiq olunması ilə bağlı görülmüş işlərin zirvəsi I Türkoloji Qurultayla bağlıdır. Bu qurultayın onuncu, on birinci, on ikinci və on üçüncü iclasları əlifba məsələsinə həsr olunmuşdur.

Latın əlifbası əsasında yaranmış əlifbanın qəti olaraq vilayətlərdə və respublikalarda: Azərbaycanda, Qırğızıstanda, Özbəkistanda, Türkmənistanda, Qazaxıstanda, Yakutiyada, İnquşetiyada, Qaraçay-Çərkəzdə, Kabardində, Balkarda, Osetiyada, Çeçenistanda, Başqırdıstanda, Tatarıstanda, Adıgey-Çərkəzdə həyata keçirilməsi geniş bir hərəkat kimi vüsət aldı.

Qurultay yuxarıda adları göstərilən respublikalarda və vilayətlərdə yeni latın əlifbasının həyata keçirilməsi ilə bağlı görülmüş müsbət işləri ürəkdən alqışlayır və maraqlı tərəflərə məsləhət görür ki, bütün türk-tatar və başqa xalqlar yeni reformalar aparmaq üçün Azərbaycanın, eləcə də digər respublikaların təcrübəsindən, metodundan (üsulundan) istifadə etsinlər.

Qeyd etmək lazımdır ki, qurultay qədim tarixə malik olan türk xalqlarının qurultaya qədər elmi-nəzəri məsələlərə olan marağını da artırdı, ikincisi, qurultayda keçmiş Sovetlər Birliyində, Kiçik və Orta Asiyada bütövlükdə dünyanın müxtəlif yerlərində yaşayan türk xalqlarını tanıtdı, onların qayğı və problemlərini, ehtiyac və tələblərini üzə çıxardı, üçüncüsü, bu qurultay Avropa və digər ölkələrin alimləri ilə yanaşı türk xalqlarının içərisindən çıxan şərqşünasların da məşğul olması üçün şərait yaratdı. B.Çobanzadə bu məsələyə dair belə bir fikir irəli sürmüşdü: "İlk dəfə türk alim, müəllim və maarifçisi Avropa və rus alimləri ilə əməli, nəzəri məsələlərin müzakirə və münaqişəsində iştirak edəcəkdir. Bu da onu göstərir ki, türkoloqların məhz türk xalqlarından olması məsələsi də müsbət addım kimi qiymətləndirilməlidir".

Qurultayda Azərbaycan bir daha latın qrafikalı əlifbanın qəbul olunmasının təşəbbüskarı və tədqiqatçısı kimi tanındı. Azərbaycanlı alimlər keçmiş Sovetlər Birliyini gəzərək türk xalqlarını maarif və mədəni inqilaba çağırırdı. Bu çıxışlarda deyilirdi ki, Azərbaycanda mədəni inqilaba keçməyə ərəb əlifbası mane olur. O yeni əlifba bu işdə güclü bir silahdır, bu əlifbanın gücü ilə savadsızlar elm dünyasının işığına çıxarılmalıdır.

Müzakirəsi üç gün davam edən yeni əlifbanın qəbul edilməsi zamanı iki fikir irəli sürülmüşdü. Birinci fikir tərəfdarları olan ziyalılar ərəb əlifbasında islahat aparıb onun saxlanılması fikrini irəli sürürdülər. Digər qrup ziyalılar isə Avropa sistemli yeni əlifba yaratmaq fikrini müdafiə edirdilər. Birinci fikrin tərəfdarları belə güman edirdilər ki, guya ərəb əlifbasından imtina edilərsə, türkdilli ölkələr, o cümlədən Azərbaycan on illərlə geri düşər, klassik ədəbiyyatın nümunələri unudular. Eyni zamanda onlar qeyd edirdilər ki, guya əlifbanı başqası ilə

əvəz etmək üçün respublikalarda kifayət qədər mütəxəssis və elmi ocaqlar yoxdur. İslahat tərəfdarları eyni zamanda islam birliyinin dağılması ehtimalını da dilə gətirirdilər.

İkinci fikrin tərəfdarları olan həm ziyalılar, həm də bütün ictimaiyyət yeni əlifbaya keçmək fikrini axıradək müdafiə etdilər. Geniş müzakirədən sonra bununla əlaqədar aşağıdakı qətnamə qəbul olundu:

“Yeni (latın) əlifbanın, ərəb əlifbası və islah edilmiş ərəb əlifbası üzərindəki üstünlüyü, texniki asanlığın və habelə ərəb əlifbasına nisbətən yeni əlifbanın mədəni-tarixi cəhətdən və tərəqqi etibarı ilə son dərəcə böyük əhəmiyyətini nəzərə alaraq qurultay bütün türk, tatar xalqlarına, habelə başqa xalqlara, bu islahatı öz aralarında aparmaq üçün Azərbaycanın və digər ölkələrin təcrübə və metodunu öyrənməyi tövsiyə edir”.

Qurultayda, həmçinin qərara alındı ki, türk xalqları savadsızlığı aradan qaldırmaq üçün latın əlifbasından istifadə etsin. Qurultayda o da tövsiyə olundu ki, növbəti Türkoloji Qurultay iki il sonra Səmərqənd şəhərində çağırılsın. Lakin sonrakı illərdə vəziyyət kökündən dəyişdi, o dövrün siyasi rejimi ikinci qurultayın çağırılmasına imkan vermədi. Açıq deyilsə, qurultaydan sonra türk xalqlarının yazılı abidələrinə qarşı qısqanclıq hissi getdikcə güclənirdi. Türk xalqlarının tarixi-mədəni səviyyəsinə xor baxanlar da meydana çıxdı.

Lakin heç də onlar deyən olmadı. Əksinə, yeni əlifbanın Azərbaycanda qəbul edilməsi başqa xalqlara gözəl nümunə oldu. SSRİ-də yaşayıb ərəb əlifbasından istifadə edən xalqlar, o cümlədən tatarlar, qazaxlar, başqırdlar, türkmənlər, özbəklər və başqaları da öz yeni əlifbalarını yaratdılar. Bu böyük hadisə öz əks-sədasını Türkiyədə də tapdı. Bu əlifbanın ən böyük əhəmiyyəti ondan ibarət oldu ki, yazımızdan çətin ərəb əlifbası tamamilə çıxarıldı, respublikamızda savadlanma işi xeyli sürətləndirildi.

Türkiyə latın qrafikalı əlifbaya Azərbaycandan sonra keçdi. O da həqiqətdir ki, Stalin rejimi yenə öz sərt qanunlarını işə saldı. Cəmi 10 il sonra Sovet İttifaqının bütün müsəlman ölkələrində kiril əlifbasına keçildi. Bununla da əlifba fəaliyyətinin yeni dövrünə qədəm qoyuldu.

Lakin totalitar rejim buna çox dözə bilmədi və 1939-cu ildə kiril əlifbasına keçidlə bağlı qərar verildi. Ruslaşdırmanın bariz ifadəsi olan yeni tədbir həyata keçirildi: 1940-cı il yanvarın 1-dən kiril əlifbası tətbiq olundu. Həmin il sentyabrın 1-dən məktəblər kirilə keçmiş oldu.

Ümumiyyətlə, əlifbanın tez-tez dəyişdirilməsi hər hansı bir mədəni xalq üçün ağır nəticələr verir. Yenidən latından kirilə keçidlə 15 illik tariximizdən, yazı vərdişimizdən aralanmalı olduq.

Kiril əlifbası Azərbaycan dili ilə uyuşa bilmədi. 1991-ci il dekabrın 25-də Azərbaycan Respublikasının Ali Soveti “Latın qrafikalı Azərbaycan əlifbasının bərpası haqqında” Azərbaycan Respublikası qanununun qüvvəyə minməsi barədə qərar verdi. Bu əlifba kiçik fərqlər nəzərə alınmazsa, demək olar ki, türk əlifbası əsasında yaradılmışdır. Bu, türk xalqlarının yaxınlaşması, ortaq türk ədəbi dili, ortaq türk terminologiyası yaradılması sahəsində olduqca mühüm addım idi. Ona görə də, vahid əlifbanın mövcudluğu zəruri şərtə çevrildi.

Kiril əlifbası tam yarım əsr: 1940-1991-ci illərdə istifadədə qaldı. Keçid dövründə həm kiril, həm də latın əlifbası işlənirdi. 2001-ci il 18 iyul tarixli fərmana əsasən, 1 avqust 2001-ci ildən tam şəkildə latın qrafikalı əlifbaya keçildi. Həmin tarixdən Azərbaycanda latın qrafikalı əlifba öz yerini tutdu. Artıq bütün əlifba problemləri arxada qalmışdı.

Minnətdarlıqla qeyd etmək lazımdır

ki, bugünkü nailiyyətlərimizin istiqamətvericisi I Türkoloji Qurultay olmuşdur.

Yeni əlifbaya keçidin səmərəli olmasına təbii hal kimi yanaşıldı. İlk əvvəl olaraq orta məktəblərin birinci sinifləri latın qrafikalı əlifbaya keçmiş, 10-cu sinifdə artıq bu əlifbanı mənimsəmiş yeni nəsil yetişmişdi. Həmin ildən ali məktəblərdə yeni qrafikalı dərsliklərdən istifadə etməyə başlamışlar. Keçid dövründə həm də zəruri ədəbiyyatın, dərsliklərin, lüğətlərin çapı baxımına da laqeyd yanaşılmadı.

Azərbaycan Respublikasında Azərbaycan dilinə qayğı dövlət səviyyəsində həll olundu və bütün hüquqi sənədlər Prezident sərəncamları ilə tənzimləndi.

Türkoloji Qurultayın yenidən gündəmə gətirilməsi dünya şöhrətli siyasətçi Heydər Əliyev kursunun layiqli davamçısı olan Azərbaycan Prezidenti İlham Əliyevin ana dilimizin inkişaf etdirilməsinə sonsuz məhəbbətinin, müntəzəm qayğısının yeni təzahürü oldu.

I Türkoloji Qurultayın izləri isə unudulmadı. Bu tarixi toplumda türk xalqlarının milli-mənəvi dəyərləri qlobal şəkildə türk dünyasının malı edildi. Tarixi kökləri bəşər cəmiyyətinin yarandığı dövrə təsadüf edən babalarımız özlərinin tarixini, maddi mədəniyyətini ictimaiyyətə tanıtdılar. Ulu öndərimiz Heydər Əliyevin bu barədə söylədiyi fikirləri xatırlamaq yerinə düşür: “Türkdilli xalqlar qədim, çoxəsrlik tarix boyu Avrasiya qitəsinin böyük hissəsində yaşayaraq dünya və bəşər mədəniyyətinə böyük töhfələr vermiş, onu zənginləşdirmişlər. Tarix boyu türkdilli xalqların həyatı cürbəcür müharibələrlə, döyüşlərlə, təcavüzlərlə rastlaşmışdır. Ancaq xalqların dərin kökləri, bir-birinə mənəvi bağlılığı onları bütün bu mərhələlərdən, imtahanlardan, sınaqlardan çıxarmışdır. Biz öz tarixi köklərimizlə, dəyərlərimizlə fəxr edə bilərik”.

I Türkoloji Qurultayın 90 illiyinin qeyd edilməsi türk xalqlarının əlifba probleminə, orfoqrafiya və orfoepiya, türk dilləri arasındakı yaxınlığa və türk dillərinin təsnifinə, ümumetnoqrafiya və s. türk xalqlarının problemlərinə bir daha diqqəti cəlb etdi və bu problemlərin həlli üçün daha geniş perspektivlər açdı.

***Rəyçi: prof. A.Babayev***

## İstifadə edilmiş ədəbiyyat

1. M.F.Axundov. Əsərləri. 3-cü cild. Bakı, 1962.
2. Xəlilov B. Birinci Beynəlxalq Türkoloji Qurultay. Bakı: Elm, 1999.
3. Babayev A. Türk xalqları tarixində ən parlaq hadisə. //Azərbaycan məktəbi, 2016, №2.
4. Ociyev S. Türkoloji qurultay: Özbəkistanda yeni əlifba məsələsi. //Azərbaycan məktəbi, 2016, №4.

**А.Салахова,**
**С.Гезалова**

**Отражение национального существования**

**Резюме**

В статье говорится о проделанной работе I тюркологического съезда, в том числе об изменениях алфавита в тюркоязычных республиках. А так же рассматривалась история путей применения латинского алфавита в Азербайджане.

**A.Salahova,**
**S.Gozalova**

**The mirror of the national existence**

**Summary**

The article is dedicated to the issues of the First Turkish Congress, particularly the alphabetical issues. The author also looks through the history of transition to Latin graphics.



# KOMPÜTER TEXNOLOGİYASINA QOYULAN TƏLƏBLƏR

**Samir Həsənov,**
***5 nömrəli Bakı Peşə Liseyinin istehsalat təlimi ustası***

***Açar sözlər:*** *kompüter texnikası, proqram təminatı, alqoritm, informasiya texnologiyaları.*

***Ключевые слова:*** *компьютерная техника, программное обеспечение, алгоритм, информационные технологии.*

***Key words:*** *computer hardware, software, algorithms, information technology.*

Kompüter texnikası yaranana qədər informasiyanın istifadə olunması, yadda saxlanılması və mübadilə edilməsi yalnız insan tərəfindən yerinə yetirilirdi. Təxminən son 50 ildə kompüter texnologiyası böyük sürətlə inkişaf edərək, elmi-texniki və iqtisadi tərəqqinin aparıcı və əsaslı qüvvəsinə çevrilmişdir. Kompüter texnikasının tətbiqinin bir çox sahələrdə (iqtisadiyyatda, sənayedə, istehsal və istehlak sahələrində), həm də insanların əmək şəraitinin yaxşılaşdırılmasında əhəmiyyətli rolu vardır. Kompüter texnologiyasının tətbiqi, həmçinin verilənlər və biliklər bazasının qurulmasında, yaradılmasında, qlobal informasiya mühitinin, təhsil sisteminin təkmilləşməsində, beynəlxalq, regional və milli səviyyədə informasiya mübadiləsinin genişlənməsində mühüm əhəmiyyət kəsb edir.

İstifadəçilər, müasir kompüterlərdə, çox səmərəli alqoritm ( hər hansı bir məsələnin həlli üsulu) və proqram təminatına malik olmalıdır. Belə alqoritmlərin və proqramların yaradılması isə bütövlükdə kompüteri, onun funksional imkanlarını, alqoritm nəzəriyyəsini və dillərini, həm də proqramlar yazmaq vərdişinə malik olmağı tələb edir. Buna görə də, elmi-texniki və informasiya profilli (istiqamətli) kolleclərdə və ali məktəblərin uyğun fakültələrində Kompüter texnikası və Proqramlaşdırma fənninin tədrisinin key-fiy-yət və kəmiyyət kriteriyalarına görə yüksəldilməsi müasir dövrün tələbidir.

Bildiyimiz kimi, informasiya obyektlər (geniş mövhumdur) haqqında əldə edilən bilikləri göstərir. Həmin biliklər müəyyən faktlar və onlar arasındakı asılılıqlar şəklində ifadə olunur. Fakt sözü isə "məlumat" sözü ilə eyni mənalıdır. İnformatikada fakt, məlumat, xəbər terminləri çox vaxt "verilənlər" sözü ilə ifadə olunur. Verilənlər (data) texniki vasitələrlə yadda saxlanılan, emal edilən və ötürülən kodlaşdırılmış məlumatdır. Verilənlər ümumi halda ad, qiymət, tip və struktur xarakteristikaları ilə təyin olunurlar. Beləliklə, İnformatikada ən çox işlədilən "İnformasiya" və "Verilənlər" sözləri qarşılıqlı əvəz olunan anlayışlardır. İnformatikada "İnformasiya prosesləri" adlı əsas bir bölmə var ki, bu da informasiyanın toplanması, ötürülməsi, saxlanması, emalı, qorunması və istifadəçiyə çatdırılmasıdır. Kompüter texnikasının yaranması və inkişafı nəticəsində bu proseslərin avtomatlaşdırılması daha da sürətlənmiş və hazırda informatikanın əsas probleminə çevrilmişdir. İnformasiya texnologiyası –

informasiya ehtiyatlarından istifadə olunması proseslərinin çətinliyini (mürəkkəbliyini, ağırlığını) azaltmaq, onların etibarlılığını və operativliyini çoxaltmaq məqsədilə texnoloji sırada (zəncirdə) birləşdirilən metodlar (üsullar) və texniki proqram vasitələri toplusudur. Həmçinin informasiya texnologiyası (İT) aşağıdakı xüsusiyyətlərlə təyin olunur :

- Emal obyekti – verilənlərdir;
- Məqsəd – informasiyanın alınmasıdır;
- Emal prosesinin vasitələri – aparat, proqram.

İT bütün texnologiya növləri içərisində insan amilinə çox yüksək tələb qoyan bir vasitədir. Burada peşəkarlıq səviyyəsi, zehni və fiziki iş qabiliyyəti mühüm əhəmiyyət kəsb edir.

Fərdi kompüterlərdə informasiya emalının təşkili məsələlərində verilənlərin təsvir formaları, say sistemləri və simvolların kodlaşdırılması vacib bir yer tutur. Burada say sistemi (hesablama) kodlaşdırmanın bir formasıdır.

Məlumdur ki, kompüter ikilik (0 və 1) say sistemində işləyir. İstifadəçilər isə onlar üçün əlverişli və asan olan onluq say sistemindən istifadə edirlər. Odur ki, kompüter qəbul etdiyi informasiyanı bir sistemdən digərinə (ikilik say sisteminə) çevirir və əksinə. Bu və digər (məsələn, hesablama) proseslər kompüterin sistem bloku adlanan hissəsinin köməyi ilə başa gəlir. Ümumiyyətlə, fərdi kompüterlərin əsas hissələrinə aşağıdakılar daxildir :

- Sistem bloku
- Monitor
- Klaviatura

Verilənləri və proqramları yadda saxlamaq, həmçinin informasiyanı bir kompüterdən digərinə köçürmək üçün müxtəlif maqnit disk yaddaşlarından istifadə olunur. Disk yaddaşlarını şərti olaraq əsasən aşağıdakı qruplara bölürlər:

- Çevik disklərdə yaddaş;
- Sərt disklərdə yaddaş.

Yeni informasiya texnologiyasının sürətli inkişafı kompüterin proqram təminatının intensiv inkişafı nəticəsində baş verir. Kompüterin proqram təminatı dedikdə informasiya emalının təşkili və idarə edilməsi üçün istifadə olunan proqramlar kompleksi başa düşülür. Bu proqramlar kompleksinə əməliyyat sistemi (ƏS) də deyilir. ƏS kompüter resurslarını idarə edən, tətbiqi proqramların işə salınmasını, onların xarici qurğular və digər proqramlarla qarşılıqlı əlaqəsini, həmçinin istifadəçi ilə kompüter arasındakı dialoqu təmin edən proqramlar məcmusudur. Son illərdə ən çox istifadə olunan əməliyyat sistemləri Windows ailəsinin ƏS-ləridir. Bunlardan Windows 1998, 2000, 2007, 2010 və s. göstərmək olar. Bu ƏS-i istifadəçilər üçün rahat işləmə mühiti yaratmaq məqsədilə meydana gəlmişdir.

Kompüter və kompüter texnologiyasının tətbiqi istənilən müəssisənin və təşkilatın səmərəli, həm də rahat fəaliyyətini təmin edən mühüm vasitələrdən biridir. Bu da özünü müasir kompüterlərdə və onları idarə edən əməliyyat sistemlərinin işində göstərir. Məsələn, Windows ƏS-nin aşağıdakı üstün cəhətləri var:

- Yüksək etibarlılığı və asan idarə olunması
- İnternetə daxili inteqrasiya
- Aparat vasitələrinin yoxlanması
- İstifadənin yüngüllüyü və rahatlığı
- Multimedia prinsiplərinin saxlanılması.

Yəni Windows vasitəsilə musiqi səsləndirmək, videokameraya baxmaq olar.

Bütün bu deyilənlərlə bərabər, həmçinin informasiyanın əldə olunması, ötürülməsi və istifadəçilərin mövcud informasiyadan birgə istifadəsini təmin etmək üçün kompüter şəbəkələrinin olması vacib şərtdir. Kompüter şəbəkələri-rabitə xətləri və xüsusi proqram təminatı ilə bir-biri ilə əlaqəli kompüterlər və peri-

feriya avadanlıqları sistemindən ibarətdir. Məsafədən asılı olaraq, rabitə xətləri olaraq kabeldən, telefon xətlərindən, radio rabitədən, peyk rabitəsindən və optik lifli xətlərdən istifadə olunur. Kompüter şəbəkələrinin iki tipi mövcuddur: lokal və qlobal. Şəbəkələrin proqram təminatı əsasən iki hissədən ibarət olur: müştəri və server. Ən böyük qlobal kompüter şəbəkəsi İnternet kompüter informasiya şəbəkəsidir. İnternet özündə milyonlarla kompüteri birləşdirən şəbəkələrin toplusudur. Lokal şəbəkələrdə isə əsasən əlaqə kabel və qismən lazer vasitəsi ilə həyata keçirilir.

Müasir dövrün kompüter və kompüter texnologiyasına qoyduğu tələb və məqsəd yeni və ən yeni elektron texnologiyalara əsaslanan kompüter sistemləri yaratmaqdır.

*Rəyçi: dos.İ.İsmayılov*

## İstifadə edilmiş ədəbiyyat


1. Əliyev A. İnformatika və proqramlaşdırma. Ali məktəblər üçün dərs vəsaiti. Bakı: Mütərcim, 2010.
2. Əliyev Ə., Əliyev A., Kazımov K. İnformatikanın əsasları. Bakı, 2008.
3. Əliyev Ə., Kazımov C. Kompüterin arxitekturası və əməliyyat sistemləri. Bakı, BDU. 2007.
4. Mənsimov K., Feyziyev F., Aslanova N. Kodlaşdırma nəzəriyyəsi. Bakı Dövlət Universiteti nəşriyyatı, 2009.


**С. Гасанов**

**Требования к компьютерной технике**

**Резюме**


В статье показано, что компьютерные технологии являются ведущей силой научно-технического прогресса. Не отрицается тот факт, что компьютеризация стала неотъемлемым требованием современной жизни во всех ее областях. В статье говорится о взаимосвязи понятий «информация» и «данные» и их взаимозаменяемости. Объясняются понятия «информационных технологий» и особенности их использования.

В работе описаны основные части персонального компьютера, организация информационной обработки и ее использование в памяти магнитного диска. Дана информация о программном обеспечении компьютера, и показаны преимущественные стороны организационной системы Windows. Подробно описана компьютерная сеть и ее основные типы.


**S.Hasanov**

**Requirements for computer technology**

**Summary**


This article shows that computer technology is the driving force of scientific and technological progress. It does not deny the fact computerization has become an essential requirement in all areas of modern life. The article refers to interrelationship of concepts of "information" and "data" and their interchangeability ; explains the concept of "information technologies" and peculiarities of their use.

The paper describes the main parts of a personal computer, organization of information processing and its use in a magnetic disk memory. It is represented the information about the software and are shown the advantageous sides of window organization system. Described in the computer network and its basic types detail.



# ŞAGİRDLƏRİN İNFORMASİYA MƏDƏNİYYƏTİNİN FORMALAŞDIRILMASINA DAİR

**Almaz Həsrət,**
***Təhsil Problemləri İnstitutunun şöbə müdiri,***
***əməkdar müəllim***

***Açar sözlər:*** *İKT, informasiya mədəniyyəti, sorğu, müəllim, şagird, psixoloq.*
***Ключевые слова:*** *ИКТ, информационная культура, опрос, учитель, ученик, психолог.*
***Key words:*** *ICT, information culture, interview, teacher, student, psychologist.*

Müşahidə və faktlar göstərir ki, müasir dövrün şagirdləri həyati hadisələrə obyektiv münasibət göstərmək, məlumatlılıq, faktik vəziyyətə çevik uyğunlaşmaq, müstəqilliyə meyil etmək baxımından əvvəlki vaxtların uşaqlarından müsbət mənada xeyli fərqlənirlər. Onların əksəriyyəti İKT vasitələrindən bacarıqla istifadə edirlər ki, bu faktı təfəkkürün normal inkişafının göstəricisi kimi qəbul etmək olar.

Araşdırmamızın tədqiqat planına uyğun olaraq müasir dövrdə təlim prosesində İKT-dən istifadə zamanı şagirdlərin informasiya mədəniyyətinin formalaşdırılması probleminin ümumtəhsil məktəblərində qoyuluşunun vəziyyəti öyrənilmişdir.

Bu məqsədlə 2013-cü ildən başlayaraq 2 əsas mərhələdə (2013-2014-cü illər; 2014-2016-cı illər) müntəzəm olaraq ümumi orta təhsil məktəblərində (Bakı şəhərinin 114, 193, 217, 204, 245 nömrəli tam orta məktəbləri, Sumqayıt şəhərinin Təbiət elmləri təmayüllü gimnaziyası, 1, 11 nömrəli tam orta məktəblərinin, Şəmkir rayonu Zəyəm qəsəbə, Qazax rayonu 3 nömrəli, Sabirabad rayonu Qəzli kənd, Kürdəmir şəhər 3 nömrəli, Qusar rayonu Balaqusar kənd tam orta məktəblərinin VI, VII, VIII, IX, X, XI siniflərində müşahidələr aparılmış, müsahibələr təşkil edilmiş, anket sorğuları keçirilmişdir.

Məktəbdəki vəziyyətin öyrənilməsi üçün ilk növbədə, məqsədyönlü şəkildə mərhələli olaraq həyata keçiriləcək işlər aşağıdakı kimi planlaşdırılmışdır:

- məktəblərin İKT ilə təminatının hansı səviyyədə olmasının təhlil edilməsi;
- şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılması ilə bağlı görülmüş tədbirlərin müəyyənləşdirilməsi;
- məktəb rəhbərliyinin probleme münasibətinin öyrənilməsi;
- fənn müəllimlərinin İKT-dən istifadə səviyyəsinin aşkar edilməsi;
- təlim prosesində informasiya mədəniyyətinin formalaşdırılması vəziyyətinin öyrənilməsi ;

Bütün bu məsələlərlə bağlı nəzərdə tutulduğu kimi, ilk növbədə, məktəb rəhbərliyi ilə sorğular keçirilmiş, həmçinin burada fərqli bir yanaşma tətbiq edilmişdir. Tədqiqata cəlb olunmuş fənn müəllimlərinin, məktəb rəhbərliyinin fikirlərini öyrənilmişdir. Bundan sonra Google.doc sənəd servisində onlayn anket sorğu tərtib olunmuş və İnternetdə, Facebookda yayımlanmışdır. Bu tədbirlərdən sonra cəmi 1 saat ərzində onlayn sorğuya 100-dən çox təhsil işçisi qatıldı. 1 saat ərzində Facebookda paylaşılan sorğudan alınan cavablar təhlil olundu. Sorğuya Bakı, Sumqayıt, Abşeron, Qaradağ, Qobustan, İsmayıllı, Şəmkir, Qazax, Zərdab, Ağdaş, Salyan, Samux, Biləsuvar, Quba, Qusar, Lerik, Gəncə, Şabran, Yevlax, Tovuz, Ağcəbədi, Göyçay,

Füzuli, Neftçala, Balakən, Gədəbəy, Lənkəran, Zəngilan, Qax, Masallı, Şirvan, Tərtər, Saatlı şəhər və rayon məktəb direktorları, direktor müavinləri, psixoloq və fənn müəllimləri qatıldılar. Məlum olmuşdur ki, onlar şagirdlərdə İKT-dən istifadə etməklə informasiya mədəniyyətinin formalaşdırılmasının təşkili məsələlərinə lazımi diqqət ayırmamışlar.

Bu problemə məktəbdaxilində ayrıca nəzarət də olmamışdır. Bu fikridaha da dəqiqləşdirmək üçün məktəb rəhbərləri ilə aşağıdakı məzmunda anket sorğusu keçirilmişdir:

- təlim prosesində İKT-dən istifadəyə münasibətiniz necədir?
- çalışdığınız məktəbdə İKT ilə təminat hansı səviyyədədir?
- təlim prosesində İKT-nin tətbiqinin məqsədi nədir?
- təlim prosesində İKT-dən istifadə zamanı şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılmasına nail olmaq olarmı?
- şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılması ilə bağlı hansı tədbirləri həyata keçirirsiniz?
- İKT-dən istifadə etməklə şagirdlərin informasiya mədəniyyətinin formalaşdırılmasına dair hər hansı bir vəsaitlə tanışsınızmı?
- tədris prosesində ən çox hansı elektron resurslardan istifadə edirsiniz?
- şəxsi elektron resurs hazırlayarkən ən çox hansı elektron alətlərdən istifadə edirsiniz?
- tədris zamanı lazım olan resursları daha çox haradan alırsınız?
- şagirdlərin informasiya mədəniyyətinin formalaşdırılmasında hansı fənlərə daha çox üstünlük verərdiniz?

Eyni anket sorğusu ilə fənn müəllimlərinə də müraciət olunmuşdur. Sorğunun nəticələri təhlil edilərkən məlum olmuşdur ki, məktəb rəhbərlərinin bir qismi sualları formal qaydada cavablandırmış, digər qismi isə məktəbdə təlim zamanı İKT-nin tətbiqi ilə şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılması məsələsinə öz münasibətini bildirmişlər. Məktəb direktoru, müavinləri, psixoloq və fənn müəllimləri eyni suallara müxtəlif məzmunda cavablar vermişlər. Məktəb rəhbərliyi və fənn müəllimlərindən aldığımız cavabları təhlil edərkən belə nəticəyə gəlinmişdir ki, onların yanaşmalarında ümumi cəhətlər vardır. Ona görə də həmin cavablar bir müstəvidə ümumiləşdirilərək aşağıdakıkimi qruplaşdırılmışdır:

- təlim prosesində İKT-nin tətbiqinə münasibətim yaxşıdır, ancaq həmişə yox, zəruriolduqda ondan istifadə etmək lazımdır;
- İKT təminatının orta səviyyədən bir az yüksək olmasını və dərslərdə ondan istifadə edilməsi lazımdır;
- İKT-nin tətbiqinin məqsədi rəngarəng dərslər qurmaq, şagirdlərin təhsilə marağını artırmaq, müasir, hərtərəfli inkişaf etmiş gənclər yetişdirməkdən ibarətdir;
- təlim prosesində İKT-dən istifadə zamanı şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılmasına qismən nail ola bilərik;
- şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılması üçün açıq dərslər, qarşılıqlı dərs dinləmələr, məktəb tədbirləri və fərdi söhbətlərin keçirilməsi yolu ilə formalaşdırılmasını mümkün hesab edirəm;
- İKT-dən istifadə etməklə informasiya mədəniyyətinin formalaşdırılmasına dair hər hansı bir vəsaitlə maraqlanmamışıq;
- məktəbimizdə olan bütün elektron resurslardan, həmkarlarımın dərslərindən, onların hazırladıqları slaydlardan istifadə edirəm;
- şəxsi elektron resurs hazırlayarkən ən çox Microsoft Office proqramlarından, məktəbin resurs imkanları nəyə qadirsə ona uyğun alətlərdən istifadə edirəm;
- tədris zamanı lazım olan resursları ən çox dərsliklərdən, məktəb kitabxanasından, internetdən toplayıram;

- Şagirdlərin informasiya mədəniyyətinin formalaşdırılmasına daha çox təsir edə biləcək fənn informatika olar.

Sonda alınan cavablardan məlum oldu ki, sorğuda iştirak edən 12 məktəb direktorundan hamısı sualları cavablandırıb. Onlardan 3 nəfəri suallara elmi-pedaqoji məzmun kəsb edən cavablar vermiş, 8 nəfəri isə qismən cavab vermişdir.

Direktor müavinlərinin cavablarını təhlil edərkən məlum olmuşdur ki, onlar direktorlardan fərqli olaraq suallara bir qədər ətraflı cavab vermişlər. Şagirdlərdə İKT-dən istifadə və onlarda informasiya mədəniyyətinin formalaşdırılmasını məktəbdə açıq dərslərin təşkili və keçirdikləri tədbirlərlə məhdudlaşdırmışlar.

Direktor müavinləri və məktəb psixoloqları şagirdlərin İKT-dən istifadə etməklə informasiya mədəniyyətinin formalaşdırılmasını fərdi söhbətlərlə, məktəb tədbirləri vasitəsilə həyata keçirilməsini mümkün saymışlar.

Fənn müəllimlərinin problemlə bağlı fikirlərinin təhlilini apardıq. VI-XI siniflərdə dərs deyən müxtəlif fənn müəllimləri ilə problemlə bağlı söhbətlər, müsahibələr aparmaqla yanaşı, onları onlayn sorğuya da cəlb etdik. Şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılması prosesində tədris etdikləri fənlərin hansının imkanlarının daha geniş olmasını öyrənməyə çalışdıq. Aldığımız cavabları araşdırıb təhlil edərkən məlum oldu ki, onlar İKT-dən istifadə və şagirdlərdə ayrıca informasiya mədəniyyətinin formalaşdırılması ilə bağlı heç bir əlavə mənbəyə rast gəlmədiklərini qeyd etmişlər. Yalnız informatika fənni üzrə dərslik və dərs vəsaitində problemlə bağlı mövzuya rast gəldiklərini, həmin mövzuya adi dərs kimi baxıldığını və nəinki informatika dərslərində, hətta digər fənlərdə də bu problemə diqqət yetirilmədiyini bildirmişlər.

Direktor müavinlərindən 6 nəfəri suallarımıza qaneedici cavab versə də, onlar şagirdlərin İKT-nin tətbiqi ilə informasiya mədəniyyətinin formalaşdırılmasını məktəbdəki fəaliyyət planlarındakı işləri ilə məhdudlaşdırmış, qalanlarının cavabları natamam olmuşdur.

Daha fərqli və bir qədər gözlənilməz cavab verən psixoloqlar şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılmasında İKT ilə yanaşı, məhz fərdi söhbətlərin də rolu olduğunu qeyd etmişlər.

Fənn müəllimləri məktəb rəhbərliyindən fərqli olaraq daha ətraflı cavab vermiş, onlardan 14 nəfəri qaneedici, 64 nəfəri şablon cavablarla fikir bildirmiş, 7 nəfərin cavabları isə qənaətləndirici olmamışdır.

İş prosesində daha çox orta səviyyədə İKT ilə təmin olunmuş məktəbdə tədqiqat aparmağı qərara aldıq.

Təlim zamanı məktəb rəhbərliyi, psixoloq və fənn müəllimlərinin "Tədris zamanı lazım olan resursları ən çox haradan alırsınız?" sualına olan cavabı araşdırarkən məlum oldu ki, onlar daha çox adi internet axtarışlarına üstünlük verirlər.

Tədqiqat zamanı o da məlum olmuşdur ki, anket sorğusunda iştirak edən 125 nəfərin əksəriyyəti təlim prosesi zamanı lazım olan elektron resurslarını ən çox internetdən-adi axtarış sistemindən əldə edir. Lakin təəssüflər olsun Azərbaycanın rəsmi elektron təhsil saytlarına müraciət edən belə istifadəçilərin sayı hələ də azdır. Beləlləri ümumi sualları cavablandıranların 6,7%-ni təşkil etdiyindən heç də qənaətbəxş sayıla bilməz. Bu isə təhsil müəssisələrində çalışanların təlim zamanı şagirdlərə milli elektron resurslar barədə ətraflı şəkildə məlumatların təqdim olunmadığını açıq şəkildə göstərir.

Beləliklə, məktəb direktorları, direktor müavinləri, psixoloqlar və fənn müəllimləri təlim prosesində İKT-dən istifadənin

şagirdlərin informasiya mədəniyyətinin formalaşdırılmasında bir vasitə olmasını deyil, onları bir-birindən təcrid olunmuş şəkildə başa düşdükləri üçün bu problemə ayrı-ayrılıqda yanaşdıqlarını bildirmişlər. VI, VII, VIII, IX, X, XI siniflərdə dərs deyən müəllimlərlə problemlə bağlı fikirləri təhlil edərkən məlum oldu ki, şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılmasında digər fənlərə nisbətən daha çox informatika dərslərində keçirilən mövzuların imkanları daha genişdir.

Şagirdlərin İKT-dən istifadə etməklə informasiya mədəniyyətinə yiyələnmələrində, onlarda bu mədəniyyətin formalaşdırılması zamanı məktəb direktorunun, müavinlərinin, psixoloqların və fənn müəllimlərinin bəzilərinin elmi-pedaqoji, fəlsəfi, psixoloji ədəbiyyatdakı informasiyaların çoxuna biganəliyi də müşahidə olunmuşdur. Elektron dərslərini hazırlayarkən adi Microcoft Office alətlərdən istifadə etdikləri, həmkarlarının hazır slaydlarından, CD-lərdən mənbə kimi müraciət etdiklərini, ümumi internet axtarışı sistemindən məlumatların doğruluğuna diqqət etmədən dərslərində istifadəsini, Azərbaycanda mövcud olan elektron təhsil resurslarından az məlumatlı olduqları da araşdırıldı. Bu cavablar internetdə sərbəst material axtarışında daha çox üstünlük təşkil etdiyinin və mənbələrin müxtəlifliyinin əyani sübutudur. Təəssüflə deməliyik ki, heç də hər zaman məktəb rəhbərliyi, psixoloq və fənn müəllimləri məsələyə nəzərdə tutduğumuz mövqedən yanaşa bilmirlər. Onlara verilən “Tədris prosesində ən çox hansı elektron resurslardan istifadə edirsiniz?”, “Şəxsi elektron resurs hazırlayarkən ən çox hansı elektron alətlərdən istifadə edirsiniz?”, “Tədris zamanı lazım olan resursları ən çox haradan alırsınız?” suallarına alınan cavabların təhlili məktəb rəhbərliyi, psixoloq və fənn müəllimlərinin bu məsələlərə səthi münasibətlərinin heç də həmişə lazımi səviyyədə olmadığını təsdiqlədi.

Eksperimentlərin müəyyənedici mərhələsində problemlə bağlı biz məktəbdə təhsil alan şagirdlərin də səviyyəsini üzə çıxarmaq məqsədilə anket sorğusu keçirdik. Araşdırma üçün hazırladığımız anket sorğusuna aşağıdakı sualları daxil etdik:

- dərs zamanı hansı üsulla keçilən mövzu daha maraqlı və yaddaqalan olur?
- keçdiyiniz mövzuya dair informasiyanı daha çox haradan alırsınız?
- Kompüterdən nə zaman istifadə edirsiniz?
- Fənlərin tədrisində İnformasiya-Kommunikasiya Texnologiyalarından (İKT) hansı fəndə (daha çox, daha az və ya heç olunmur) istifadə olunur?
- İnternetdə olan informasiyaları daha çox haradan əldə edirsiniz?
- Gündəlik fəaliyyətinizdə və məktəbdə olarkən müxtəlif informasiyaları hansı vasitələrlə alırsınız?
- Gündəlik fəaliyyətinizdə və məktəbdə olan müxtəlif informasiyaları necə və hansı vasitələrlə yoldaşınıza daha tez ötürürsünüz?
- İnformasiyaları alarkən onların doğruluğuna necə əmin olursunuz?
- İnformasiyanı paylaşarkən onun doğura biləcəyi nəticəni düşünmüsünüzmü?
- Daha çox nə cür informasiyaları paylaşırsınız?
- İnformasiya paylaşımı edərkən müəllif hüquqlarına diqqət edirsinizmi?
- Onlayn etika-netiket; bu barədə məlumatınız varmı?
- Təlim prosesində İKT-dən istifadə edərkən sizdə hansı “+” və “-” təsiri hiss edirsiniz?
- Özünüz hər hansı bir elektron resurs yaratmısınızmı?
- İKT-nin tədrisdə tətbiqinin səmərəli təşkilinə dair təkliflərinizi yazardınız.

Sorğuda 440 nəfər şagird iştirak etmişdir. Onlardan 70 nəfəri VI sinif, 70 nəfəri

VII sinif, 78 nəfəri VIII sinif, 74 nəfəri IX sinif, 68 nəfəri X sinif, 80 nəfəri XI sinif şagirdləri idi.

VI, VII, VIII sinif şagirdləri "Dərs zamanı hansı üsulla keçilən mövzu Sizin üçün daha maraqlı və yaddaqalan olur?", "Məktəbdə keçdiyiniz mövzuya dair informasiyanı daha çox haradan almağı üstün tutursunuz?", "Kompüterdən nə zaman istifadə edirsiniz?", "Fənlərin tədrisində İnformasiya-Kommunikasiya Texnologiyalarından (İKT) hansı fəndə (daha çox, daha az və ya heç olunmur) istifadə olunur?", "İnternetdə olan informasiyaları daha çox haradan əldə edirsiniz?", "Gündəlik fəaliyyətinizdə və məktəbdə olarkən müxtəlif informasiyaları hansı vasitələrlə alırsınız?", "Gündəlik fəaliyyətinizdə və məktəbdə olan müxtəlif informasiyaları necə və hansı vasitələrlə yoldaşınıza daha tez ötürürsünüz?", "İnformasiyaları alarkən onların doğruluğuna necə əmin ola bilərsiniz?", "İnformasiyanı paylaşarkən onun doğura biləcəyi nəticəni düşünmüsünüzmü?", "Daha çox nə cür informasiyaları paylaşırsınız?", "İnformasiya paylaşımı edərkən müəllif hüquqlarına diqqət edirsinizmi?", "Onlayn etika-netiket; bu barədə məlumatınız varmı?","Təlim prosesində İKT-dən istifadə edərkən sizdə hansı "+" və "-" təsiri hiss edirsiniz?", "Özünüz hər hansı bir elektron resurs yaratmısınızmı?" suallarına da aydın cavab verməmişlər. Yəni, onlar cavablarında dərs zamanı daha çox mühazirəyə, informasiyaları dərsliklərdən almağa, kompüterdən yalnız məktəbdə, o da çox az hallarda istifadə etdiklərini, yalnız informatika dərsində kompüter qarşısında olduqlarını, gərəkli olan sayt və sosial şəbəkələrdən istifadəni bilməmələrini, dəqiqləşdirilməmiş məlumatların pərakəndə paylaşım etdiklərini, onlayn etikanın nə olduğunu belə dərk etmədiklərini, "müsbət" və "mənfi" yüklü informasiyaların olmasına diqqət etmədiklərini bildirmişlər. IX, X, XI sinif şagirdləri isə əvvəlki sinif şagirdlərinə nisbətən anket sorğusunda qoyulmuş suallara bir qədər ətraflı cavab vermişlər. X, XI sinif şagirdləri kompüterdən daha çox mobil telefon, planşet və internetdən daha çox istifadə etdiklərini bildirmişlər.

Tablet kompüterləri, masaüstü və dizüstü kompüterlərdən daha kiçik və daha yüngül, sensorlu toxunmalı ekran özəlliyinə malik, bəzi növlərində özəl qələmi olan mobil texnologiyalardır. Tablet kompüterləri də təlim prosesində təhsilin maraqlı təşkilinə səbəb olan İKT vasitəsi kimi tədbiq olunur [1].

Son illərdə bu kompüterlər təhsilin məktəbəqədər, ümumiorta məktəb və liseylərə qədər olan səviyyələrində istifadəsinin əsas göstərici olmuşdur [2].

Tablet kompüterləri şagirdlərdə biliklərin yaradılmasına və nizamlamalarına izin verə bilən müxtəlif proqramlar təklif etməkdədir [3].

Bu zaman şagirdlər bu texniki avadanlıqlardan yalnız adi informasiyaları, eşitdiklərini, gördüklərini, çəkdiklərini dostlarına ötürmək üçün istifadə etdiklərini bildirmişlər.

Müşahidələr onu da göstərir ki, İKT avadanlıqları ilə müəyyən dərəcədə təmin olunmuş məktəblərin əksəriyyətində həmin avadanlıqlardan təlim prosesində istifadə səviyyəsi heç də ürəkaçan deyildir. Dərslərin müasir üsulda keçirilməsində İKT-dən bir vasitə kimi istifadə olunmasına diqqətin azlığı müəllimlərin İKT bilgilərinə yiyələnmələrinə olan münasibətlərinin yetərli olmamağından irəli gəlir. Biz nəticələri ən çox İKT-dən "daha çox" hansı fənlərdə istifadə olunduğunu və "heç olunmadığı"nı təhlil etdik. Nəticədən belə bəlli oldu ki, heç də bütün fənlərin tədrisində İKT-dən istifadə olunmur. Araşdırma zamanı məlum oldu ki, eyni maddi-texniki bazaya malik olan rayon və şəhər məktəblərində "İKT-dən daha çox" istifadə olunan fənn informatikadır. Digər fənlərdə isə, cədvəldən göründüyü kimi, çox

az sayda cavablarda İKT-dən heç istifadə olunmayan siniflərin göstəricisi verilmişdir. Təhlil zamanı məlum olmuşdur ki, əksər məktəblərdə coğrafiya, kimya, fiziki tərbiyə, tarix, Azərbaycan dili, ədəbiyyat, riyaziyyat, təsviri incəsənət, rəsmxət kimi fənlərin keçirilməsində İKT-dən istifadə edilmir.

Araşdırmalar zamanı belə nəticəyə gəldik ki, şagirdlər informasiya, informasiya mədəniyyəti, informasiya təhlükəsizliyi ilə bağlı olan məlumatları ancaq ötəri olaraq yalnız bəzi informatika müəllimlərindən alırlar. Ancaq problemlə bağlı anlayışların açıqlamalarını, həmçinin onlayn etikanın nə olduğunu heç də tam qavramırlar. Yuxarı sinif şagirdlərinin bir qismi İKT-dən istifadə zamanı, onun informasiya mədəniyyətinin formalaşmasında bir vasitə olduğunu anlasalar da, həmin məsələni elmi-pedaqoji cəhətdən ifadə etməkdə, bir qismi isə müəyyən dərəcədə sualları cavablandırmaqda çətinlik çəkirlər.

Müəyyənedici eksperimentin nəticələrini toplayıb araşdırdıqda aşağıdakılar məlum olmuşdur:

- məktəb rəhbərliyi İKT-dən istifadə və şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılmasının həyata keçirilməsi məsələsinə daha məqsədyönlü və mütəşəkkil şəkildə yanaşmalıdırlar;
- fənn müəllimləri İKT-dən bir vasitə kimi istifadə edərkən şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılmasının məzmununu, mahiyyətini, məqsəd və vəzifələrini mütəşəkkil şəkildə, planlı və məqsədyönlü olaraq çatdırılması işində daha dəqiq mövqe tutmalıdırlar;
- müxtəlif mövzuların tədrisində məktəbin yuxarı sinif şagirdləri informasiyaların dürüstlüyünə, məlumatların düzgünlüyünə əmin olmalıdırlar;
- şagirdlər internetdən istifadə, informasiyaların toplanması, saxlanması və ötürülməsinin planlı şəkildə aşılanmasını düzgün həyata keçirilməlidir;
- Azərbaycanda mövcud olan dövlət təhsil saytları və gərəkli internet mənbələri şagirdlərə müntəzəm təqdim olunmalıdır;
- İKT-dən düzgün istifadə olunması, internetdə olarkən dürüst davranmağın, onlayn etika anlayışları aydınlaşdırılmalıdır;
- Təlim prosesində İKT-dən istifadə şagirdlərin informasiya mədəniyyətinin formalaşdırılması vasitəsi kimi məsələlərin nəzəri və təcrübi əsaslarının elmi-pedaqoji cəhətdən həyata keçirilməsində diqqətdən kənarda qalmamalıdır.

Pedaqoji ədəbiyyatda şagirdlərin İKT-dən istifadə zamanı informasiya mədəniyyətinin formalaşdırılmasına istiqamət verən vəsaitin, dərslik və tövsiyələrin olmamasını, məktəb təcrübəsində mövcud problemin öz əksini lazım və tələb olunan səviyyədə tapmamasını nəzərə alaraq, həm müəllimlərlə adı gedən problemlə bağlı işin qurulması, həm də yuxarı sinif şagirdləri ilə bu məsələnin daha geniş şəkildə tədqiq edilməsi məqsədəuyğun sayılmalıdır.

Məktəbdə təhsil alan şagirdlərin, ümumilikdə hər hansı bir şəxsiyyətin mövcud informasiya cəmiyyətinin şərtlərinə uyğun hazırlanması əsas prioritet məsələlərdən biri olmalıdır. Bu prosesdə istədiyimiz müsbət nəticələrə nail olmaq üçün informasiya texnologiyalarının təhsilə tətbiqi sahəsində ilk olaraq müəllimlərin, ziyalı təbəqənin özlərində informasiya mədəniyyətinin formalaşmasına nail olmaq lazımdır. “İnformasiya mədəniyyəti insanın həyat və ya peşə fəaliyyəti dövründə qarşıya qoyulmuş məqsədə çatmaq üçün həlli vacib olan məsələlərin həllində ona lazım olan informasiyanın əldə edilməsi, emal olunması və tətbiqini nəzərdə tutur. Kompüter hazırda bütün bu informasiya proseslərini həyata keçirmək üçün çox güclü və əlverişli vasitə olduğundan, insan onun köməyi ilə lazım olan bir çox əməliyyatları yerinə yetirə bilər. Bu baxımdan da kompüterdə işləmək, onun

proqram və aparat təminatı haqqında bilgilərə malik olmaq, eləcə də digər informasiya texnologiyalarını tətbiq etmək bacarıqlarının olması insanın informasiya mədəniyyətini xarakterizə edən əsas xüsusiyyətlərdəndir” [6].

Aparılan araşdırmaların nəticəsi bir daha təsdiq edir ki, məktəblərdə təhsil alan şagirdlərin İKT-dən bir alət kimi istifadə edərək informasiya mədəniyyətinə yiyələnmələri zəruri səriştə kimi praktik istiqamətli fəaliyyətlər tələb edir. Mövcud təhsil texnologiyaları bu fəaliyyətlər nəzərə alınmaqla yenidən nəzərdən keçirilməli və orijinal texnologiyaların hazırlanması istiqamətində addımlar atılmalıdır.

***Rəyçi: dos. Ə.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Dündar H. ve Akçayır M. Implementing tablet PCs in schools: Students attitudes and opinions. Computers in Human Behavior, 32, 2014.
2. Benlloch-Dualde, J.-V., Buendia F., Cano J.-C. A tablet PC-based teaching approach using conceptual maps. Education Engineering (EDUCON). 2010.
3. Moran M., Hawkes M., El-Gayar O. Tablet personal computer integration in higher education: Applying the unified theory of acceptance and use technology model to understand supporting factors. Educational Computing Research? 42 (1). 2010.
4. Əliquliyev R., Mahmudova R. Şəxsiyyətin informasiya mədəniyyətinin formalaşdırılmasında təhsil sisteminin vəzifələri. //Azərbaycan məktəbi, 2012, № 4.
5. Mehrabov A. Müasir təhsilin konseptual problemləri. Bakı: Mütərcim, 2010.

**А.Хасрет**

**О формировании информационной культуры учащихся**

**Резюме**

Результаты опроса, проведенного среди руководителей школ и школьников описывается в статье. Научно-педагогические основы формирования информационной культуры школьников комментируется как проблема. Систематизируя данные вопросы, проблема и ее психологическая специфика обьясняется с научно-педагогической точки зрения, а также вопросы динамики развития. Обозначаются педагогические, психологические и социальные условия проблемы. Комментируются пути формирования информационной культуры школьников.

**A.Hasrat**

**Analysis of formation of information culture of pupils**

**Summary**

Results of survey conducted with school principals and pupils are described in the article. Scientific-pedagogical bases of formation of information culture of pupils are commented as an issue. Systemizing given questions, the problem, its psychological options and issues of development dynamics as well are explained from scientific-pedagogical point of view. Represented pedagogical, psychological and social conditions of the problem. Commented the ways of formation of information culture of pupils.



# ŞAGİRDLƏRİN DİNLƏMƏ BACARIQLARININ İNKİŞAF ETDİRİLMƏSİNİN HƏLLİ YOLLARI

**Aysel Xəlilova,**
***filologiya üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *dinləmə bacarıqları, təbii söhbət, təbii həyati vəziyyətlər, üz-üzə söhbət, dinləmə bacarıqlarının inkişafı.*

***Ключевые слова:*** *умение слушать, естественный разговор, естественные жизненные ситуации, лицом к лицу разговор, развитие навыков прослушивания.*

***Key words:*** *listening skills, natural conversation, natural life situations, face-to-face conversation, development of the listening skills.*

Müasir təlim texnologiyalarında ən mühüm məzmun xətlərindən biri dinləmək bacarıqlarının aşılanmasıdır. Tələbə o zaman materialları dəqiqliklə mənimsəyə bilir ki, o, mətnləri, müsahibədə olduğu insanları diqqətlə dinləmək bacarığına yiyələnir. Çünki bu zaman sözlərin vurğusunu, tələffüzünü, mənasını, işlənmə kontekstini dərk edir və öz fəaliyyətində tətbiq edir.

Azərbaycanın Avropaya sürətlə inteqrasiya etdiyi bir dövrdə universitetlərdə xarici dilin tədrisi ön sırada durur. Belə bir dövrdə xarici dilin tədrisində qarşıya çıxan problemlərin həlli pedaqoqları, metodistləri, dil müəllimlərini dərindən düşündürür.

Kembric universitetinin professoru Penni Ur yazır: "Mən bir neçə il fransız dilini məktəbdə öyrəndikdən sonra günlərin birində Fransaya getməli oldum. Orada başa düşdüm ki, fransızların dediyini anlamıram. Mən onlardan xahiş edirdim ki, bir az aramla danışsınlar, dedikləri sözü bir neçə dəfə tələffüz etsinlər. İstəyirdim müəllimlərim məktəbdə mənə necə tələffüzü öyrədiblərsə, onu da eşidim. Ancaq mən yenə də onları başa düşməkdə çətinlik çəkirdim. Bəs problem nədə idi?" Penni Urun başına gələnlər sonradan onu bu problemin üzərində düşünməyə məcbur etdi. Azərbaycanda ixtisası ingilis dili olmayan universitetlərdə təhsil alan tələbələr də çox vaxt bu problemlə qarşılaşır. Onlar iki və ya üç semestr ingilis dili dərsi keçirlər və onun tədrisindən bir neçə müddət sonra bir xarici ilə qarşılaşdıqda onu anlamadıqlarını görüb dili inkişaf etdirmək məqsədilə əlavə kurslar axtarırlar. Fərdi müəllimlərə müraciət edirlər. Necə edək ki, qeyri-ixtisas universitetlərində iki - üç semestr ingilis dili öyrəndikdən sonra tələbələr ingilis dilində mükəmməl danışa bilsinlər? Bu problemi aradan qaldırmaq üçün düşünməyə dəyər. Bəzən düşünürük universitetlərdə ingilis dilinə ayrılan dərs yükü azdır? Və ya dərslər keyfiyyətsiz keçilir? Bəlkə daha optimal metodika ilə bu problemi aradan qaldırmaq olar?!

Avropa alimləri bu problemlə bağlı bir sıra araşdırmalar aparmışlar. Məsələn, Brad Şou 2005-ci ildə nəşr etdirdiyi "İngilis dilinin peşəkar tədrisi" (English Teaching Professional) kitabında bu problemlə bağlı maraqlı fikirlər söyləyir. O qeyd edir ki, ana dili ingilis dili olmayan tələbələrdə danışıq zamanı ortaya çıxan problemin əsas səbəbi dərs zamanı canlı danışıqlara üstünlük verməyib, dinləmə çalışmalarından çox istifadə edilməsidir…

2012-ci ildə Penni Ur da bu fikirləri tamamlayır. O da dərslərdə audio disklərdən əlavə canlı danışığa, təbii situasiyalardan istifadəyə daha üstünlük verir. Fikrimizcə, alimlər haqlıdır.Tələbə dərs zamanı diskdəki söhbətləri və monoton mətnləri dinləyir, bununla paralel bəzən onları kitabdan oxuyur. Çalışmalar bu cür davam edir. Tələbələrə elə gəlir ki, onlar oxuduqları və dinlədikləri mətnlər vasitəsilə dilin incəliklərinə yiyələndilər. Ancaq bu belə deyil. Məsələ burasındadır ki, mətni danışanlar tələbənin dil səviyyəsinə uyğun olaraq aramla, düzgün tələffüzlə, tələsmədən danışır. Hələ üstəlik tələbə danışılan mətni qarşısındakı kitabdan oxuyursa, onda sözsüz ki, dinlədiyi mətnə aid çalışmaları asanlıqla həll edəcəkdir. Məgər biz adi danışıq zamanı bir-birimizlə söhbət edərkən aramla, sakit və düzgün tələffüzləmi danışırıq?! Adi insanlar arasında sözü düzgün tələffüz etməyən, ləhcə ilə, ara sözləri ilə danışan azdırmı? Biz danışıq zamanı dilin bütün orfoqrafik qayda-qanununa riayət edirikmi? Əlbəttə, yox və bu da təbii haldır. Bildiyimiz kimi, dünya dillərində rəsmi və diplomatik danışıq qeyri-rəsmi danışıq dilindən fərqlənir. Buna görə də tələbələr xaricə gedərkən çətinlik çəkir.

Bu problem üzərində bəzi araşdırmalar apardıq. Birinci problem bundan ibarət oldu ki, tələbələr üçün nəzərdə tutulan dərsliklərdə dinləmə materialları qrammatik qaydalara uyğun şəkildə seçilir. Məsələn:

Listening exercise 1. (Bütün sinif mətnə qulaq asır):

Ozone is a gas composed of molecules possessing three oxygen atoms each(as distinct from oxygen, which has two atoms per molecule).It exists in large quantities in one of the upper layers of the atmosphere, known as the stratosphere, between 20 and 50 kilometers above the surface of the earth. The ozone layer filters out a large proportion of the sun's ultra-violet rays and thus protects us from the harmful effects of excessive exposure to such radiation.

Mətni dinlədikdən sonra müəllim tələbələrə deyir ki, həmin mətnin altındakı iki cavablı testləri etsinlər:

1. The passage is discussing the topic of
a) Radiation. b) Oxygen. c) Ozone. d)Molecules
2. Ozone molecules are different from oxygen molecules in that they
a) Have three atoms of oxygen.
b) Exist in large quantities.
c) May have one or two atoms.
d) Have one atom of oxygen.
3. The stratosphere is
a) Above the atmosphere.
b) Below the atmosphere.
c) More than 20 kilometers above the surface of the earth.
d) More than 50 kilometers above the surface of the earth.
4. The ozone layer
a) Prevents some harmful radiation from reaching the earth.
b) Stops all ultra-violet rays from reaching the earth.
c) Protects us from the light of the sun.
d) Involves excessive exposure to ultra-violet rays.

Dinləmə bacarığını inkişaf etdirmək üçün ingilis dili dərslərində istifadə olunan çalışmalar, adətən, aşağıdakılara əsaslanır:




(Siyahı davam edə bilər)

Bu tip çalışmalar tələbələrin ilkin dil səviyyələrində (beginner, elementary, pre-

intermediate) dinləmə bacarığını inkişaf etdirir.

Apardığımız tədqiqatlara görə tələbələr ikinci dil səviyyəsinə (pre-intermediate) çatdıqdan sonra onlara bu tip çalışmaları dinlətdirmək kifayət deyil. Dərslərdə canlı söhbətlərə, üzbəüz interaktiv situasiyalara daha çox yer vermək lazımdır. İnteraktiv, üzbəüz situasiyalara musahibə, dərslərdə söhbətlər, alış-veriş zamanı müştərilərlə alıcıların etdiyi bu tip danışıqlar aid edilə bilər.

Bəs bu söhbətlərin əhəmiyyəti nədir?

• Belə söhbətlər, adətən, qeyri- rəsmi olur.

• Danışılan nitq səsli oxumaq üçün əvvəlcədən hazırlanmır, improvizə edilir. Söhbət əsnasında tələbə məcburdur ki, verilən suala dərhal, düşünmədən cavab versin. Bəzi istisna hallar var ki, tələbələrin qulağı onu hər gün eşitdiyinə görə həmin informasiya beyində avtomatlaşır, eşitməyə hazır olur. Məsələn, televiziya və radio xəbərləri, hava limanındakı elanlar, mühazirə mətnləri və başqaları. Bunlar, improvizə edilmiş nitqlərdən fərqlidir.

• Əgər tələbə danışanı görürsə, bu onun üçün rahatdır. Çünki tələbə danışdığı adamın təkcə nitqindən deyil, onun emosiyalarından, jestlərindən, mimiklarından nə demək istədiyini anlayır. Məhz buna görə də əgər danışan radiodadırsa (görüntüsüzdürsə), telefonda danışırsa, dinləmə və danışanı anlamaq çətinləşir.

• Canlı danışıq zamanı biz verilən suala dərhal cavab vermək məcburiyyətindəyik.

Qeyd etdiyimiz kimi, dinləmə bacarıqlarını tələbələrə aşılayarkən dərs zamanı və dərsdənkənar təbii situasiyalara müraciət etmək lazımdır. Yəni xarici dili öyrənən dövrdə tələbənin ancaq dərs zamanı ingiliscə dərs danışmağı, çalışma etməyi, dinləməyi, mətn oxumağı ona kifayət deyil. Tələbə mütləq şəkildə dillə (xarici dillə) dərsdən kənar müxtəlif formalarda məşğul olmalıdır. Bunu Kembric Universitetinin alimi Jeremy Harmer “Geniş dinləmə” (extensive listening) adlandırır. Alim iddia edir ki, dil dərsi zamanı tələbə nə qədər çalışqan olsa da, əgər bu dil tələbənin ana dili deyilsə, dərsdən kənarda o bu dili inkişaf etdirmirsə, tələbənin həmin xarici dili sərbəst şəkildə danışmasından söz gedə bilməz. Jeremy Harmerin bu fikirlərindən sonra Azərbaycan Dövlət İqtisad Universitetinin Beynəlxalq İqtisadiyyat fakültəsinin 1-ci kurs 1023-cü qrupunda belə bir eksperiment aparıldı. Tələbələrə hər dərs belə bir ev tapşırığı verildi. Onlar dərsdənkənar ingilis dilində radio və televiziyalara qulaq asaraq hər dərs müəllimə ingiliscə bir xəbər danışmalı, iki həftədən bir ingilis ve amerikan kinosuna baxaraq onun qruplarda müzakirəsi təşkil edilməli, kinolardan bəzi səhnələri canlandırmaqla, hər gün ingilis dilində mahnılara qulaq asıb, sözlərin tələffüzünə diqqəti artırmalıdır. Bu zaman dialekt və şivələrə xüsusi nəzər yetirilməlidir. Qeyd etdiklərimiz qoyulmuş eksperimentin bir hissəsidir. Eksperimentin nəticəsi də maraqlı olur.

Semestrin sonu həmin tələbələrin dərsinə amerikalı dəvət olundu. Məşğələdən kənar dil bacarıqlarını inkişaf etdirməyə səy göstərən tələbələrlə, yalnız məşğələdə verilən tapşırıq və müzakirələrlə kifayətlənən tələbələr arasındakı fərq də az olmur:




Evdə tapşırığı yerinə yetirən

tələbələrdən 76%-i amerikanla rahat söhbət edə bildi. Həmin tələbələrdən 14%-i danışıqda kəkələməyə başladı. Dərsdən kənarda çalışmayan 10% tələbə isə amerikan qadının danışığını bəzən anladı, bəzən də anlamadı. Bundan belə nəticə çıxarmaq olar ki, sonuncular dərsdən kənarda ingilis dilini inkişaf etdirmədiklərinə görə onlar universitetdə beyinlərində avtomatlaşmış ingilis sözlərinin hesabına xarici dildə cümlənin bəzi sözlərini dərhal anlayır, lakin nitq sürətinə öyrəşmədiyinə görə, daha doğrusu, dərs zamanı qulaq asdığı dinləmə çalışmalarındakı danışıq sürətinə öyrəşdiyinə görə amerikanla danışmaqda çətinlik çəkdilər.

İngilis dilinin tədrisi zamanı dinləmə bacarığının inkişaf etdirilməsi vacib və danılmazdır. Göstərdiyimiz problemlər birbaşa dinləmə bacarığına aid olduğundan onların həlli üçün aşağıdakı təkliflər verilir:

• Dərs zamanı canlı danışıqdan istifadə etmək. Tələbə real həyat situasiyaları yaratmaqla təbii danışığa və eyni zamanda dinləmək bacarığına yiyələnir.

• İngilis dili dərslərində ana dilindən istifadə etməmək.

• Dinləmə bacarığını inkişaf etdirmək üçün audio treklərlə kifayətlənməmək.

• Dərsdən kənarda ingilis dilində kinolara baxmaq.

• Xarici universitetlərlə müntəzəm telekörpü təşkil etmək.

• Dərs zamanı səhnələrə, rollu oyunlara üstünlük vermək.

• İngilis dilində daha çox söhbət etmək, sual cavabın sayını artırmaq.

• Dərslərdə öyrətmə və öyrənmə strategiyalarından istifadə etmək.

• Trekləri dinlədikdən sonra tələbələri sözləri onlar kimi tələffüz etməyə məcbur etmək.

• Dərslərə xariciləri dəvət etmək.

• Tələbələrə nağıl oxumaq və eşitdiklərini ifadə şəklində yazdırmaq.

Fikrimizcə, qarşıya qoyulan problem bir çox ikinci dil öyrənənlərin rast gəldiyi maneələrdən biridir və həmişə onların ən optimal yollarından istifadə edilməkdədir.

***Rəyçi: prof. Z.Xəlilov***

## İstifadə edilmiş ədəbiyyat

1. Bradshaw C. Giving great Instructions. English Teaching Professional. 2005.
2. Davies A. The Native Speaker: Myth and Reality Multilingual Matters. 2003.
3. Jeremy H. The practice of English Language Teaching. 2007.
4. Penny U. A course in English Language Teaching. 2012.
5. Rivers W. Teaching foreign language skills. Chicago, University of Chicago.

**А.Халилова**

**Пути решения развития умения слушать у учеников**

**Резюме**

Иcледователь старается определить проблемы, выявленные во время преподавания английского языка, старается анализировать по своему задачу, поставленную в обращении к иностранному ученому.

**A.Khalilova**

**Solutions to improve students' listening skills**

**Summary**

The researcher tries to find out the problems arisen during the English language teaching. She tries to address to the foreign scientist, to analyze their thought of the given problem.

# DƏRSLƏRDƏ KOMPÜTER TEXNOLOGİYALARINDAN İSTİFADƏNİN SƏMƏRƏLİLİYİ

**Aytac Rzayeva,**
***Xətai rayonu, 24 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *təlim prosesi, kompüter texnologiyası, fəal və interaktiv təlim metodları.*

***Ключевые слова:*** *процесс обучение, компьютерные технологии, активные и интерактивные методы обучения.*

***Key words:*** *learning process, computer technology, active and interactive learning methods.*

Bütün texnoloji imkanlara sahib olan XXI əsr insanı öz biliyi, bacarığı və inkişaf səviyyəsinə görə, ilk növbədə, kompüter texnologiyalarının durumuna görə fərqlənir.

Şagirdin bir şəxsiyyət kimi formalaşmasında müəllim peşəkarlığının xüsusi rolu vardır. Hər bir müəllimin əsas vəzifəsi yalnız şagirdlərə bilik vermək deyil, həm də şagirdin mənəvi mədəniyyətini inkişaf etdirmək, onu fəal düşüncələrə malik tərbiyəli, təhsilli, yaradıcı şəxsiyyət kimi yetişdirməkdir. Bu fikirlər "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda xüsusilə vurğulanmışdır (1).

Bilik keyfiyyətinin əsas meyarlarından biri tədris edilən materialın akademik tərəflərini araşdırmaqla bərabər, şagirdlərdə məntiqi təfəkkürü inkişaf etdirmək, biliyin necə əldə olunması yollarını başa salmaq, nəticəyə gedən yolu araşdırmağı öyrətməkdir. Tədris prosesində biliyin praktik əhəmiyyəti şagirdlərə başa salınmalı, şagirdlər arasında təcrübə mübadiləsi, müzakirəsi aparılmalıdır. Bunu həyata keçirmək üçün isə ən yaxşı metod fəal və interaktiv təlim metodlarından, yeni pedaqoji texnologiyalardan istifadə etməkdir.

Yeni pedaqoji texnologiyalardan istifadə etməkdə məqsəd şagirdin idrak qabiliyyətini, təfəkkürünü, intellektual səviyyəsini inkişaf etdirməkdir. Bu gün əsas məqsəd şagirdə daha çox bilik vermək deyil, ona öyrənməyi öyrətmək, onun düşünmək qabiliyyətini, fikri fəallığını, müstəqilliyini inkişaf etdirməkdir. Şagirdə yaxşını və pisi seçmək, həqiqəti öyrətmək deyil, həqiqəti tapdırmaq bu gün yeni pedaqoji təfəkkürün mahiyyətini əks etdirir.

Vaxtilə böyük alman alimi Adolf Disterverq müəllimlərə müraciətlə deyirdi ki, uşaqlara bacardıqca az öyrədin. Onlara düşünməyi, fikirləri deyil, fikirləşməyi öyrədin, düşünən insan bilən insandır.

Artıq pedaqogika elmi təsdiq etmişdir ki, şagirdlərin fəallığının və bilik keyfiyyətinin yüksəldilməsi müəllimin peşəkarlıq səriştəsi, onun yaradıcı fəaliyyəti və fəal, interaktiv metodlardan səmərəli istifadə etməsi ilə mümkün olur.

Fəal təlim metodlarının tədris prosesinə daxil edilməsi şagirdlərin passivliyinin aradan qaldırılmasına, təfəkkürün inkişafına, təlimin keyfiyyətinin yüksəldilməsinə şərait yaradır. Fəal təlim metodlarının tətbiqi nəticəsində Təhsil sahəsində İslahat Proqramının, Təhsil Qanununun tələblərini - təlim-tərbiyə prosesinin demokratikləş-

dirilməsi, humanistləşdirilməsi, humanitarlaşdırılması, diferensiallaşdırılması, fərdiləşmə, inteqrasiya, səmərəlilik, keyfiyyətlilik prinsiplərini geniş tətbiq etməklə həyata keçirmək olar (2).

Belə təlim metodlarından istifadə zamanı uşaq hüquqlarına, insan şəxsiyyətinə, ləyaqətinə hörmət edilir, şagird şəxsiyyət kimi formalaşdırılır. Eyni zamanda şagirdlərə elmi bilikləri qazanmaqda, onların bacarıq və vərdişlərinin möhkəmləndirilməsində çox geniş imkanlar yaranır. Bu zaman müəllim keyfiyyətli dərsin əsas amili kimi, əks-əlaqəyə girərək müəllim-şagird əməkdaşlığında iştirak edir.

Fəal dərs sadəcə yaradıcı motivasiya və kreativ düşüncənin formalaşması üzərində qurulmaqla bitmir. Şagird təffəkürünü inkişaf etdirmək üçün dərs prosesi elə qurulmalıdır ki, şagirdlər Blum taksonomiyasını əks etdirən piramidanı dərketmənin bütün 6 səviyyəsinə (qavrama, bilik, təhlil, tətbiq, sintez, qiymətləndirmə) qədər gəlib çıxa bilsinlər.

Dərs prosesindəki müşahidələrə əsaslanaraq demək olar ki, şagirdlərdə yüksək düşüncə tərzini formalaşdırmaq üçün ilk növbədə motivasiya düzgün qurulmalıdır. Verdiyimiz ilkin biliyi şagird necə qavrayırsa o şəkildə də tətbiq edir və qavramaya görə Blumun aşağısəviyyəli dərketmə formalarından təhlil, sintez, qiymətləndirmə səviyyəsinə qədər gəlir. Sinifdə tətbiq olunan ilkin biliyin perspektivliyini artırmaq üçün şagirdlərdə fərdi xüsusiyyətləri inkişaf etdirəcək hər şagirdin bilik səviyyəsinə uyğun tapşırıqlar hazırlamağa, tədris prosesini motivasiyanı artırmağa yönəlmiş tədris sistemi kimi təkmilləşdirməyə səy göstərmək lazımdır. Səmərəli bilik transfer etmək, həm də şagirddə özünü inkişafı tətbiq edilə bilər, çünki müasir tədris prosesində dərsin standartı reallaşdıracaq tərzdə qurulmasının aparıcı rolu böyük imkanlar yaradır, informasiyalaşdırma mühitini artırır. Riyaziyyatın tədrisində informasiya texnologiyalarından istifadə etmək dərsi maraqlı və anlaşıqlı edir. Sinif kompüter təminatı ilə tam təmin olunsa, şagirdlər özlərini daha yaxşı hiss edərlər. Komfortlu şərait tədrisin yeni xüsusiyyətlərini bilməyə imkan verən bir vasitədir.

Kompüter texnologiyasından istifadə fikrimcə, bir tərəfdən uşaqların intellektual potensialının genişləndirilməsi üçün mükəmməl mühit, digər tərəfdən isə onların kütləvi informasiya məkanına aludə olması üçün təhlükə yaradır. Bütün bunları nəzərə alaraq virtual aləmdə, kompüter texnikasından düzgün istifadə etmək üçün yaş həddi nəzərə alınmalı və buna müəllimlər, valideynlər tərəfindən nəzarət olunması vacibdir!

İnternet nəhəng bir resursdur. Ondan faydalı istifadə etmək məqsəd və təlimin məzmununu dəyişir. Təhsil prosesində İKT-dən istifadə üçün seçilən variantları nəzərdən keçirəndə aydın olur ki, kompüter laboratoriyasında keçirilən dərsdə aşağıdakı vəzifələr həyata keçirilir:

- birincisi, bəzi mövzulara uyğun krassvord, pazl, qrafik, oyunlar, dəyirmi masalar və cədvəlləri yaratmaq üçün PC-dən istifadə edərək təhsil materialını işləmək, ikincisi, müxtəlif proqram imkanlarını tədqiq etmək;
- müstəqil iş mövzusunda ənənəvi dərslər elektron informasiya resursları ilə, xüsusi təlim sistemləri, elektron dərsliklə əvəz olunur.

Riyaziyyatda informatikanın tətbiqi olduqca mürəkkəb mövzudur. Buna görə də, resursların, tədris metodları və texnologiyaların ən yaxşı birləşməsini tapmaq lazımdır ki, təlimin səmərəliliyi artırılsın.

Tədrisin keyfiyyətini yüksəltmək prosesində məlumat mübadiləsi olmadan, həm də müzakirəsiz keçirmək olmaz. Bu gün "İnformasiya texnologiyaları" termini

deyiləndə elektron resurslar vasitəsilə toplanmış informasiyaların emalı, təqdimatı, informasiyadan istifadə üsul və vasitələri prosesləri nəzərdə tutulur. Bunlarla yanaşı müəllimin qarşısında üç prinsip var:

• adaptasiya prinsipi;
• interaktiv prinsip;
• fərdi prinsip.

Bu prosesdə, xüsusən interaktiv metodların tətbiqi mühüm əhəmiyyət kəsb edir. "İnteraktiv" bizə ingilis dilindən keçərək üç mənanı ifadə edir: Birincisi, "interno" şəklində, yəni "daxili", "daxil olmaq" mənasında, ikinci, "İnter"-dialoq, əməkdaşlıq, üçüncü isə "international" şəklində "beynəlxalq əlaqə" mənasında işlədilir. "Aktiv" sözü isə beynəlxalq status almış "aktivation" sözündən olub, "fəal", "fəallıq", "fəallaşmaq" mənasında işlədilir. Deməli, "interaktiv" sözü pedaqoji prosesin son dərəcə dinamik fəallaşdırılması kimi başa düşülməlidir. Bu dərsin bütün mərhələlərində həyata keçirilməlidir.

İnteraktiv prinsip dialoq və pedaqojiyönümlü şəklində istifadəçi ilə fəal qarşılıqlı interfeys əlaqədə olan şagirdin şüurlu fəaliyyətini idarə edən kompüter əməliyyatları tərəfindən dəstəklənən mühit prinsipdir.

Fərdi prinsip isə fərdi vəzifələr ilə təmin olunmanın və onların icrası nəticələrini yoxlamaq, təhsil fəaliyyətinin aktivləşməsinin öyrənmə gücünü artıraraq şagirdlərə müstəqil iş üçün şəraitin yaradılmasını nəzərdə tutur.

İnteraktiv təlimə tədrisin və idrak fəaliyyətinin təşkili və idarə olunması metodlarının məcmusu kimi baxmaq olar. İnteraktiv təlim üçün aşağıdakı cəhətlər səciyyəvi sayılır:

- müəllim tərəfindən şüurlu surətdə (iradi olaraq) idraki problem situasiyasının yaradılması;
- problemin həlli prosesində şagirdlərin fəal tədqiqatçı mövqeyinin stimullaşdırılması;
- şagirdlər üçün yeni və zəruri olan biliklərin müstəqil kəşfi, əldə edilməsi və mənimsənilməsi üçün şəraitin yaradılması.

Yeni yanaşmanın mahiyyəti ondan ibarətdir ki, təlim şagirdlərin yaddaşının təkcə yeni elmi biliklərlə (informasiya ilə) zənginləşdirilməsinə deyil, həm də təfəkkürün müntəzəm inkişaf etdirilməsi əsasında daha çox biliklərin müstəqil əldə edilməsi və mənimsənilməsinə, ən mühüm bacarıq və vərdişlərin, şəxsi keyfiyyət və qabiliyyətlərin qazanılmasına yönəlmişdir. Bu zaman şagirdlər müəllimin rəhbərliyi altında xüsusi seçilmiş, asan başa düşülən və yadda qalan, ən vacib təlim materialının öyrənilməsi prosesində fakt və hadisələrin səbəb-nəticə əlaqələrini, qanunauyğunluqlarını aşkar etməyi, nəticə çıxarmağı, mühüm və dərin ümumiləşdirmələr aparmağı öyrənirlər.

İnteraktiv təlim metodunun tədris prosesinə daxil edilməsi şagirdlərin passivliyinin aradan qaldırılmasına, lazım olan təfəkkür xüsusiyyətlərinin və yaradıcılığın formalaşdırılması və təlim keyfiyyətinin yüksəldilməsinə şərait yaradır.

İnteraktiv təlim prosesində şagirdin mövqeyi – "kəşf edən", "tədqiqatçı", araşdırıcı" mövqeyidir; o, gücü çatdığı məsələlər və problemlərlə üzləşərkən, bunları müstəqil tədqiqat prosesində həll edir. Şagirdlər təlim prosesində passiv dinləyici deyil, fəal düşünən, danışan, fikir söyləyən, münasibət bildirən bir subyekt, təlim prosesinin tam hüquqlu iştirakçısı, tədqiqatçısı kimi çıxış edir, bilikləri fəal axtarış və kəşflər prosesində mənimsəyirlər.

Müəllimin mövqeyi – fasilitator ("bələdçi", "aparıcı") daha çox istiqamətverici mövqedir. O, problemli vəziyyətləri planlı və istiqamətlənmiş surətdə təşkil edir, şagirdlər qarşısında tədqiqat məsələlərinin

meydana çıxmasına şərait yaradır və onların həllinə metodiki kömək göstərir.

Son dövrlərdə nəşr olunan "Pedaqogika" dərslik və dərs vəsaitlərində professor R.L.Hüseynzadə (3), professor L.N.Qasımova (4) çox haqlı olaraq fəal və interaktiv təlim metodlarına geniş yer vermişlər. Tədqiqatçı pedaqoq Z.Veysova bu sahədə bir neçə dəyərli vəsait yazmış və qiymətli tədqiqatlar aparmışdır (5). Bu dəyərli mənbələrdə xüsusilə göstərilir ki, təlim prosesində interaktiv metodların tətbiqi zamanı müəllimdən, ilk növbədə yaradıcılıq, peşəkarlıq səriştəliliyi, novatorluq tələb edilir.

Qeyd edək ki, bu prosesdə kompüter texnologiyalarını xarakterizə edən meyarlara ciddi əməl edilməlidir:

• texniki mühit (əsas vəzifələri üçün istifadə texnika növü);

• proqram ətraf mühiti (proqram alətlər dəsti);

• mövzu mühiti (elm, texnologiya, bilik xüsusi domen məzmunu);

• metodiki mühit (təlimat, istifadə, performans qiymətləndirilməsi və b).

Yuxarıda, əsasən, ilk növbədə riyaziyyatın öyrənilməsində informasiya texnologiyalarının tətbiqindən danışıldı. Bu proqramlarla işlərkən yalnız tanışlıq deyil, eyni zamanda özlərini maarifləndirmək üçün müəllimlərlə yanaşı şagirdlər də yüksək professionallıq əldə edə bilərlər.

Müəllim nə qədər məhsuldar işləyərsə, şagirdlərin kommunikativ bacarıqlarının inkişafı bir o qədər innovatik, bilikyönümlü, şəxsiyyətyönümlü olar. Çünki riyaziyyatda informasiya texnologiyalarının və WEB alətlərinin tətbiqi şagirdlər üçün daha cəlbedicidir.

Riyaziyyat dərsində İKT-dən istifadə motivasiyanı artırır, vaxta qənaət bilik və bacarıqların çoxtərəfli və hərtərəfli mənimsənilməsini fəallaşdırır ki, bu da fəal dərsin əsas şərtlərindən biridir. Mövzunun aydın və rəngarəng materiallarla təmin olunması dərsə marağı artırır.

İnformasiya texnologiyalarından dərslərdə istifadənin müxtəlif növləri vardır:

1. Dərs-mühazirə; dərs hazırlanması və problemlərin həlli;

2. Yeni materialın dərsə tətbiqi; Integrated dərslər və s.

Fikrimizcə, müəyyən bacarıq və bilik tələb edən yeni anlayışlar, nümayiş modelləri kimi Mathlab, Ceo-cebra proqramları, Texnolojik, Wolfhram saytları müasir təhsil standartlarına tam uyğundur. Bu tədris metodlarını (məlumat və qəbul, reproduktiv, problem, araşdırma) necə öyrənmək prosesinə rəvac verir.

Bu proqram və saytların orta və aşağı təhsil imkanlarından şagirdlər suallara cavab tapmaq, biliklərini sistemləşdirmək və ümumiləşdirmək, yüksək akademik qabiliyyət, müxtəlif idrak və düşüncə tərzini genişləndirmək və biliklərini dərinləşdirmək üçün istifadə edirlər.

Elm və texnikanın sürətlə inkişaf etdiyi dövrdə hər bir müəllim yeni texnologiyalardan istifadə etmək bacarıqlarına yiyələnməlidir. Müasir şəraitdə informasiya texnologiyasından səmərəli istifadə etməklə şagirdin fərdi öyrədilməsinə, praktik biliklər əldə etməsinə nail olmaq olar. Məsələn, təlimdə mükəmməl öyrədici proqram sistemlərindən, web texnologiyalardan, onlayn resurslardan, elektron lövhələrdən istifadə olunması buna imkan verir. Təlimdə fərdi yanaşma prinsipini təmin etmək müəllimdən yüksək peşəkarlıq tələb edir.

Riyaziyyatda İKT-dən istifadə təcrübəsi ən effektiv üsul hesab edilə bilər. Eyni kompüter sinfindən istifadə, multimedia

alətləri ilə təşkil olunan interaktiv dərslər səmərəliliyi dəfələrlə artırır, şagird yalnız bir passiv tamaşaçı və ya dinləyici olmur, o, fəal təlim prosesinə cəlb olunur.

***Rəyçi: dos. H.Tağıyev***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.
2. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. //Azərbaycan məktəbi, 2009, №6.
3. Hüseynzadə R. Pedaqogika. Dərslik. 2 cilddə. Bakı: Mütərcim, 2013.
4. Qasımova L. Pedaqogika. Dərslik. Bakı: BDU, 2013.
5. Veysova Z. Fəal – interaktiv təlim: müəllimlər üçün vəsait. Bakı, 2007.

**А.Рзаева**

**Рациональное использование компьютерной технологии на уроках**

**Резюме**

В статье рассказывается о преимуществе использования компьютерных технологий и интерактивного метода обучения. Указывается что эти методы сильно действует на повышение качество обучения и активизирует познавательный интерес школьников в педагогическом процессе. Использование информационных технологий в процессе преподавания математики даёт то, что учебник дать не может; компьютер на уроке является средством, позволяющим обучающимся лучше познать самих себя, индивидуальные особенности своего учения, способствуя развитию самостоятельности.

В этом процессе особенно должны уделяться профессиональность и компетентность учителя. Авторитет, личность педагога, его разнообразные достоинства являются залогом успеха учащихся.

**A.Rzayeva**

**The efficiency using of computer technology in the lessons**

**Summary**

The article describes the advantages of using computer technology and interactive teaching method. It specifies that these methods greatly affects improving training and activates the cognitive interest of pupils in the pedagogical process. Use of information technology in the teaching of mathematics provides that a textbook can not give; the computer in the classroom is a tool that allows students to better know themselves, the individual characteristics of his teaching, promoting self-sufficiency.

In this process, in particular should be given to the professionalism and competence of the teacher. The authority, the identity of the teacher, his various merits are the key success of students.

# Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun yeni nəşrləri

**Standart və kurikulumlar: nəzəri və praktik məsələlər. Bakı, 2016**




"Standart və kurikulumlar: nəzəri və praktik məsələlər" adlı kitab 3 bölmədən ibarətdir. "Nəzəri-pedaqoji məsələlər" adlı I bölməyə "Təhsilin ümumi məsələləri", "Təhsilin psixopedaqoji məsələləri", "Təhsil standartları", "Təhsil kurikulumları", "Pedaqoji prosesin təşkili", "Şagird nailiyyətlərinin qiymətləndirilməsi", II bölməyə "Pedaqoji və məntiqi testlər", III bölməyə "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)" daxildir. Kitabdan elmi, pedaqoji, metodik səviyyəsini inkişaf etdirmək, peşəkarlığını artırmaq, işə qəbul olmaq istəyən müəllimlər, eləcə də tələbələr, təhsil mütəxəssisləri və tədqiqatçıları, ümumiyyətlə, pedaqoji məsələlərlə məşğul olan hər kəs istifadə edə bilər.




**Ümumtəhsil fənlərinin tədrisi məsələləri. Bakı, 2016**

"Ümumtəhsil fənlərinin tədrisi məsələləri" kitabı Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun Ümumi təhsilin və məktəbdənkənar təhsilin kurikulumu şöbəsində aparılan tədqiqatların nəticələri əsasında hazırlanmışdır. Kitabdan müəllimlər, metodistlər, məktəb rəhbərləri, o cümlədən təhsil sahəsində fəaliyyət göstərən mütəxəssislər, tələbələr, doktorant və dissertantlar da istifadə edə bilər.

**İlk peşə - ixtisas təhsili: problemlər və perspektivlər. Bakı, 2016**




Ulu öndərimiz Heydər Əliyevin diqqəti sayəsində böyük inkişaf yolu keçən ilk peşə- ixtisas təhsili bu gün keyfiyyətcə yeni mərhələyə qədəm qoyur. Respublikamızda iqtisadiyyatın sürətli inkişafı və bazaryönümlü islahatların dərinləşməsi ilk peşə-ixtisas təhsilli kadrlara olan ehtiyacın daha çevik şəkildə ödənməsini tələb edir.

Təhsili dövlətin prioritet sahələrindən biri hesab edən Prezident İlham Əliyevin böyük qayğısı nəticəsində ilk peşə-ixtisas təhsili bu gün yeniləşir və daha da inkişaf edir.

Kitabda ilk peşə-ixtisas təhsilinin bu vaxtadək çox az tədqiq olunmuş sahələri – peşə təhsilimizin tarixi, yeni məzmunun formalaşdırılması, təhsil müəssisələri ilə işəgötürənlər arasındakı əlaqələr işıqlandırılmış, həmçinin bu gün üçün peşə-ixtisas təhsilinin çox vacib məsələlərindən biri olan strateji inkişaf və perspektivlər barədə yeni fikirlər öz əksini tapmışdır.